DOI: https://www.doi.org/10.36719/2663-4619/64/6-20

**Şahlar Mahmud oğlu Babayev**
Azərbaycan Dövlət Aqrar Universiteti
texnika elmləri doktoru, dosent
shaxlaraqromexanika@mail.ru
**Elçin Barat oğlu İsgəndərzadə**
Azərbaycan Texniki Univeristeti
texnika elmləri doktoru, professor
isgenderzadeh@rambler.ru
**Afət Əsgərova**
Azərbaycan Texniki Univeristeti
texnika üzrə fəlsəfə doktoru
isgenderzadeh@rambler.ru
**Şükufə Vaqif qızı Əhmədli**
Azərbaycan Texniki Univeristeti
assistent
shukufa.ahmadli@gmail.com

# MƏHLUL SƏRFİNİN TƏNZİMLƏNMƏSI ÜÇÜN İNNOVATİV TEXNOLOGİYA VƏ QURĞUNUN İŞLƏNMƏSİ, NƏZƏRİ TƏDQİQİ

***Açar sözlər:*** *sərfiyyat, axın xətləri, qatılıq, qurğu, dozalaşdırma, duzluluq*

## Development of the innovative technology and equipment for the regulation of solution consumption, theoretical research

**Summary**

In the research work, a new device was developed at the inventory level for dosing of solution consumption, innovative technology was substantiated and theoretical reports were given.
***Key words:*** *consumption, flow lines, viscosity, device, dosing, salinity*

Agır və yüngül sənaye, həmçinin kənd təsərrüfatı istehsalatında müxtəlif təyinatlı proseslərin idarə olunmasında daha böyük xüsusi çəkiyə malik olan texniki vasitələrindən biri də məhlul sərfinin tənzimlənməsi üçün böyük iqtisadi, ekoloji və istismar göstəricilərinə malik texniki vasitələrdir (1÷4).

Aparılmış çoxsaylı analitik tədqiqatların (5÷7) nəticələri göstərir ki, adıgedən qurğuların aktuallığı müxtəlif qatılığa malik, həmçinin müxtəlif təyinatlı məhlulların fasilələrlə və fasiləsiz verilməsi zamanı məhlul sərfinin pilləsiz nizamlanmasına nail olmaq, fasilələrlə verim zamanı sistemdə yaranan hidravlik zərbənin aradan qaldırılması, qurğunun qurluşunun sadə, istismarının asan olması, ondan müxtəlif texnoloji proseslərin həyata keçirilməsi zamanı həmin axın xətlərində və kommunikasiya vasitələri üzərində asanlıqla quraşdırıla bilməsidir.

Tərəfimizdən adıgedən qurgulara keçmiş İttifaqın Patent təşkilatları, həmçinin Müstəqil Respublikamızın Əqli Mülkiyyət Agentliyindən müvafiq olaraq çoxsaylı Müəlliflik Şəhadətnamələri və Patentlər alınmış (8÷12), təyinatı üzrə tətbiq olunaraq qənaətbəxş nəticələr əldə olunmuşdur. Qurğuların Respublikamızın Dövlət Maşın Sınaq Stansiyasında sınaqdan keçirilərək, təsərrüfatlarda tətbiqinin tövsiyyə olunması barədə Qərar (13÷15) qəbul olunması onların aktuallığını istisna etmir və fermerlərin tələbatının təmin olunmasında istifadəsinin aktuallığını şərtləndirir.

Müxtəlif qatılığa malik məhlulların hazırlanması üçün nəzərdə tutulmuş qurğunun ümumi görünüşü şəkil 1÷2- də texnoloji sxemi şəkil 3-də, kinematik sxemi şəkil 4-də, intiqal mexanizminin sxemi şəkil 5÷6-da, forma və parametrlərin əsaslandırılması və nəzəri hesabat sxemləri isə şəkil 7÷13-də, müxtəlif qatılığa malik məhlulların dozalaşdırılması üçün laboratoriya qurğusunun texnoloji sxemi isə şəkil 14 -də verilmişdir.

Qurğunun nəzəri və təcrübi tədqiqi zamanı əsas məsələ:

– onun əsas elementi olan fırlanan tıxac tipli maye bölücüsünün (dozalaşdırıcının) malik olduğu texnoloji imkanlardan istifadə etməklə, istismarı zamanı sistemdə hidravlik zərbə yaranmasının aradan qaldırılması;

– istismarı zamanı qurğuda qarışıqdakı maye halında olan komponentlərin sayı qədər - fırlanan tıxac tipli maye bölücülərinin bir valla idarə olunmasına nail olmaqla qarışıqdakı məhlulların tələb olunan nisbətdə olmalarına tez və asan nail olmaq.



Şək.1. Müxtəlif qatılığa malik məhlul hazırlayan qurğunun ümumi görünüşü



Şək. 2. Müxtəlif qatılığa malik məhlul hazırlayan qurğunun ümumi görünüşü
(maye bölücüsünün intiqal mexanizmi)




a)

A görünüşü




b)

Şək. 3.a) Müxtəlif qatılığa malik məhlulların dozalaşdırılması üçün qurğunun texnoloji sxemi, b) a)-dan A görünüşü: 1; 2 müxtəlif məhlul çənləri 3; 4; 27; 28; 29; 30-boru kəməri; 5;6-rezin örtük; 16-val; 17; 18; 23; 24-vint cütü; 19; 20-disk; 21-baraban; 22-ştok; 25-dərəcələnmiş sektor; 26-hazır məhlul çəni; 35; 36-içlik.

**B-B**  **görünüşü**




Şək.4. Müxtəlif qatılığa malik məhlul hazırlayan qurğunun kinematik sxemi

a) dozalaşdırıcılara intiqalın ötürülməsi); b) -a)-dan B-B görünüşü; c) - b)-dən E-görünüşü; 1; 2 –maye bölücüsünün gövdəsi; 3; 4–tıxac; 5; 9–gövdənin giriş pəncərəsi; 6; 10 – tıxacın giriş pəncərəsi; 7; 11 – gövdənin çıxış pəncərəsi; 8; 12 -tıxacın çıxış pəncərəsi; 13 – val; 14; 15; 16 – disk; 17 –tərpənməz plitə; 18- hərəkətli plitə; 19; 20 - qayka-vint cütü; 21; 22 –tıxacın boşluğu; 23; 24 –dayaq (maye bölücüsünün gövdə və tıxacındakı çıxış pəncərələri – 25; 26 və 27; 28 -şəkildə göstərilməyib).




Şək. 5. Dozalaşdırıcı qurğunun intiqal mexanizmi: 5;6-rezin örtük, 16- val,
17; 18; 33; 34-vint cütü, 19; 20-disk, 21-baraban, 31-plitə, 32-tərpənməz bənd, 35; 36-içlik.




Şək.6. Dozalaşdırıcının gövdəsinin intiqal mexanizmi:
15-kipgəc; 16-val; 19-disk; 21-baraban.




Şək.7. Hesabat sxemi (şək. 6 - dan B - B görünüşü): 7-tıxacın giriş deşiyi;
8; 9-tıxacın çıxış deşikləri; 10-tıxac; 11-gövdənin giriş deşiyi; 12-gövdənin çıxış deşiyi;
13-mayeni yenidən çənə istiqamətləndirə deşik; 14-gövdə.




Şək.8. Hesabat sxemi:
8-tıxacın çıxış deşiyi; 10 -tıxac; 12- gövdənin çıxış deşiyi; 14- gövdə.



Şək.9. Hesabat sxemi:
8-tıxacın çıxış deşiyi; 12-gövdənin çıxış deşiyi.




Şək.10. Hesabat sxemi: (8-dən N-görünüşü)
8 -tıxacın çıxış deşiyi; 12-gövdənin çıxış deşiyi.

ELMİ İŞ beynəlxalq elmi jurnal. Impakt faktorlu. 2021 / Cild: 15 Sayı: 3 ISSN: 2663-4619
SCIENTIFIC WORK international scientific journal. With Impact Factor. 2021 / Volume: 15 Issue: 3 e-ISSN: 2708-986X




Şək. 11. Müxtəlif qatılığa malik məhlul hazırlayan qurğunun forma və parametrlərin əsaslandırılması və nəzəri hesabat sxemi 7;8-dozalaşdırıcının gövdə və tıxacındakı çıxış pəncərələri a) N≠0; b) N=0.




Şək. 12. Hesabat sxemi




Şək. 13. Hesabat sxemi




Şək.14. Müxtəlif qatıığa malik məhlulların dozalaşdırılması üçün laboratoriya qurğusunun texnoloji sxemi
1-məhlul çəni; 2-termometr; 3-süzgəc; 4-nasos; 5-boru kəməri; 6-təzyiq tənzimləyicisi;
7-monometr qurğusu; 8-fırlanan tıxac tipli maye bolücüsü; 9-maye bolücünün oturacağına çəkilmiş rezin təbəqə; 10-val; 11-disk; 12-qayka-vint cütü; 13-tıxac; 14-ştok; 15-dərəcələnmiş qab;
16; 17; 18; 19; 20; 21- tərpənməz dayaq.

Dozalaşdırıcı qurğu müvafiq olaraq içərisində məhlulun daimi səviyyəsi təmin olunan müxtəlif məhlul çənlərindən 1; 2 (şək. 3a) (işdə iki ədəd çən göstərildiyinə baxmayaraq, onların sayı qarışıqda tələb olunan komponentlərin sayına bərabər olmalıdır) onlarla boru kəmərləri 3; 4 vasitəsilə əlaqədə olan bir-birinin içərisində yerləşdirilmiş oturacaqları rezin örtüklərlə 5; 6 sərt əlaqədə olan giriş 7 (qrafiki təsvirdə dozalaşdırıcılardan ancaq birinin en kəsiyi göstərilmişdir) və çıxış kanalları 8 və 9 olan stəkandan 10, (şək. 7) giriş 11 və çıxış 12 və 13 (şək.7) kanalları olan gövdələrdən 14 dozalaşdırıcılardan məhlulların sızmasının qarşısını almaq üçün kipgəclərdən 15 (şək. 6) stəkanların rezin örtüklərlə sərt əlaqədə olan oturacaqları ilə friksion əlaqədə olan eyni val 16 üzərində vəziyyətini qayka-vint cütlərinin 17; 18 köməyilə yerlərini dəyişməklə təsbit olunmaq imkanına malik xarici çevrəsi boyu rezin material çəkilmiş disklərdən 19; 20 valı 16 tələb olunan qədər döndərməklə vəziyyətini təsbit etmək üçün barabandan 21, barabanla 21 sərt əlaqədə olan ştokla 22 qayka –vint cütünün 23; 24 köməyi ilə kinematik əlaqədə olan dərəcələnmiş sektordan 25, dozalaşdırıcılardan artıq məhlulun yenidən çənlərə 1; 2 və hazır məhlul çənlərinə 26 ötürülməsi üçün boru kəmərlərindən (müvafiq olaraq) 27; 28 və 29; 30, həmçinin valda oturdulmuş disklərin dozalaşdırıcıların oturacağına sıxılmasını təmin etmək üçün asqı mexanizmindən ibarətdir. Asqı mexanizminin məqsədi bir ədəd aparan val üzərindəki disklərlə eyni sayda aparılan detalların (bölücülərin gövdəsi) friksion ötürmə vasitəsilə hərəkətə gətirilməsi istənilən sayda pilləsiz ötürmə ədədinin köməyilə texnoloji prosesi idarə etmək - qarışıqdakı dozalaşdırılan məhlul kütləsinin istənilən nisbətdə olmasına, qarışıqdakı komponentlərin istənilən nisbətdə olmasına imkan yaratmaqdır. Gövdəsinin plitə 31 üzərində tərpənməz quraşdırıldığı dozalaşdırıcıların stəkanlarının oturacaqları ilə rezin disklərin bir-birinə sıxılmasını təmin etmək üçün tərpənməz bəndlə 32 qayka-vint cütünün 33; 34 köməyilə içliklərdə 35; 36 oturdulmuş val 16 bölücülərə doğru hərəkət etdirilərək vəziyyəti təsbit olunmaq imkanına malikdir.

Dozalaşdırıcı qurğunun iş prinsipi aşağıdakı ardıcıllıqla həyata keçirilir: qurğunu (şək. 5) işə buraxmazdan əvvəl hazırlanacaq qarışıqdakı müxtəlif məhlulların (duz, şəkər, maya, piy və s.) sayından asılı olaraq, həmin sayda dozalaşdırıcı xüsusi plitə 31 üzərində yerləşdirilir. (Şəkildə iki ədəd bölücüdən istifadə olunması göstərilmişdir). Val 16 üzərinə həmin sayda xarici çevrəsi boyu rezin materialla örtülmüş rezin disklər 19, 20 keçirilərək onların dozalaşdırıcılarının stəkanlarının 10 (şək. 8) oturacağı ilə sərt əlaqədə olan örtüklərin 5; 6 friksion əlaqəsi təmin olunaraq məhlulu texnoloji prosesə istiqamətləndirən pəncərələr bağlanır.

Hazırlanacaq qarışıqdakı məhlulların hər birinin tələb olunan normasından asılı olaraq dozalaşdırıcıların çıxış kanalının sahələrini nizamlamaqla, həmin normaların dozalaşdırılması üçün rezin disklə maye bölücünün mərkəzindən olan məsafələr (şəkildə $a_i$ , $b_i$ məsafəsi) müəyyən olunaraq təsbit olunur.

Daha sonra texnoloji prosesi pozmamaqla dozalaşdırıcının maksimal məhsuldarlığına nail olmaq şərtilə əlavə barabanın 21 ştoku 22 sektor 25 üzərində hərəkət etdirilərək, qayka-vint cütünün 23; 24 köməyilə vəziyyəti təsbit olunur. Dozalaşdırıcıdan məhlulların sızmasının qarşısını almaq üçün kipgəcin 15 vəziyyəti yoxlanılaraq, həmçinin əlavə barabanın 21 köməyilə dozalaşdırıcının stəkanının 10 döndərərək məhlulu hazır məhlul çəni 26 istiqamətləndirən kanallar açılaraq qurğu işə buraxılır. İçərisində məhlulun daimi səviyyəsi təmin olunan (əməliyyat məlum texniki vasitələrin köməyilə həyata keçirilir) müxtəlif məhlul çənləri ilə müvafiq məhlulu dozalaşdırıcılarının gövdəsinin giriş, həmçinin çıxış kanallarından birini, çıxış kanallarından digərini isə hazır məhlulu çənlərlə əlaqələndirən boru kəmərləri bərkidilir, (dozalaşdırıcının gövdəsinin çıxış kanallarından biri ilə yenidən müvafiq çəni əlaqələndirən boru kəmərlərində nasos qurğusundan (şəkildə görünmür) istifadə olunmuşdur.

Yuxarıda qeyd olunan məsələlərə nail olmaq üçün təklif olunan dozalaşdırıcı qurğunun gövdə və tıxacında açılmış kvadrat formalı pəncərələrin 7;8 (hesabat sxemi-şək. 4) həm üfiqi, həm də şaquli ox boyu bir-birinə nəzərən hərəkət etdirilməklə vəziyyətlərinin təsbit olunmaq imkanına malik olmaları xüsusi əhəmiyyət kəsb edir.

Müxtəlif qatığa malik məhlulların dozalaşdırılması üçün laboratoriya qurğusunun texnoloji sxemindən göründüyü kimi, o süzgəclə 3 təmin olunmuş, içərisində termometr 2 olan məhlul çənindən 1, məhlul çəni 1 ilə boru 5 vasitəsilə əlaqədə olan nasosdan 4, təzyiq tənzimləyicisinin 6, manometr qurğusundan 7, oturacağına rezin örtük 9 çəkilmiş tərpənməz gövdədən, onun içərisində tıxacı 14 vasitəsilə ox boyu yerdəyişmə ($b_1$, $b_2$ şək. 4) etmək imkanına malik tıxacdan 13 (şək. 14) və bölücünün gövdəsini fırlanma hərəkəti etməyə məcbur edən intiqal mexanizmindən ibarətdir. Fırlanan tıxac tipli maye bölücüsünün 8 gövdəsini onun tıxacına 13 nəzərən fırlanma ( $\alpha$ ) hərəkəti etməyə məcbur edən intiqal mexanizmi qayka vint 12 cütünün köməyilə val 10 üzərində vəziyyəti təsbit olunmaq imkanına ( $a_i$) malik friksion diskdən 11 ibarətdir. Qurğuda maye bölücüsündən xaric olan-texnoloji prosesə verilən tələb olunan qatılığa malik müxtəlif məhlulun yığılması üçün tərpənməz bənd 16 üzərində quraşdırılmış dərəcələnmiş qabdan 15 istifadə olunmuş, məhlul çəninin 1, valın 10 bölücünün gövdəsinin, təzyiq tənzimləyicisinin 6, maye bölücüsünün ştokunun 14, texnoloji proses zamanı dayanıqlığını təmin etmək üçün tərpənməz bəndlərdən 17; 18; 19; 20; 21 (müvafiq olaraq) istifadə olunmuşdur.

Müxtəlif qatığa malik məhlulların dozalaşdırılması üçün qurğunun (şəkil 14) texnoloji sxemindən göründüyü kimi tələb olunan qatılığa, həmçinin termometrin 2 köməyilə tələb olunan temperaturda olması təmin olunan məhlul çənindən 1, süzgəcdən 3 keçməklə nasosa 4, həmçinin boru kəməri 5 vasitəsilə təzyiq tənzimləyicisinə 6, oradan isə boru kəməri vasitəsilə manometr qurğusuna 7, sistemdəki işçi təzyiqin qiyməti qeydə alınaraq fırlanan tıxac tipli maye bölücüsünün 8 radial deşiyinə ötürülür. Fırlanan tıxac tipli maye bölücüsünün oturacağı ilə sərt əlaqədə olan rezin örtüklə disk 11 arasındakı friksion əlaqə nəticəsində maye bölücüsünün tıxacının 13 boşluğuna daxil olan məhlul ştok 14 vasitəsilə tıxacın 13 ox boyu yerdəyişməsi ($b_1$, $b_2$, şək.4), həmçinin bölücünün gövdəsinin öz oxu ətrafında dönməsi $(\alpha)$ nəticəsində bölücünün çıxış pəncərələrindən xaric olan məhlul da boru kəməri vasitəsilə yenidən çənə və texnoloji prosesə verilmək üçün dərəcələnmiş qaba 15 daxil olur. Qurğuda texnoloji prosesə verilən məhlul kütləsini nizamlamaq üçün qayka -vint cütünün 12 köməyilə val 10 üzərində bölücünün oturacağının mərkəzinə nəzərən yerini dəyişməklə $(a_i)$ vəziyyəti təsbit olunan diskdən istifadə olunmuşdur. Qurğuda dozalaşdırma prosesində sadə konstruksiyalı, asan istismar olunan maya dəyəri aşağı olan və orta səviyyəli texniki təminata malik çilingər emalatxanasında belə hazırlanması mümkün olan fırlanan tıxac tipli maye bölücülərindən (şək. 4) istifadə olunması məqsədəmüvafiq hesab olunmuşdur.

Hesabat sxeminə (şək. 4) nəzər salsaq, yuxarıda qeyd olunan-üfiqi və şaquli ox boyu yerdəyişmələrin müvafiq olaraq b və m-ə bərabər olduğu halda kvadrat formalı pəncərələrin görüşməsindən yaranan canlı kəsiyin sahəsi S kvadratın tərəfinin uzunluğundan asılı olaraq S = f (b, m)-ə bərabər olur.

Təklif olunan qurğunun quruluşu və iş prinsipi ilə tanış olarkən gördük ki, b və m-in qiymətini kvadrat formalı pəncərələrin tərəfinin uzunluğundan asılı olaraq onların görüşməsi nəticəsində ən kiçik sahəyə malik canlı kəsik yarandığı andan pəncərələrin tamamilə üst-üstə düşdükləri $S=A^2$ vəziyyətədək pilləsiz nizamlamaq mümkündür.

İndi isə təklif olunan qurğunun malik olduğu texnoloji imkanlardan istifadə edərək onun müxtəlif konstruktiv parametr və iş rejimlərində istismarı zamanı məhlul sərfi normasını hesablayaq. Hesabat sxemindən (şək. 4) göründüyü kimi bölücüsünün gövdə və tıxacındakı kvadrat formalı pəncərələrin görüşməsindən yaranan S =f (m, b) sahəsindən t zamanda xaric olan məhlul sərfi normasını hidravlikdan məlum (7; 8; 9)

$$Q = \mu \cdot \gamma \cdot S \cdot \sqrt{2gp} \cdot t \qquad (1)$$

ifadəsinin köməyilə hesablamaq olar.

Burada: $\mu$ - sərf əmsalı;

$\gamma$ - məhlulun xüsusi çəkisi, kq/м$^3$;

g - sərbəstdüşmə təcili, g = 9,81 m/san$^2$;

p - sistemdəki təzyiq, m.su sütunu;

S - dozalaşdırıcının gövdə və tıxacındakı kvadrat formalı radial pəncərələrin görüşməsindən yaranan canlı kəsiyin sahəsi, m$^2$;

t - dozalaşdırma müddətidir, san.

Hesabat sxemindən (şək.4) göründüyü kimi,

$$S=b\cdot m, \quad (2)$$

həmçinin

$$\begin{cases} m = A - M \\ b = A - N \end{cases} \quad (3)$$

(3) ifadədəsi m, b, A, M, N-in həqiqi qiymətinə yox, düzxətli müstəvi səthli formaya salındığı vəziyyətdəki qiymətinə müvafiqdir.

Burada: m - bölücünün gövdəsinin $\alpha$ bucağı qədər döndüyü vəziyyətə uyğun radial kanalın yerdəyişməsidir;

b - bölücünün gövdə və tıxacının horizontal simmetriya oxlarının üst-üstə düşmədiyi vəziyyətdə onun gövdəsinin tıxacına nəzərən ox boyu yerdəyişməsi zamanı yaranan canlı kəsiyin enidir;

A - gövdə və tıxacdakı kvadrat formalı çıxış pəncərələrinin tərəfinin uzunluğudur;

M; N - gövdə və tıxacın çıxış pəncərələrinin mərkəzləri arasındakı üfiqi və şaquli ox üzrə məsafədir.

Bölücüdə deşiklərin sahəsi K$^2$ -na bərabər (şək. 4) olan kvadrat formada açılmasının və gövdə, həmçinin tıxacda açılmış deşiklərin həndəsi yerlərinin təklif olunan qaydada açılması nəticəsində maye bölücüsünün istismarı zamanı sistemdə yaranan hidravlik zərbə aradan qaldırılaraq texnoloji prosesə verilən məhlulların tələb olunan normada dozalaşdırılmasına imkan yaradır.

Hazırlanacaq qarışıqdakı məhlulların hər birinin qatılıq dərəcəsindən asılı olaraq maye bölücülərinin çıxış pəncərələrinin sahələrini nizamlamaqla tələb olunan normaların dozalaşdırılması üçün rezin disklə maye bölücünün mərkəzindən olan məsafələr ( $a_1$ , $a_2$ məsafəsi, şək.4) müəyyən olunaraq təsbit olunur.

Maye bölücüsünün gövdəsindəki tərəfi K (şək. 9,10,11) olan kvadrat formalı, mərkəzi bucağı α olan giriş deşiyindən bölücüyə daxil olan məhlul ştokun mərkəzi bucağı 3α olan deşiyindən onun mərkəzi boşluğuna keçərək ştokun tərəfi K olan kvadrat formalı çıxış deşiklərinə, oradan isə tələb olunan miqdarı ştokun və gövdənin yaratdığı tərəfi K olan kvadrat formalı pəncərələrdən keçərək texnoloji prosesə, qalan hissəsi isə ümumi çənə verilir. Texnoloji prosesə nəzarət edən operator müxtəlif məhlulların töküldüyü qabdakı miqdarı tələb olunan qiymətə çatdıqda və ya həmin qab dolduqda xüsusi qurğunun köməyilə (şəkildə göstərilməyib) eyni vaxtda ümumi çənləri boru kəmərləri ilə əlaqələndirən kranları bağlayır. Əldə olunan qarışıq texnoloji prosesə verilir.

Şək. 4-dən göründüyü $\alpha$ bucağı kvadrat formalı pəncərələrin görüşdükləri uzunluğa müvafiq mərkəzi bucaqdır. Başqa sözlə desək $\alpha$ -nı dəyişməklə məhlul sərfinin təmin olunmasında xüsusi əhəmiyyət kəsb edən maye xaric olan canlı kəsiyin sahəsini dəyişmək mümkündür.

(3)-cü ifadədə m-in düzxətli müstəvi üzrə açılışına müvafiq uzunluğundan istifadə olunmsaına baxmayaraq, m-həqiqətən qövs formalı yerdəyişmə olduğu üçün həmin yerdəyişmənin uzunluğunu aşağıdakı ifadənin (4) köməyilə hesablaya bilərik.

$$m = l = \alpha_{gövd.(rad)} \cdot R = \frac{\pi \cdot \alpha^{0}_{gövd.(rad)} \cdot R}{180} \quad (4)$$

Burada: $\alpha_{gövd.(rad)}$ - bölücünün gövdəsinin onun tıxacına nəzərən döndüyü bucaqdır (şək.7):

R - dozalaşdırıcının tıxacının radiusudur.

Şək.13-dən göründüyü kimi, $\ell$ -i (4) aşağıdakı ifadədən də təyin etmək olar.

$$m = \ell = \frac{\alpha \cdot K/2}{a_i} R = \frac{\alpha \cdot K \cdot R}{2a_i} \qquad (5)$$

Burada: K-friksion diskin diametridir.

$$S = m \cdot b = \frac{\alpha \cdot K \cdot R}{2a_i}(A - N) \qquad (6)$$

$S-(6)$ ifadəsini (1)-də nəzərə alsaq alarıq,

$$Q = \mu\gamma \frac{\alpha \cdot K \cdot R}{2a_i}(A - N) \cdot \sqrt{2gp} \cdot t \qquad (7)$$

$\mu$, $\gamma$, K, R, A, və g -nin qiymətlərini (7) -də nəzər alsaq alsaq:

Xüsusi hal üçün $\mu$=0,4 və $\gamma$=1000 kq/m$^3$, həmçinin konstruktiv məqsədə uyğunluq şərtindən A=0,012 m, R=0,039 m, K=0,080 m qəbul etsək,

$$Q = 400\frac{\alpha \cdot 0{,}08 \cdot 0{,}039}{2a_i}(0{,}012 - N) \cdot 4{,}43\sqrt{p} \cdot t = 2{,}79(0{,}012 - N)\frac{\alpha \cdot \sqrt{p}}{a_i} \cdot t \text{ alarıq} \qquad (8)$$

Deməli təklif olunan qurğu üçün

$$Q = f(N, \alpha, p, t, a_i) \qquad (9) \text{ alarıq.}$$

(9) ifadəsi fırlanan tıxac tipli maye bölücüsünün gövdə və tıxacının üfiqi simmetriya oxlarının üst - üstə düşmədiyi hal üçün tərtib edilmişdir.

Qurğuda tələb olunan komponentlərin sayı qədər dozalaşdırıcıdan istifadə etməklə (9) ifadəsi belə qənaətə gəlməyə zəmin yaradır ki, təklif olunan qurğunun tətbiqi ilə eyni vaxtda məhlul içərisindəki tələb olunan müxtəlif komponentlərin (duz məhlulu, çay sodası, maya, içməli su və s.) tələb olunan nisbətdə olmalarına nail olmaq mümkündür. (9) ifadəsini yuxarıda qeyd olunan müxtəlif komponentlər üçün (10) ifadəsi şəklində yazaq.

$$\begin{cases} Q_{su} = \varphi(\alpha_{su}, p_{su}, t_{su}, N_{su}, a_{su}) \\ Q_{duz.m.} = \varphi(\alpha_{duz.m.}, p_{duz.m.}, t_{duz.m.}, N_{duz.m.}, a_{duz.m.}) \\ Q_{çay\ soda} = \varphi(\alpha_{çay\ soda}, p_{çay\ soda}, t_{çay\ soda}, N_{çay\ soda}, a_{çay\ soda}) \\ . \\ . \\ . \\ . \end{cases} \qquad (10)$$

(10) ifadəsnin analizi göstərir ki, təklif olunan qurğudan istifadə etməklə qarışıqdakı komponentlərin tələb olunan nisbətdəki qiymətinə nail olmaq olar.

Təklif olunan qurğunun malik olduğu texnoloji imkanlardan istifadə etməklə (6) ifadəsini aşağıdakı şəkildə yazmaq olar.

$$\frac{S_1}{S_2} = \frac{\dfrac{\alpha \cdot K \cdot R(A - N)}{2a_1}}{\dfrac{\alpha \cdot K \cdot R(A - N)}{2a_2}} = \frac{a_2}{a_1} \qquad (11)$$

(11) - ifadəsinin analizi belə qənaətə gəlməyə zəmin yaradır ki, qarışıqdakı tələb olunan komponentlərin tələb olunan nisbətinin təmin olunması dozalaşdırıcıların məhlul xaric olan çıxış pəncərəsinin canlı kəsiyinin sahəsindən asılı olduğundan (11) ifadəsindən göründüyü kimi həmin sahənin nizamlanması bölücünün oturacağının mərkəzindən friksion diskə qədər olan məsafədən asılıdır.

İndi isə konkret hal üçün, başqa sözlə desək, qurğunun müxtəlif konstruktiv parametr və iş rejimlərində, həmçinin müxtəlif qatılığa malik duzlu məhlul almaq üçün (11) ifadəsindəki $\frac{S_1}{S_2}$ -nin qiymətini təyin edək:

- sərfiyyat norması $Q_{l/ha}$ olan $\omega_1$ %-li ( $\omega_1$ (12) ifadəsinin köməyilə təyin edilir)

$$\omega_1 = \frac{m_{duz}}{m_{duz} + m_{su}} \cdot 100\% \qquad (12)$$

yüksək qatılığa malik məhluldan ( $\omega_1$ -in qiymətindən asılı olaraq $\mu$ , $\gamma$ -nın həqiqi qiymətlərini təcrübi tədqiqatların nəticələrinə əsasən təyin etmək olar.

Qatılığı $\omega_2$ % olan məhlul almaq üçün (Təbii ki, qurğunun malik olduğu texnoloji imkanlar hesabına çalışmalıyıq ki, ən böyük məhsuldarlıqla, həmçinin dəqiqliklə dozalaşdırma alaq) əvvəlcə duzlu məhlul və adi içməli su sərfini təyin edək:

$$Q_1 \cdot \omega_1 = (Q_1 + Q_{su}) \cdot \omega_2 \qquad (13)$$

(13)-də $\omega_1$, $Q_1$, $\omega_2$ məlum olduğu üçün $Q_{su}$ -u aşağıdakı ifadənin (3.14) köməyilə təyin etmək olar.

$$Q_{su} = \frac{Q_1 \cdot \omega_1 - Q_1 \cdot \omega_2}{\omega_2} = \frac{Q_1(\omega_1 - \omega_2)}{\omega_2} \qquad (14)$$

(1)-i aşağıdakı sistem (15) şəklində yazaq, həmçinin məhlulların dozalaşdırılm müddəti eyni olduğu üçün

$$\begin{cases} Q_{1,duz\,m.} = \mu_{duz\,m.} \cdot \gamma_{duz\,m} \cdot S_{duz\,m} \cdot \sqrt{2gp}_{\,duz\,m.} \\ Q_{su} = \mu_{su} \cdot \gamma_{su.} \cdot S_{su} \cdot \sqrt{2gp}_{\,su} \end{cases} \qquad (15)$$

(15)-i (14)-də nəzərə alsaq,

$$\mu_{su} \cdot \gamma_{su.} \cdot S_{su} \cdot \sqrt{2gp_{su}} = \frac{\mu_{duz\,m..} \cdot \gamma_{duz\,m.} \cdot S_{\,duz\,m..} \cdot \sqrt{2gp_{\,duz\,m.}}(\omega_1 - \omega_2)}{\omega_2} \qquad (16)$$

(16) ifadəsindəki g=9,81 m/san$^2$, həmçinin $\mu_{su}$, $\gamma_{su.}$, $p_{su}$, $\mu_{\omega_1}$, $\gamma_{\omega_1}$, $p_{\omega_1}$ sabit kəmiyyətlər olduğu, həmçinin konstruktiv məqsədəuyğunluq şərtindən təyin edildiyi üçün,

$$\mu_{su} \cdot \gamma_{su.} \cdot \sqrt{2gp_{su}} = A_1; \; \mu_{duz\,m.} \cdot \gamma_{duz\,m.} \cdot \sqrt{2gp_{duz\,m}} = B_1 \text{ qəbul etsək,}$$

$$A_1 \cdot S_{su} = \frac{S_{duz\,m.} B_1 \cdot (\omega_1 - \omega_2)}{\omega_2} \text{ alarıq.} \qquad (17)$$

(17)-də $\omega_1$ və $\omega_2$ -nin müxtəlif qiymətləri üçün (verilmiş qatılığa malik məhluldan tələb olunan qatılıqda məhlul alınması)

$$\frac{S_{su}}{S_{duz\,m.}} = \frac{B_1(\omega_1 - \omega_2)}{A_1 \cdot \omega_2} \text{ yaza bilərik} \qquad (18)$$

(18)-də sadələşdirmə aparıb,

$$\frac{B_1}{A_1} = K_1 \text{ qəbul etsək,} \qquad (19)$$

həmçinin (19)-u (18)-də nəzərə alsaq,

$$\frac{S_{su}}{S_{duzm.}} = K_1 \cdot \frac{(\omega_1 - \omega_2)}{\omega_2} \quad \text{alarıq.} \qquad (20)$$

Verilmiş qatılığa malik məhluldan ondan az və çox qatılığa malik məhlul almaq üçün

$$\begin{cases} \omega_1 > \omega_2 \text{ halı üçün } + \left|\dfrac{\omega_1 - \omega_2}{\omega_2}\right| \\ \omega_1 < \omega_2 \text{ halı üçün } - \left|\dfrac{\omega_1 - \omega_2}{\omega_2}\right| \end{cases} \qquad (21)$$

(21)-sitemininə nəzər salsaq, görərik ki, sistemin birinci ifadəsi məhlulun qatılıq faizini aşağı salmaq, ikinci ifadəsi isə suyu buxarlandırıb qatılıq faizini yüksəltməyə işarədir. Başqa sözlə desək, $\pm\left|\dfrac{\omega_1 - \omega_2}{\omega_2}\right|$ ifadəsinin qarşısında "+" işarəsi olduğu vəziyyət duzlu məhlula neçə dəfə çox içməli su əlavə olunduğun, "-" işarəsi olduğu vəziyyət isə duzlu məhlulun kütləsinin neçə dəfə azaldılmalı (məhluldan suyun buxarlandırılması) olduğunu göstərir.

Məlumdur ki, qida sənayesində adətən yüksək faizli qatılığa malik məhluldan içməli su əlavə etməklə ondan aşağı faizli qatılığa malik məhlul alındığından nəzəri tədqiqatlar nəticəsində çıxarılan yuxarıdakı ifadələrdən istifadə etməklə bu məqsədlə əlavə olunacaq suyun miqdarını hesablayaq. Kimyadan məlum olan - verilmiş qatılığa malik məhluldan tələb olunan qatılıqda məhlul hzırlamaq üçün

$$m_1 \cdot \omega_1 = m_2 \cdot \omega_2 \qquad (22)$$

ifadəsindən istifadə etməklə $\omega_1$ faizli qatılığa malik məhlulun vahid zamanda dozalaşdırılan $m_1$ kütləsi üzərinə ondan $\omega_2$ faizli ($\omega_1 > \omega_2$) məhlul almaq üçün həmin müddətdə nə qədər adi su tələb olunduğunu hesablaya bilərik. 22 -də

$$m_2 = m_1 + m_{su} \qquad (23)$$

ifadəsini nəzərə alsaq,

$$m_1 \cdot \omega_1 = (m_1 + m_{su}) \cdot \omega_2 \text{ alarıq} \qquad (24)$$

Deməli tələb olunan qatılıqda məhlul almaq üçün $\omega_2$ faizli məhlulun kütləsi üçün

$$m_1 + m_{su} = \frac{m_1 \cdot \omega_1}{\omega_2} \quad \text{alarıq} \qquad (25)$$

(25)-dən

$$m_{su} = \frac{m_1 \cdot \omega_1}{\omega_2} - m_1 \quad \text{olar} \qquad (26)$$

Yuxarıda qeyd edilənləri nəzərə alsaq, təklif olunan qurğunun $\omega_1$ faizli qatılığa malik məhlul çənindən vahid zamanda $m_1$ kütləli məhlul dozalaşdırıldığı halda, $\omega_2$ faizli qatılığa malik məhlul almaq üçün həmin müddətdə dozalaşdırılan suyun kütləsini 26 ifadəsinin köməyilə təyin etmək olar. Başqa sözlə desək, çənlərin

birindən vahid zamanda $m_1$ kütləli, $\omega_1$ faizli qatılığa malik məhlul dozalaşdırıldığı halda, digərindən $m_{su} = \frac{m_1 \cdot \omega_1}{\omega_2} - m_1$ kütləli adi su dozalaşdırılır.

(26) və (21) ifadələrini birlikdə tədqiq etsək, yüksək faizli qatılığa malik məhluldan ondan aşağı faizli qatılığa malik məhlul almaq üçün

$$m_{su} = +\left| \frac{m_1 \cdot \omega_1}{\omega_2} - m_1 \right| \qquad (27)$$

(27) ifadəsini yaza bilərik. Yuxarıda qeyd etdiyimiz kimi $\omega_1 > \omega_2$ halı üçün (27) ifadəsindəki modul işarəsinin (II) içərisindəki ifadənin qiyməti müsbət olacaqdır. Deməli məhlulların xüsusi çəkisini, sərf əmsalının və məhlulun dozalaşdırılması prosesinə təsir edən digər göstəriciləri nəzərə almaqla onların dozalaşdırıldığı canlı kəsiklərin sahələri nisbəti üçün 21 ifadəsinə oxşar 28 ifadəsini alarıq.

$$\frac{m_{su}}{m_1} = \frac{\frac{m_1 \cdot \omega_1}{\omega_2} - m_1}{m_1} = \frac{\frac{m_1 \cdot \omega_1 - m_1 \cdot \omega_2}{\omega_2}}{m_1} = \frac{m_1(\omega_1 - \omega_2)}{m_1 \cdot \omega_1} = \frac{\omega_1 - \omega_2}{\omega_2} \qquad (28)$$

Deməli analitik tədqiqatların nəticələrinə əsasən qeyd etmək olar ki, $\omega_1$ və $\omega_2$ -nin qiymətlərindən asılı olmayaraq müxtəlif sənaye sahələrində texnoloji prosesi tələb olunan faizli qatılığa malik məhlulla təmin etmək üçün vahid zamanda dozalaşdırılan adi suyun kütləsi həmin zaman müddətində dozalaşdırılan məhlulun kütləsindən $\left|\frac{\omega_1 - \omega_2}{\omega_2}\right| \cdot m_1$ dəfə fərqli olacaqdır. Yuxarıda qeyd edildiyi kimi $\omega_1 > \omega_2$ olduqda, vahid zamanda dozalaşdırılan suyun kütləsi qatılığı tənzimlənən digər məhlulun kütləsindən $\frac{\omega_1 - \omega_2}{\omega_2}$ dəfə çox, və ya $\omega_1 < \omega_2$ olduqda isə analoji olaraq $\frac{\omega_1 - \omega_2}{\omega_2}$ dəfə az olcaqdır.

Yuxarıda qeyd olunanları işlənib hazırlanmış - əsas elementi fırlanan tıxac tipli maye bölücüsü olan dozalaşdırıcının işinin əsas keyfiyyət göstəricisi olan məhlul sərfinin məlum (1) ifadəsində nəzərə alsaq, həmçinin

$$\begin{cases} m_1 = \mu_1 \cdot \gamma_1 \cdot S_1 \cdot \sqrt{2gp} \cdot t \\ m_{su} = \mu_{su} \cdot \gamma_{su} \cdot S_{su} \cdot \sqrt{2gp} \cdot t \end{cases} \qquad (29)$$

dozalaşdırılan $\omega_1$ faizli qatılığa malik $m_1$ kütləli məhlul sərfi, (29 sistemindəki birinci ifadə) həmçinin $\omega_2$ faizli qatılığa malik $m_2$ kütləli məhlul sərfi, (29 sistemindəki ikinci ifadə) üçün yazsaq, 29 ifadəsindən aydın göründüyü kimi təklif olunan dozalaşdırıcının malik olduğu potensial imkanlardan istifadə edərək, qısa vaxtda nizamlama aparmaqla istənilən faizli qatılığa malik məhlul kütləsi almaq olar.

İndi isə nəzəri tədqiqatlar zamanı təklif olunan qurğunun tıxacında və gövdəsində açılmış kvadrat formalı pəncərələrin görüşməsindən yaranan - sahəsi (S=f(m;b) olan canlı kəsikdən (hesabat sxemi şək.11) t müddətində xaric olan məhlul sərfini Q hidravlikadan məlum (1) formulasının köməyilə hesablayaraq, həmçinin müxtəlif məhlulların qatılığını tənzimləyən qurğunun maye bölücülərindən xaric olan məhlul sərfi normalarının nisbətini K (nizamlama əmsalı) təyin edək.

Hesabat sxemindən (şək.11a) göründüyü kimi məhlul xaric olan canlı kəsiyin sahəsini (S) təşkil edən (S=f(m, b)=f($a_i, b_i, \alpha_i$) parametrlərini (şək.11a) məhlul sərfinin $Q_i$ (1) hesabat düsturunda nəzərə alsaq,

$$Q_i = \varphi[P_i, \mu_i, \gamma_i, t_i, f(a_i, b_i, \alpha_i)] \text{ olar.}$$

Təklif olunan qida məhsullarının duzluluğunu tənzimləyən qurğuda iki ədəd fırlanan tıxac tipli maye bölücüsündən istifadə olunduğu hal üçün maye bölücülərindən xaric olan məhlul sərfi normalarının nisbətini (K-nizamlama əmsalını) $K = \frac{Q_1}{Q_1 + Q_2} = \frac{\mu_1 \gamma_1 S_1 \sqrt{2gP_1} \cdot t_1}{\mu_1 \gamma_1 S_1 \sqrt{2gP_1} \cdot t_1 + \mu_2 \gamma_2 S_2 \sqrt{2gP_2} \cdot t_2}$ köməyilə hesablamaq olar.

K-nın yuxarıdakı ifadəsində $\mu_1, \gamma_1, \mu_2, \gamma_2, g$ parametrləri konkret hal üçün dəyişməz olduğu üçün həmin ifadə $K = n\frac{p_1, t_1, S_1}{p_2, t_2, S_2}$ şəklində olcaqdır.

Burada: n - $\mu_1, \gamma_1, \mu_2, \gamma_2, g$ parametrlərini nəzərə alan əmsaldır.

$K = n\frac{p_1, t_1, S_1}{p_2, t_2, S_2}$ ifadəsindəki $p_1, t_1, S_1$ və $p_2, t_2, S_2$ parametrlərinin qiymətinin pilləsiz nizamlanmasının mümkünlüyü belə qənaətə gəlməyə zəmin yaradır ki, nizamlama əmsalının (K) köməyilə qurğunun malik olduğu texnoloji imkanlar hesabına dozalaşdırıcıda quraşdırılmış bölücülərin məhlul sərfi normalarını da bir-birinə nəzərərn pilləsiz nizamlamaq mümkündür.

## Ədəbiyyat

1. Abbasov Z.M. Mayenin paylarla verilməsində sərfin nəzəri hesablanması//Azərbaycan Aqrar elmi, Bakı:1991, №1, s.38-41
2. Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi, Azərbaycan Respublikasının Dövlət Təsnifatı, Məhsulun (mal və xidmətin) statistik təsnifatına izahlar. MNT-2004. İzahlar, 1-ci cild. Duz. Bakı: 2004, s.126-130
3. Ataşov B.X. Ərzaq təhlükəsizliyinin aktual problemləri. Bakı: Elm, 2005, s.71-75
4. Abbasov V. və b. Kimya. Ümumtəhsil məktəblərinin 8-ci sinif üçün dərslik. Bakı: Aspoliqraf, 2010, s. 74-78
5. Burov V. və b. Fizikadan nümayiş eksperimenti (orta məktəbin yuxarı sinifləri üçün) II cild. Müəllimlər üçün vəsait. Bakı: Maarif, 1979, s.80-83
6. Babayev Ş.M. Fırlanan tıxc tipli maye bölücülərində maye sərfinin hesablanması//Kənd təsərrüfatının elmi xəbərləri, Bakı:1990, № 2, s. 68-70
7. Babayev Ş.M. Qida məhsullarının duzluluğunun ekspress üsulla təyini üçün qurğu//Azərbaycan Milli Elmlər Akademiyası, Gəncə Regional Elm Mərkəzi, Xəbərlər məcmuəsi, Gəncə: 2003, №9, s.34-38
8. Babayev Ş.M.Yeyinti sənaye sahəsində proseslərinin intensivləşdirilməsi və metroloji təminatı // Azərbaycan Milli Elmlər Akademiyası,Gəncə Regional Elmi mərkəzi, Xəbərlər məcmuəsi, Gəncə:2004, №14, s.72-76
9. Babayev Ş.M. və b. Qida məhsullarının duzluluğunun təyini üçün qurğu. Azərbaycan Respublikası Standartlaşdırma, Metrologiya və Patent üzrə Dövlət Agentliyi, Patent № İ 2005 0181, Bakı: 2005, 0,25 ç.
10. Babayev Ş.M. Yeyinti məhsullarının kimyəvi tərkib analizi və keyfiyyətinin idarə olunması məsələləri //Azərbaycan Respublikası Təhsil Nazirliyi. Azərbaycan Texniki Universitetinin Elmi əsərlər – Fundamental elmlər toplusu cild V (18). Bakı: 2006, №2, s.97-100
11. Bağırov R.Y. İşçı axınları idarə edən hidravlik kran //Azərbaycan Kənd Təsərrüfatı Akademiyası, Akademiyanın elmi əsərləri, Gəncə: 2006, 20 s.
12. Bağırov R.Y. Azərbaycan şəraiti üçün işçi axınları idarə olunan çiləyicinin baza\74 en götürümünün əsaslandırılması//Azərbaycan Milli Elmlər Akademiyası, Gəncə Regional Elmi mərkəzi, Xəbərlər məcmuəsi, Gəncə: 2006, №24, s.47-50
13. Babayev Ş.M., Əsgərova A.A və b. Standartlaşdırma və texnologiya //Azərbaycan Kənd Təsərrüfatı Akademiyasının aspirant, magistrant və bakalavrlarının elmi məqalələr toplusu, Gəncə :2008, s.28-32
14. Babayev Ş.M., Əsgərova A.A. və b. Duzluluğa nəzarət üçün yeni qurğu. / Ümummilli lider Heydər Əliyevin anadan olmasının 86-cı ildönümünə həsr olunmuş-Yeyinti, toxuculuq və yüngül sənaye sahələrini aktual problemləri-mövzusunda Respublika Elmi praktik –konfransın proqramı, Azərbaycan Texnologiya Universiteti Gəncə: 2009. s.66-69
15. Babayev Ş.M., Əsgərova A.A. Standartlaşdırma mühəndisliyi // Azərbaycan Texnologiya Universitetinin Elmi xəbərləri, Gəncə:2009, №11-12, s.87-95

Göndərilib: 15.03.2021 Qəbul edilib: 22.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/21-25

**Fərrux Cəlal oğlu Xəlilov**
AMEA Torpaqşünaslıq və Aqrokimya İnstitutu
coğrafiya üzrə fəlsəfə doktoru, dosent
**Fəridə Fərahim qızı Süleymanova**
AMEA Torpaqşünaslıq və Aqrokimya İnstitutu
magistrant
xalilovfarrux@mail.ru

# BÖYÜK QAFQAZIN CƏNUB-ŞƏRQ YAMACI, EROZİYAYA UĞRAMIŞ – BOZQIRLAŞMIŞDAĞ - QƏHVƏYİ TORPAQLARIN FİTOMELİORASİYASI (ŞAMAXI RAYONU TİMSALINDA)

***Açar sözlər:*** *landşaft, torpaq, meşə, deqradasiya, eroziya, qeyri-üzvi gübrə, iqlim, relyef, antropogen amil, məhsuldarlıq, xaşa, otlaq, humus, qida elementləri*

## Phytomelioration of the south-eastern layer of the Great Caucasus, ruptured-broken mountain brown soils (on the example of the Shamakhinsky district)

**Summary**

The article describes the southeastern slope of the Greater Caucasus - Shemakhan region, The results of field and laboratory analysis of soil samples taken from "less disturbed" and "moderately eroded" areas of pastures and pastures in the village of Gizmeidan were discussed, and accurate information on their physiccochemical characteristics was given. After studying the current state of the soil and vegetation of these territories, phyto-reclamation measures were carried out using perennial grasses and mineral fertilizers in the "moderately eroded" territories. Depending on the results of the various options, the farm was given appropriate recommendations. Therefore, it is very important to study ways to increase the productivity of arable land provided to legal entities and individuals using this territory, to provide them with scientific, scientific and methodological assistance in applying the necessary agrotechnical and phytomeliorative control measures.

***Key words*****:** *landscape, land, forest, degradation, erosion, climate, relief, anthropogenic factor, hashtag, fertilizer, pasture, humus, food elements, productivity*

## Giriş

Antorpogen amillərin təsiri nəticəsində heyvanların sistemsiz otarılması, ağac və kolların sistemsiz qırılması, aqrotexniki qaydalara düzgün əməl edilməməsi nəticəsində torpağın üzərini xalı kimi örtən ot örtüyünün deqradasiyaya uğraması, burada qar və yağış sularının, qismən küləyin təsiri nəticəsində torpaq örtüyünü eroziyaya uğradır. Erozyaya uğramış torpaqların qida elementləri yuyulur, fiziki - kimyəvi və su – fiziki xassələri pisləşir, otlaq və örüşlərin məhsuldarlığı aşağı düşür və heyvandarlığa ciddi zərər vurur. Əhalinin kənd təsərrüffatı məhsullarına, o cümlədən ərzaq məhsullarına olan tələbatının ödənilməsini təmin etmək üçün torpaqdan düzgün istifadənin elmi əsaslarını öyrənmək vacib məsələlərdəndi www.russeds.ru (5).

Şamaxı rayonun ümumi ərazisi 154691 hektar, məhsuldar torpaqların ümumi sahəsi 112500 hektar, kənd təsərrüfatına yararsız torpaqların sahəsi 29897 hektar, heyvandarlıq üçün otlaqların sahəsi 40226 hektar, meşə torpaqları 12300 hektar meyvə bağlarının ümumi sahəsi isə 145 hektardır.

Azərbaycan Respublikasında otlaqların və biçənəklərin həm təbii yem bazası kimi heyvandarlığın inkişafında, həm də ətraf mühitin qorunub saxlanmasında mühüm rol oynadığını nəzərə alaraq onlardan səmərəli istifadə edilməsi, yararsız hala düşmüş belə torpaq sahələrinin bərpası və mühafizəsinin gücləndirilməsi dövlətin qarşısında duran əsas vəzifələrdəndir. «Azərbaycan Respublikasında yay-qış otlaqlarının, biçənəklərin səmərəli istifadə olunması və səhralaşmanın qarşısının alınmasına dair Dövlət Proqramı» (*Azərbaycan Respublikası Prezidentinin 2004-cü il 22 may tarixli 222 nömrəli Sərəncamı ilə təsdiq edilmişdir.*) bu sahədə mövcud problemlərin həlli istiqamətində zəruri tədbirlərin həyata keçirilməsini nəzərdə tutur. Dövlət Proqramı yay-qış otlaqlarının və biçənəklərin səmərəli istifadə olunması, torpaqların dağ yamaclarında eroziyaya uğramasının, dağətəyi və düzən rayonlarda şoranlaşmasının qarşısının alınması, dövlət və bələdiyyə mülkiyyətinə aid torpaq sahələrindən istifadə mexanizminin təkmilləşdirilməsi və torpaqların münbitliyinin artırılması yolu ilə, ölkənin ərzaq təhlükəsizliyi, ətraf mühitin, təbii landşaft və biomüxtəlifliyin qorunub saxlanılması və dayanıqlı inkişafın təmin edilməsi məqsədi daşıyır.

Azərbaycan Respublikasında kənd təsərrüfatına yararlı torpaqların, o cümlədən təbii otlaq və biçənək sahələrinin, habelə heyvandarlıqda istifadə olunan yemin strukturunda sənaye üsulu ilə hazırlanmış yüksək qidalı konsentratların az olması təbii yem sahələrinin normadan artıq yüklənməsinə, onların nəzarətsiz istismarı nəticəsində torpaqların eroziyaya uğramasına və arid sahələrdə onların şoranlaşmasına səbəb olur. B.G.Şəkuri (6) Böyük Qafqazin cənub-şərq yamacı, eroziyaya uğramış–bozqırlaşmiş dağ-qəhvəyi torpaqlarının öyrənilməsi və yaxşılaşdırılmasında fundamental tədqiqat işləri apararaq təsərrüfata tövsiyyələr vermişdir.

Rayon ərazisində aqrotexniki mübarizə tədbirlərinə diqqət verilməməsi əkin sahələrində eroziya prosesini (səthi, xətti, külək və.s) gücləndirmiş, onların münbitliyini xeyli pisləşdirməklə kənd təsərrüfatı bitkilərinin məhsuldarlığını nəzərə çarpacaq dərəcədə azaltmışdır.

P.V.Klyuşin (2) Stavropol vilayəti Qoçubay rayonunda müxtəlif meyillikdə yuyulmuş otlaqlarda gedən deqradasiya prosesi və onun qarşısının alınması üçün müxtəlif səmərəli tədbirlərin həyata keçirilməsi və bu səbəbdən də yem otlarının kəmiyyət və keyfiyyət dəyərləndirilməsinin müşahidə olunması barədə nəzəri təcrübi və tövsiyyələrlə çıxış etmişlər.

X.C.Səttarov, S.Z.Əliyev, S.H.Səfərov, R.N.Zeynalov (3) respublikamızın yay və qış otlaqlarında yemçiliyin vəziyyəti və onun inkişaf prespektivlərini öyrənmək üçün müxtəlif ərazilərində fundamental tədqiqat işləri aparmışlar.

Yay otlaqlarının və biçənəklərin mühafizəsini gücləndirmək, onlardan istifadənin səmərəliliyini artırmaq və biomüxtəlifliyin qorunub saxlanılmasını təmin etmək məqsədi ilə V.V.Hətəmov (1) Böyük Qafqazın cənub və şimal-şərq yamaclarında təbii otlaq sahələrinin bitkiçilik tipləri üzrə məhsuldarlığı, yem keyfiyyəti və optimal otarma normalarına aid fundamental tədqiqatlar aparmışdır. H.N.Behbudov apardığı tədqiqatlarında göstərmişdir ki, qış otlaqlarının əksəriyyətində olduğu kimi yaylaqlarında da bitki örtüyünün əmələ gəlməsində paxlalı bitkilərin böyük rolu vardır.

Böyük Qafqazıncənub-şərq yamacı Qobustan rayonu Mərəzə qəsəbəsi ərazisində K.M.Babayeva, F.C. Xəlilov, M.Ə.Quliyeva, N.Mirmövsümova (4) çoxillik otlar (xaşa, yonca) vasitəsilə eroziyaya məruz qalmış kənd ətrafı örüş torpaqlarının münbitliyinin artırılması məqsədilə elmi-tədqiqat işləri aparmış və tövsiyyə xarakterli tədbirlər hazırlamışlar.

Dağlıq zonalarda yayılmış paxlalı bitkilərin əksəriyyəti çoxillilikdir. Yay otlaqlarının əsasını təşkil edən subalp və alp çəmənliklərinin bitki örtüyünün tərkibində 50-yə qədər paxlalı bitki növü inkişaf etmişdir. Onların 95 %ni çoxillik az hissəsini isə birillik bitkilər təşkil edir.

**İşin məqsədi**: Şamaxı rayonu, Qızmeydan kəndi ərazisində bozqırlaşmiş dağ-qəhvəyi torpaqların müasir vəziyyətinin öyrənilməsi, kəndətrafı örüş və otlaq ərazilərində torpaq eroziyasının əmələgəlmə səbəblərini öyrənmək, torpaq örtüyünün münbitliyini yaxşılaşdırmaq, qoruyub saxlamaq və bitki örtüyünün məhsuldarlığını yüksəltməkdir.

**İşin vəzifəsi:** Tədqiqat sahəsinin ümumi vəziyyətininin öyrənilməsi ilə əlaqədar, ərazinin mədəniləşmə səviyyəsini, çoxillik otların və mineral gübrələrin eroziyaya uğramış torpaqlara təsirini öyrənmək, fitomeliorativ yaxşılaşdırma nəticəsində məhsuldarlığın yüksəldilməsi üçün istehsalata tövsiyyələr işləyib hazırlamaqdır.

**Tədqiqat obyekti:** Tədqiqat obyekti Böyük Qafqazın cənub-şərq yamacı-Şamaxı rayonu, Qızmeydan kəndinin örüş və otlaq ərazisidir.

**Tədqiqatın metodikası:** Tədqiqat işlərini yerinə yetirmək üçün aşağıdakı metodlardan istifadə edilmişdir.

*Müqayisəli – coğrafi metod.* Bu metodun əsasında torpaqların torpaqəmələgətirən amillərlə əlaqədə öyrənilməsi, yəni bir tərəfdən torpaqlarla, onların xassə və tərkibləri, digər tərəfdən torpaqlarla cəm halda torpaqəmələgətirən amillər arasında korrelyativ əlaqənin aşkarlanması durur. Bu metod torpaqların kartoqrafiyasında daha geniş istifadə olunur.

*Müqayisəli – analitik metod.* Bu metod kimyəvi, fiziki-kimyəvi, fiziki və başqa analiz metodları sistemlərinin tətbiqi ilə torpaq nümunələrinin tərkib və xassələri haqqında mühakimə yeritməyə imkan verir.

*Stasionar metod.* Bu metod çöl şəraitində torpaq prosesləri və rejimlərinin öyrənilməsinə xidmət edir.

## Təhlil və müzakirə

Azərbaycan Respublikası torpaq ehtiyatları məhdud olan ölkələr sırasına aiddir. Ölkədə adam başına 0,22 hektar əkin yeri və 0,58 hektar kənd təsərrüfatına yararlı torpaq sahəsi mövcuddur. Otlaqların və biçənəklərin adam başına düşən sahəsi isə daha azdır. Bu baxımdan aqrar sektorun, xüsusilə heyvandarlığın inkişafında, əhalinin ayrı-ayrı kənd təsərrüfatı məhsullarına olan tələbatının ödənilməsində torpaqların münbitliyinin artırılması, heyvandarlığın yem bazasının möhkəmləndirilməsi, təbii yem sahələrinin mühafizəsi, otlaqların yaxşılaşdırılması və onların geobotanik zənginliyinin qorunub saxlanılması mühüm əhəmiyyət kəsb edir.

Böyük Qafqazın cənub yamacının bitki örtüyünün öyrənilməsi ilə əlaqədar L.L.Prilipko (1954), V.C.Hacıyev (1962,1970,1974) Q.Məmmədov, E.Yusifov, M.Xəlilov, V.Kərimov (2012) və s. geniş tədqiqat işi aparmışlar. Müəlliflər qeyd etmişlər ki, antropogen amillərin təsiri nəticəsində Böyük Qafqazın cənub-şərq yamacının bitki örtüyü yaxın zamanların (300-500 il) bitki örtüyündən fərqlənir. Bir çox ərazilərdə meşə örtüyü tamamilə sıradan çıxarılmışdır. Şəkil-1.



Qızmeydan kəndi ərazisində yerləşən tədqiqat ərazisində həm az toxunulmuş, həmdə orta dərəcədə eroziyaya uğramış bozqırlaşmış dağ-qəhvəyi torpaqları üzərində torpaq kəsimləri qoyularaq, onların morfoloji quruluşu və fiziki-kimyəvi göstəriciləri müəyyən edilmişdir. 1-ci (az toxunulmuş) və 2-ci (orta dərəcədə eroziyaya uğramış) kəsimlərdə bozqırlaşmış dağ-qəhvəyi torpaqların morfoloji göstəriciləri aşağıdakı kimi olmuşdur.

(1) A 0-24 sm. Tünd qəhvəyi, dənəvari, gilli, yumşaq, çoxlu kök qırıntıları, keçidi aydın, HCl təsirindən qaynamır.

B 24-47 sm. Qəhvəyi, qozvari, bərkvari, kök qırıntıları, keçidi aydın, HCl təsirindən qaynamır.

(2) A 0-13 sm. Qəhvəyi, dənəvari, qozvari, gilli, yumşaq, çoxlu kök qırıntıları, keçidi aydın, HCl təsirindən qaynamır.

B 13-30 sm. Açıq qəhvəyi, qozvari, topavari, bərkvari, kök qırıntıları, keçidi aydın, HCl təsirindən qaynamır.

Göründüyü kimi 1-ci kəsimdə allüvial qatın rəngitünd qəhvəyi,strukturu dənəvari, 2-ci kəsimdə isə analojiolaraq rəngi qəhvəyi, strukturu isə dənəvari, qozvaridir. Kəsimlərin mexaniki tərkibi isə birinci cədvəldə verilmişdir.

**Cədvəl-1. Şamaxı rayonu, Qızmeydan kəndi, bozqırlaşmış dağ-qəhvəyi torpaqların mexaniki tərkibi**

| Kəsim № | Dərinlik sm-lə | Hiqroskopik nəmlik, %-lə | Hissəciklərin ölçüsü, mm-lə, miqdarı %-lə | | | | | Fiziki gil <0,01 mm | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | | | 1-0, 25 | 0,25-0,05 | 0,05-0,01 | 0,01-0,05 | 0,005-0,001 | <0,001 | |
| 1 Az | $AU_{vm}$ 0-19 | 6,44 | 0.64 | 1,76 | 24,80 | 7,20 | 25,60 | 40,00 | 72,80 |
| toxunulmuş | $BY_c$ 19-47 | 6,61 | 0,59 | 2.21 | 22,40 | 5,60 | 35,20 | 34,00 | 74,80 |
| Şamaxı rayonu, | $B/C_{ca}$ 47-78 | 5,90 | 0,41 | 0,39 | 20,80 | 13,60 | 33,20 | 31,60 | 78,40 |
| Qızmeydan | C ca 78-102 | 6,20 | 0,40 | 0,37 | 18,70 | 15,80 | 31,20 | 33,53 | 80,53 |
| kəndi.dsh=1100 m | | | | | | | | | |
| 2 Orta dərəcədə | $AU_{ov}$ 0-13 | 5,93 | 0,93 | 4,67 | 30,40 | 3,20 | 26,80 | 34,00 | 64,00 |
| eroziyaya uğramış | $BY_v$ 13-30 | 6,55 | 0,86 | 4,74 | 27,20 | 10,00 | 23,60 | 33,60 | 67,20 |
| Şamaxı rayonu, | C ca 30-69 | 6,29 | 0,79 | 4,41 | 25,60 | 8,80 | 30,80 | 29,60 | 69,20 |
| Qızmeydan kəndi. | | | | | | | | | |
| dsh=1100 m | | | | | | | | | |

Bozqırlaşmış dağ-qəhvəyi torpaqların mexaniki tərkibi gilli və ağır gillicəlidir. Eroziya prosesi bu torpaqların mexaniki tərkibinə xeyli təsir edir. Belə ki, torpaqların eroziya uğrama dərəcəsi artdıqca onların üst qatlarında fiziki gilin miqdarı azalır. Orta dərəcədə eroziyaya uğramış sahədə allüvial qatda fiziki gilin miqdarı 64% olduğu halda 1-ci kəsimdə az toxunulmuş, sahədə bu göstərici 80,53 % olmuşdur. Bu torpaqların profil boyu lil (<0,001mm) fraksiyasının çoxluğu onların nisbətən mülayim şəraitdə əmələ gəlməsi və torpaq əmələ gətirən süxurların kimyəvi aşınması ilə sıx bağlıdır.

Bozqırlaşmış dağ-qəhvəyi torpaqlar humus və qida maddələri ilə olduqca zəngindir. Bu torpaqların qida maddələri ilə zənginliyi onların kənd təsərrüfatında geniş istifadə olunmasına hərtərəfli şərait yaradır. Ancaq dağ yamaclarında yayılan həmin torpaqlardan düzgün istifadə olunmadığından eroziya prosesi güclənir və onların münbitliyi kəskin aşağı düşür. Cədəl 2.

Cədvəldən göründüyü kimi 2-ci kəsimdə az toxunulmuş sahədə profil boyu humusun miqdarı 4,32% - 1,03 orta dərəcədə eroziyaya uğramış sahədə isə bu göstərici 3,11-0,93 % olmuşdur. Anoloji olaraq ümumi azot 0,252-0,070 və 0,196-0,056% olmuşdur. Nəmlik göstəricisi A-qatındatoxunulmamış sahədə 6,61%, orta dərəcədə eroziyaya uğramışsahədəisəbu göstərici 5,93%, olmuşdur.

Mütəhərrik fosforun və $CO_2$ %-ə görə $CaCO_3$ %-lə miqdarının göstəriciləridə 2-ci cədvəldə göstərilmişdir.

**Cədəl 2. Bozqırlaşmış dağ-qəhvəyi torpaqların əsas aqrokimyəvi göstəriciləri**

| Kəsim № | Dərinlik sm-lə | Humus % | Ümumi azot %-lə | Mütəhərrik fosfor $P_2 0_5$ 1kq torp. mg/kg | CO2 %-lə | CO2%-ə görə CaCO3 %-lə |
|---|---|---|---|---|---|---|
| **1 Az toxunulmuş** | A 0-19<br>B 19-47<br>B/C 47-78 | 4,32<br>2,64<br>1,03<br>0,63 | 0,252<br>0,154<br>0,070<br>0,051 | 21,11<br>19,99<br>18,81<br>18,01 | 2,49<br>5,19<br>3,78<br>3,12 | 5,67<br>11,86<br>8,63<br>7,41 |
| **2 Orta dərəcədə eroziyaya uğramış** | A 0-13<br>B 13-30<br>C 30-69 | 3,11<br>1,86<br>0,93 | 0,196<br>0,112<br>0,056 | 19,99<br>18,88<br>16,66 | 1,94<br>4,69<br>3,31 | 4,43<br>10,65<br>7,52 |

Şamaxı inzibati rayonu-Qizmeydan kəndi ərazisində eroziya prosesi geniş yayılmışdır. Biçənəklərdə kəndətrafı örüşlərdə səthi su axımı güclənərək torpağın humus qatını yuyur, qida elementləri azalır, bununla yanaşı örüşlərdəndüzgün istifadə edilməməsi, otarma qaydalarının pozulması yem otlarının məhsuldarlığını çox aşağı salır. Bunu nəzərə alaraq Şamaxı rayonunda yerləşən Qizmeydan kəndi ərazisində kəndətrafı örüşlərdə səthiyaxşılaşdırma apararaq çoxillik otlardan xaşa səpini mineral gübrələrdən azot, fosfor, kalium gübrəsindən istifadə etmiş təcrübələrdə fenoloji müşahidə aparmışıq. Paxlalı ot bitkisinin boyu iyul aylarında 3 saylı cədvəldə göstərilmişdir.

3 saylı cədvəldə 2017-2018-2019-cu illərdəxaşa bitkisinin boyu iyul ayında “Nəzarət”-ənisbətən variantlar üzrə aşağıdakı kimi olmuşdur.

**Cədvəl-3. Eroziyaya uğramış bozqırlaşmış dağ-qəhvəyi torpaqlarda xaşa bitkisinin “boy artımı” (2017-2018-2019-cu illər sm-lə**

| Sıra № si | Variantlar | 2017-ci il | | 2018-ci il | | 2019- cu il | | Cəmi orta artım sm-lə |
|---|---|---|---|---|---|---|---|---|
| | | İyul | Artım | İyul | Artım | İyul | Artım | |
| 1 | **Nəzarət** | 31,0 | - | 28,0 | - | 38,0 | - | - |
| 2 | **Təbii yem+xaşa** | 46, 0 | 15 | 50,0 | 22,0 | **71,0** | **33,0** | 23,3 |
| 3 | **Təbii yem +$N_{45}P_{45}K_{45}$** | 55,0 | 24 | 63,0 | 35,0 | **75,0** | **37,0** | 32,0 |
| 4 | **Təbii yem+ xaşa $N_{45}P_{45}K_{45}$** | 61,0 | 30 | 76,0 | 44, 0 | 83,0 | 45,0 | 41,6 |

3 saylı cədvəldən göründüyü kimi, xaşa bitkisinin boy artımı “nəzarətə” nisbətən 2017-ci ildə 15 sm, Təbii yem+ xaşa $N_{45}P_{45}K_{45}$–30 sm, olmuşdur. 2018-cu ildə 22 sm Təbii yem+xaşa $N_{45}P_{45}K_{45}$-50 sm arasında dəyişmişdir. 2019-cu ildə 23,3 sm Təbii yem+ xaşa $N_{45}P_{45}K_{45}$-45 sm arasında dəyişmişdir. Əsasən Təbii yem+$N_{45}P_{45}K_{45}$ variantında bitkinin boyu daha məhsuldar olmuşdur. Eyni zamanda xaşa bitkisinin

məhsuldarlığının müəyyən edilməsi üçün Nəzarətdə və digər variantlarda biçin aparılaraq bitkinin yaşıl kütləsinin və quru ot kütləsinin illər üzrə məhsuldarlığı müəyyən olunmuşdur.

**Cədvəl- 4. Eroziyaya uğramış bozqırlaşmış dağ-qəhvəyi torpaqlarda xaşa bitkisinin məhsuldarlığı (2018-2019-cu illər. Sent/ha)**

| Sıra № si | Variantlar | Məhsuldarlıq (2017) | | | Məhsuldarlıq (2018) | | | Məhsuldarlıq (2019) | | | Cəmi Artım |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | Yaşıl kütlə | Quru ot | Quru ot Artım | Yaşıl kütlə | Quru ot | Quru ot Artım | Yaşıl kütlə | Quru ot | Quru ot Artım | |
| | | Sent/ha | | | Sent/ha | | | Sent/ha | | | |
| 1 | **Nəzarət** | 34,5 | 9 | | 31,0 | 8,0 | - | 30,0 | 8,0 | - | **8,3** |
| 2 | **Təbii yem+xaşa** | 55,0 | 17 | 8 | 59 | 20 | 12 | **77** | **25** | 13 | **11,0** |
| 3 | **Təbii yem +$N_{45}$ $P_{45}$ $K_{45}$** | 61 | 20 | 11 | 78 | 25 | 17 | **80** | **27** | 15 | **14,3** |
| 4 | **Təbii yem+ xaşa $N_{45}$ $P_{45}K_{45}$** | 96 | 31 | 22 | 106 | 31 | 23 | 125 | 40 | 28 | **24,3** |

Təcrübə apardığımız eroziyaya uğramış kəndətrafı örüşlərdə 2017-2018-2019 cu illərdə alınmış məhsul 4 saylı cədvəldə göstərilmişdir. Həm 2017-ci ildə həmdə 2018-2019-cu illərdə mineral gübrələrdən istifadə olunmuş variantlarda "Nəzarət"-ə nisbətən məhsuldarlıq daha yaxşı olmuşdur. Belə ki, 2017-ci ildə Təbii yem xaşa+$N_{45}P_{45}K_{45}$ variantında məhsuldarlıq "Nəzarətə" nisbətən 22 sentner, 2018-ci ildə Təbii yem+xaşa $N_{45}P_{45}K_{45}$ variantında məhsuldarlıq "Nəzarətə" nisbətən 23 sentner, 2019-cu ildə isə bu rəqəm 28 sentner artmışdır. 2017-ci ildə Təbii yem+xaşa variantında isə (gübrəsiz) anoloji olaraq məhsuldarlıq "Nəzarətə" nisbətən 8 sentner, 2018-ci ildə 12 sentner, 2019-cu ildə isə 13 sentner olmuşdur. Lakin qeyd etmək lazımdır ki, 2019 cu ildə Təbii yem +xaşa variantı ilə Təbii yem +$N_{45}P_{45}K_{45}$ variantında məhsuldarlıq arasında fərq çox az olmuşdur. Xaşa bitkisi mil köklərə malik olduğuna görə və azotobakteriyalar havadan $N_2$-tu mənimsədiklərinə görə torpağında məhsuldarlığını artırır.

## Nəticə

Tədqiqat mövzusuna dair təbii təsərrüfat ərazisində-"Nəzarətdə" və müxtəlif variantlarda fenoloji müşahidələr aparılaraq bitkilərin boy artımının dinamikası müəyyən olunaraq, xaşa bitkisinin yaşıl kütləsinin və quru kütləsinin məhsuldarlığına təsiri müəyyən olunmuşdur. Eyni zamanda müəyyən olunmuşdur ki, 2019 cu ildə Təbii yem +xaşa variantı ilə Təbii yem +$N_{45}P_{45}K_{45}$ variantında məhsuldarlıq arasında fərq azalmışdır. Xaşa bitkisi mil köklərə malik olduğuna görə və azotobakteriyalar havadan sərbəst azotu ($N_2$) mənimsədiklərinə görə torpağında məhsuldarlığını artırır. Eyni zamanda növbəti illərdə mineral gübrələrdən istifadənin azaldılması üçün tədbirlər planı işlənib hazırlanmışdır.

## Ədəbiyyat

1. V.V.Hətəmov "Azərbaycanın otlaq ekosistemləri və qorunması". Bakı: Elm, 2000, 184 s.
2. P.V.Klyuşin Stavropol vilayəti." Qoçubay rayonunda yem sahəsinin müasir vəziyyəti və yaxşılaşdırılması". Stavropol, 2003. Səh. 148.
3. X.C.Səttarov, S.Z.Əliyev, S.H.Səfərov, R.N.Zeynalov. "Azərbaycan Respublikasında yemçiliyin və heyvandarlığın vəziyyəti, onların inkişaf prespektivləri". Bakı 2002, səh.180
4. K.M.Babayeva, F.C.Xəlilov, M.Ə.Quliyeva, N.Mirmövsümova "Mineral gübrələrin eroziyaya uğramış bozqırlaşmış dağ-qəhvəyi torpaqlarda çoxillik otların məhsuldarlığına təsiri". № 1 Bakı, 2012, səh. 53-56.
5. www.russeds.ru. "Mədəni otlaqların yaradılması və istifadəsi"
6. Б.К.Шакури «Биолого-экологическая особенность почв системы вертикальной зональности юго-восточной части Бххольшого Кавказа. Баку, 2004, 344стр.

Göndərilib: 12.03.2021 Qəbul edilib: 19.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/26-29

**Gunel Sadaqat Aliyeva Mammadova**
Baku State University
doctor of philosophy in historical sciences
gunkaa.m@gmail.com

# THE POSİTION OF WOMEN IN THE WORLD

## Summary

It is no secret today that gender development and the empowerment of women are important aspects for women in decision-making, as well as for their presence in leadership positions.

Unfortunately, no country in the world has yet managed to achieve full equality between the sexes. Iceland came closest to this, closing 88% of the gender gap.

At the present stage a woman's task is to achieve success in work, career growth, material independence, and only then the status of a wife and mother. Thus, there is a so-called reassessment of values, which in turn leads to a rethinking of the meaning of the family and marital relations in the life of the weaker sex.

Women around the world are more at risk of poverty than men and, on average, are less protected and also receive lower wages.

The study of this topic is important in the world.

***Key words:*** *gender, woman, man, stereotypes, world, Islamic, Christian, Jewish, emancipation*

## Introduction

Today women are important in society. Women from western and several eastern countries not only housewives: they have right to realize their own position in society. If she is a mother, she has to take care also of her children´s life too. If she is married, additional stress can be on her shoulders. Yet they will still perform very well in the work environment in some cases better than their male counterparts.

But despite of all facts, women are still fighting for their rights at the present stage. In history for a long time women were disenfranchised. Menstruation and gestation have historically influenced and limited the role that women played in society. Many countries in postmodern period also are closely connected with centuries-old traditions, that's why the position of women in a lot of country is not satisfactory.

## Research question and the purpose to the study

Purpose of this study was to determine the constructing identity, the negative effects of social development on women`s position in modern society. To identify the causes of such a heterogeneous approach of society to women, the reluctance of many men to allow the realization of women's positions in modern society. Also the desire to answer the many questions that concern modern women.

As mentioned above, unfortunately, many women in some countries are free, and in others, on the contrary, are dependent on their family, husbands, traditions, etc. There are many objective and subjective reasons for all this. Today in some countries women do not have the right not only to work but also to get an education.

## Research methods

Data for this study were collected using books developed by famous scientist in recent time.

## Review of related literature

Okin S.M. (2007), stated feminists made profound contribution to improve position of women, to address the crucial question of rivalry between men and women throughout history. It's important to use gender-neutral language in the discussion of traditions subordinated women not only in family, in all sphere of society generally (10).

Sabah Fatna (1984), extensively wrote about specificity of Asiatic marriages and role of women in all these processes. Also author focused the attention on prenuptial agreement, without so contract in modern political system it is easy subordinate women in marriages (14).

Gary K. Clabaugh (2010), a professional speaker in journal article paid attention women education in secular schools. Really, it is important moment for all women in the world. Unfortunately, in underdeveloped countries women have so problem. Often men do not allow women to get education, especially in such secular schools, which cuts women's rights (1).

O` Neill M. (2007), author described increasingly role of women in the world, wrote about need of Interriligious Dialogue, because women have common problems in the new world order. Cristian, Muslim and Jewish women must speak about their problem and make an effort to remedy situation for the better. Therefore, well educated women in all areas should unite (9).

Dahlerup D. (2013), it is also very interesting book. Here was stated the role of women in politics. Was written moments that become an obstacle for women to pursue a career in politics (3).

Milkman R. (1987), this book made significant contribution to learn the status of women on the eve and during World War II. It is not secret to anybody, women had not so importance in socio-economic and political sphere before outbreak of the Second World War. During this war, which became a serious challenge to humanity were changed a lot of aspects of politics. During war and in post war period were activated labor demonstrations, intensively began formation many political parties and organizations with program, which called people to stop wars and respect human rights. All these facts undoubtedly had a positively impact on women status an ambitious also (6).

Rowbatham Sh. (1974, 2014), telling about women role in revolution in the modern world, speaker tried to prove importance of women not only in crucial historical events, but also in future. The humanity must take into account position of women not only in society, also in family relation. The role of women as mother and wife must for society (12).

The legislation of the states of the ancient East allowed polygamy. In addition, according to the laws of Hammurabi and Egypt, it was possible to marry slaves. Common to all countries of the ancient East was the rule, according to which a wife who cheated on her husband was severely punished. In Egypt, for this, the husband's lynching of his wife was envisaged; according to the laws of Hammurabi, a woman was punishable by death (13, p.24).

In medieval and modern periods of history women had an important place only in family, did not have right to realize their own position in society, to get education, etc. So negative reasons in history had impact on the status of women. The lives of women in the Middle Ages were determined by the Church and the aristocracy in Europe.

Politically, women were able to rise to the highest levels of sovereignty. They could become queens and rule over kingdoms, or become regents and rule in the name of a minor child. This equality of powers was only because medieval politics were dynastic. In other words, offices passed down from fathers to sons (15).

Throughout the Middle Ages, lower-class women were bakers, brewers, milkmaids, barmaids, artisans, weavers and, primarily, tenant farmers who worked alongside their husbands and children in the fields. The feudal system dictated that the land belonged to the lord, who rented it to his tenants – the serfs – who were bound to that land. The lord controlled every aspect of the serf's life and this extended to a man's wife and daughters (4).

The problems of Middle Eastern women remain acute. Islamic, Christian, and Jewish jurists and theologians—all of them males—have provided Middle Eastern society with the most exclusivist and conservative interpretations of religious laws, which have burdened women in the family, the society, and the state (5).

Religious-based law exists in the Middle East, but not exclusively in Muslim countries; it is also present in the Jewish state of Israel. Rabbinical judges are reluctant to grant women divorces, and, as in Saudi Arabia, Israeli women cannot hold public prayer services. Marital relations in Israel, governed by Jewish law, determine that the husband should pay for his wife's maintenance, while she should provide household services (8, p.5).

Unfortunately, there are many misperceptions about position of women in Arab countries. In a lot of countries dominates the thoughts about veiled, uneducated, disenfranchise women in Arab countries.

But really some Middle East states recognized the political rights of women relatively early—Syria in 1949, Lebanon in 1952, Egypt in 1956, and Tunisia in 1957. It is worth adding here that Turkey, a Muslim country in the Mediterranean basin, although of course not an Arab state, recognized women's right to vote in 1930 and their right to stand for elections in 1934, ahead of many European countries (12, p.4).

It is interesting the significant achievement, which laid the foundations for democratic and secular statehood in Azerbaijan (1918-1920), was women suffrage. By granting women the right to vote in 1918, the same year as Poland did. Azerbaijan, was a pioneer in the universal suffrage movement being ahead of the Benelux countries (1919), the United States (1920), France and Italy (1945) (17).

As the Islamic state and religion expanded, interpretations of the gender roles laid out in the Quran varied with different cultures. For example, some religious scholars in IX and X century Iraq were prescribing more restrictive roles for women, while elite women in Islamic Spain were sometimes able to bend these rules and mix quite freely with men.

Some contemporary women and men as well - reject the limitations put on women and are reinterpreting the Quran from this perspective (16).

The equation of men and women rights became important part of internal policy in Soviet government also. Emancipation of women was to involve the destruction of the monogamous family in the USSR (2, p.662).

In post-war the situation of women was made difficult not only by deep socio-economic problems, also by the creation of “gulag” or labor camp and “cult of personality” under Stalin. These artificially facts delayed the nomination of women. Stalin was conservative and he tried to suspend the process of strengthening the position of Soviet women in society. In post-Stalin period in country again started mitigation for women.

Generally, the biggest changes in women position in the Soviet Union was established in Khrushchev era. His internal policy gave new impetus to “woman guestion” in this country (7, p.5).

Unlike men, women in the USSR not only worked and realized themselves in society, also had to work at home.

Determining the nature of gender relations in the Soviet period, sociologists qualify it as a “working mother contract”. This means that in such a system a woman was assigned two roles - “toilers” and “mothers”. Throughout the years of the existence of socialism, these roles remained obligatory for it. They provided her with the status of citizen.

The Soviet Union, which emancipated women, paid special attention to the role of women in society, which led to their activation and development in post-war period. Specially the process of activating women became notable in the 50-60s, when women realized in society their activity without barriers. Undoubtedly this process was very advanced and distinguished the country in the existing world law and order.

## Conclusion

We considered the position of women relevant problem in modern society. Today, many world countries have a lot economic, political problems. But all countries have problem connected with women position.

Emancipation of women in history became very progressive action. After this events the leading countries paid special attention to the role of women in society, which led to their activation and development in post-war period. Specially the process of activating women became notable in the 50-60s, when women realized in society their activity without barriers. Undoubtedly this process was very advanced.

But despite of all these facts, a lot of Muslim countries have so problems. For example, in Afghanistan women have not rights to get education, to wear clothes to taste, marry as desired. So problem have all women in Persian Gulf monarchies. They live under subordinate their husband. In Western Europe countries women have not so problem, but they haven`t time for family relation. They paid a lot of attention to their carrier.

Today progressive people must address all these problems.

## References

1. Clabaugh G.K. (2010). A HISTORY of MALE ATTITUDES TOWARD EDUCATING WOMEN EDUCATIONAL HORIZONS. Vol. 88, No. 3, 164-178
2. Erh-Soon T. (1972). THE AMERICAN JOURNAL OF COMPARATIVE LAW. Vol. 20 (4), 662-692
3. Dahlerup D. (2013). WOMEN, QUOTAS AND POLITICS. LONDON: ROUTLEDGE
4. Joshua J.M. WOMEN IN MIDDLE AGES - https://www.ancient.eu/article/1345/women-in-the-middle-ages
5. Khalil A.A. (2005). WOMEN IN THE MIDDLE EAST - https://ips-dc.org/women_in_the_middle_east -
6. Milkman, R. (1987). GENDER AT WORK. THE DYNAMICS OF JOB SEGREGATION BY SEX DURING WORLD WAR II. UNIVERSITY OF ILLINOIS PRESS
7. Melanie I. - WOMEN IN THE KHRUSHCHEV ERA: AN OVERVIEW https://link.springer.com/chapter/10.1057%2F9780230523432_2
8. Moghadam V.M. (2003). MODERNIZING WOMEN: GENDER AND SOCIAL CHANGE IN THE MIDDLE EAST SECOND EDITION
9. O` Neill M. (2007). MENDING A TORN WORLD: WOMEN İN INTERRİLİGİOUS DİALOGUE. ORBİS BOOKS
10. Okin S.M. (2007). JUSTICE, GENDER AND THE FAMILY. NEW YORK: BASIC BOOKS A MEMBER OF THE PRESEUS BOOKS GROUP
11. Ottaway M. (2004). WOMEN’S RIGHTS AND DEMOCRACY IN THE ARAB WORLD-https:// carnegieendowment.org/files/CarnegiePaper42.pdf
12. Rowbatham, Sh. (1974, 2014). WOMEN, RESISTANCE AND REVOLUTION. NEW LEFT BOOKS IMPRINT. LONDON, NEW YORK
13. Rudkovskaya Y.D. https://core.ac.uk/download/pdf/290240504.pdf-Е.Д.ПРАВОВОЕ ПОЛОЖЕНИЕ ЖЕНЩИНЫ В СЕМЬЕ В СТРАНАХ ДРЕВНЕГО ВОСТОКА (LEGAL STATUS OF WOMEN IN THE FAMILY IN THE COUNTRIES

14. Sabah F. (1984). WOMEN IN THE MUSLIM UNCONSCIOUS. OXFORD: PERGAMON PRESS
15. THE STATUS OF WOMEN IN MEDIEVAL EUROPE. By Philip Daileader, Ph.D., College of William & Mary - https://www.thegreatcoursesdaily.com/the-status-of-women-in-medieval-europe -
16. WHAT FACTORS DETERMINE THE CHANGING ROLES OF WOMEN IN THE MIDDLE EAST AND ISLAMIC SOCIETIES? - http://www.pbs.org/wgbh/globalconnections/mideast/questions/women
17. Azerbaijan Democratic Republic: The first democratic, parliamentary and secular republic in the Islamic East - https://neweasterneurope.eu/2018/06/01

Göndərilib: 15.03.2021 Qəbul edilib: 22.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/30-32

**Şəhla Rafael qızı Yusubova**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru, dosent
kombc@mail.ru
**Jalə Həsən qızı Zeynalova**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru, assistent
doctor.zhala@gmail.com
**Şəfəq Əlif qızı Məmmədova**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru, assistent
shaxada81@mail.ru
**Həcər İradə qızı İsmayılova**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru, assistent
hacerismayilova.78@gmail.com

# AĞIZ BOŞLUĞU SELİKLİ QIŞASININ DİSBAKTERİOZLARININ SOSİAL-EPİDEMİOLOJİ SƏBƏBLƏRİ

***Açar sözlər**: ağız boşluğu, selikli qişa, disbakteriozlar*

## Social-epidemiological prerequisites for dysbacteriosises formation of tunica mucosa of mouth

**Summary**

The purpose of the study was an exposure of social-epydemiological prerequisites for the dysbacteriosis of mouth's tunica mucosa. It was observed 195 patients, selected according to preventive measures and dental health service appealability. The assay samples (biomaterials) from miscellaneous biotopes of all patients were inspected during the microbiology study by system BMSB (WHO, 1984).

As a result of researches it was revealed that most proportion of dysbacterioses accounts for patients living in city centre - 44,7±4,5%. The given index amongst patients with normal microflora was 18,1±4,6%. There was the decrease of sickness rate in pericentre - 30.1±4,2%, in uptowns - 16,3±3,3% and in villages - 8,9±2,6%. For dysbacteriosis formation of a mucous membrane of oral cavity (MMOC) the following social-epidemiological prerequisites had vital importance: a material trouble, unsatisfactory living conditions, residence in polluted by exhausts city centre and the certain social-occupational adaptation. Realization of measures for reduction of activity of the aboved mentioned social-epidemiological prerequisites permits to confine the risk of dysbacteriosis formation of MMOC.

***Key words**: oral cavity, mucous membrane, dysbacteriosis*

Disbakteriozlar orqanizmin müxtəlif boşluqlarının normal mikroflorasının kəmiyyət və keyfiyyət tərkibinin dəyişməsidir. Normal mikroflora ən mühüm, həyati vacib funksiyaları yerinə yetirir və hər şeydən əvvəl orqanizmi mikroorqanizmlərin təcavüzündən qoruyur (1, 2). Endogen və ekzogen xarakterli müxtəlif amillərin (immunoloji, hematoloji, mexaniki, kimyəvi, temperatur və s.) və sistemli təzahürlərlə müşayiət olunan xəstəliklərin təsiri altında müdafiə funksiyaları zəifləyir və ya orqanizmin böyük funksional əhəmiyyət daşıyan sisteminin-həzm traktının, xüsusən ağız boşluğunun selikli qişası zədələnir. Nəticədə ağız boşluğunun selikli qişasında (ABSQ) mikrob disbalansı yaranır və onun da fonunda ABSQ xəstəliklərinin çoxsaylı nozoformaları inkişaf edir (3, 4).

Lakin bir çox iltihabi-infeksion xəstəliklər kimi,disbakteriozların əmələ gəlməsi də sosial-epidemioloji şərait olduqda baş verir. Son illərin tədqiqatları göstərir ki, disbakteriozlar və onların törətdiyi ABSQ xəstəlikləri inkişaf etməkdə olan və postsosialist ölkələrində, əhalinin mərkəzləşdirilmiş su təchizatı və kanalizasiyası olmayan, qeyri-qənaətbəxş mənzil şəraitində yaşayan kasıb təbəqəsi arasında daha geniş yayılmışdır (5, 6). Sənaye mərkəzlərində güclü surətdə çirklənmiş atmosfer havası ABSQ-yə qıcıqlandırıcı təsir göstərir.

ABSQ xəstəlikləri ən çox avtomobillərin hərəkəti intensiv olan ərazilərdə yaşayan əhali arasında, həmçinin əsasən açıq havada ağır fiziki işlə məşğul olanlar arasında aşkar edilir. Bütövlükdə, disbakteriozların əmələ gəlməsinin tezliyi və xarakteri müəyyən dərəcədə sosial-epidemioloji qanuna

uyğunluqlara tabe olur ki, onların da aşkar edilməsi və dürüst qiymətləndirilməsi disbak-teriozların səmərəli profilaktikası üçün əsas ola bilər (7,8).

Bir tərəfdən ABSQ disbakteriozlarının geniş yayılmasını, digər tərəfdən isə onların sosial-epidemioloji cəhətdən az öyrənilməsini nəzərə alaraq, biz bu rakursda tədqiqatlar aparmışıq ki, onların da nəticələri hazırkı məlumatda təqdim edilmışdır.

**Tədqiqatın material və metodları**. İş ağız boşlugunun profilaktik stomatoloji müayinəsinə görə müraciət edənlər arasında təsadüfi seçmə yolu ilə gruplaşdırılmış 195 xəstə arasında aparılmışdır. Bütün xəstələrdən biomaterial götürülmüş və ÜST-un təklif etdiyi BMSB sistemi üzrə onların mikrobioloji müaniyəsi aparılmışdır. Bu sistem bioloji materialda mikroorqanizmləri maksimal dərəcədə aşkar etməyə və onların növ diferensiasiyasını həyata keçirməyə imkan verir. Normal mikroflora 72 pasiyentdə (sağlam ağız boşluğu), patogen mikroflora isə 123 pasiyentdə (disbakteriozlu) aşkar edilmişdir, o cümlədən 49 hadisədə kəskin, 74 hadisədə xronik mərhələdə.Bütün pasiyentlərdə klinik və sosial-epidemioloji məlumatlar (yaşayış yeri və şəraiti, sosial-peşə yönümü) toplanmaqla anketləşdirmə aparılmışdır.Nəticələrin statistik işlənməsi zamanı Styudent meyarından istifadə edilmişdir. (9)

**Tədqiqatın nəticələri və onların müzakirəsi.** Patogen və normal mikroflorası olan xəstələr arasında anketləşdirmənin nəticələrinin müqayisəli təhlili ABSQ disbakteriozlarınının əmələ gəlməsi üçün əlverişli şərait yaradan bir sıra sosial-epidemioloji amilləri aşkar etməyə və qiymətləndirməyə imkan vermişdir. Onların arasında xəstələrin maddi imkan səviyyəsi xüsusilə seçilir.

Xəstələnmənin ən böyük xüsusi çəkisi kasıb və çətin maddi vəziyyəti olan xəstələrin payına düşür müvafiq olaraq 35,8±4,3% və 35,0±4,3% (p>0,05).Maddi vəziyyəti normal olan xəstələrin xüsusi çəkisi xeyli azalır və 19,5±3,6% təşkil edir (p<0,01). Maddi imkan səviyyəsi yüksək olan xəstələrin xüsusi çəkisi isə cəmi 9,8±2,7% təşkil edir (p<0,05). Yəni maddi imkan nə qədər pis olarsa, insan disbakteriozların əmələgəlmə riskinə və ABSQ xəstəliklərinin müxtəlif, nozoformalarının inkişaf riskinə bir o qədər çox məruz qalır. Pasiyentlərin kontrol qruplarında tamamilə başqa mənzərə müşahidə olunur. Onların arasında maddi imkan səviyyəsi varlı və normal olan pasiyentlər üstünlük təşkil edir, onların xüsusi çəkisi müvafiq olaraq 34,7±5,6% və 33,3±5,6% təşkil edir (p>0,05). Maddi imkan səviyyəsi çətin olan xəstələrin xüsusi çəkisi 20,8±4,8%-ə qədər (p>0,05), kasıb olanların – 11,1±3,7%-ə qədər (p>0,05) azalır. Yəni maddi imkanın qənaətbəxş vəziyyətdə olması bir çox hallarda disbakteriozların əmələgəlmə riskinin qarşısını alır.

ABSQ disbakteriozlarının əmələ gəlməsində maddi imkanın belə mühüm rolu onunla izah olunur ki, maddi imkan çətin olduqda, pasiyentlər disbakteriozların başlanğıc mərhələlərində stomatoloji yardıma müraciət etmir və onların müalicə edilməsinə özləri təşəbbüs göstərirlər. Bu zaman, anketləşdirməyə görə, həm müalicə vasitələrinin seçilməsində, həm də dərmanın dozasında və müalicə kursuna əməl edilməsində ciddi qüsurlar baş verir ki, bu da Xəstəliklərin ağırlaşmasına və xronik hala keçməsinə gətirib çıxarır. Yalnız xəstəliklərin dəfələrlə baş verən kəskinləşmələrindən və residivlərindən sonra xəstələr stomatoloji yardıma müraciət edirlər.

Maddi imkan əhalinin sağlamlığında əks olunan aparıcı sosial amil olsa da, xəstələnmənin sosial şəraitdan asılılığının tam mənzərəsini yaratmır. Bir çox hallarda bu mənzərə mənzil-kommunal şəraitin vəziyyətinin təhlili yolu ilə tamamlanır ki, bunu da biz müşahidə aparılan pasiyent qruplarına münasibətdə tətbiq etmişik.

ABSQ xəstəlikləri olan xəstələrin xeyli hissəsi primitiv mənzil-kommunal şəraitində yaşayır (həyət sistemi, mərkəzləşdirilmiş su təchizatının və kanalizasiyanın olmaması, sıx və bərbad otaqlar, havası dəyişilməyən və qışda qızdırılmayan mənzillər, tibb müəssisələrindən uzaq olma və s.), onların xüsusi çəkisi 33.3±4.3% təşkil edir. Bunun əksinə olaraq,bu pasiyentlərin az bir hissəsi komfort mənzil-kommunal şəraitində (boyük yaşayış sahəsinə malik,daim isti və soyuq suyu olan, kondisionerləşdirilmiş və isitmə sistemi olan, abad sanitariya qovşağı olan müasir çoxmərtəbəli binalar) yaşayır-13,0±3,0% (p<0,001). kontrol qrupda isə komfort mənzil-kommunal şəraitində yaşayan pasiyentlər üstünlük təşkil edir, nəinki primitiv şəraitdə-36,1±5,7% və 15.3± 4.3% (p< 0,01). Görünür, mənzil-kommunal şəraiti nə qədər pis olarsa, mənzilin gigiyenasının saxlanması, gigiyenik prosedurlara əməl edilməsi, xüsusən də ağız boşlugunun gigiyenası ilə əlaqədar prosedurlara əməl edilməsi bir o qədər çətin olur ki, bu da patogen mikro-orqanizmlərin dövr etməsinə əlverişli şərait yaradır.

Bir çox infeksion-iltihabi xəstəliklər zamanı əhalinin sosial-peşə xüsusiyyətləri risk amilləri rolunda çıxış edir. Müşahidə etdiyimiz pasiyent qruplarında bu xüsusiyyətlərin spektri olduqca genişdir. Ona görə də, biz öz seçimimizi onlardan daha çox sosial əhəmiyyət kəsb edənlərin üzərində saxlamışıq.

Hər iki qrupda tələbələrin və xidmət işçilərinin xüsusi çəkisi az və təqribən eyni olub, 2,8±1,7% ilə 8,1±2,5% arasında tərəddüd edir (p>0,05). Aydındır ki, birincilər arasında gənc olduqlarına görə xəstələnmə dərəcəsi aşağıdır, əsasən tibb işçiləri ilə təmsil olunmuş ikincilər arasında isə vaxtında müalicə tədbirləri

gördüklərinə görə aşağıdır. Eyni zamanda kontrol qrupda qulluqçuların, biznesmenlərin və sahibkarların xüsusi çəkisi üstünlük təşkil edir- 25,0±5,1-dən 31,9±5,5%-ə qədər (p>0.05). Görünür, bu qrup pasiyentlərə xas olan yüksək təhsil və sanitariya mədəniyyəti. maddi imkan va normal həyat şəraiti ABSQ xəstəliklərinin riskini azaldır.

Disbakteriozların əmələ gəlməsində sosial-peşə yönümünün rolu xəstələnmənin kəskin və xronik mərhələlərinin ayrı-ayrılıqda təhlili zamanı xüsusilə aydın görünür. Kəskin mərhələnin ən böyük xüsusi çəkisi qulluqçuların, biznesmenlərin və sahibkarların payına düşür - 24,5±6,2%-dən 26,5± 6,4%-ə qədər (p>0,05), yəni yuxanda qeyd olunan sosial-iqtisadi amillərin rolu əsaslı surətdə təsdiq olunur, belə ki, pasiyentlər vaxtında, xəstəliklərin başlanğıc mərhələlərində stomatoloji yardıma müraciət edirlər. Halbuki, qalan sosial-peşə qruplarında kəskin mərhələnin xüsusi çəkisi xeyli azdır və 8,2±4,0%-dən yuxarı qalxmır (p< 0,05).

Xronik mərhalənin xüsusi çəkisi inşaatçılar, hərbi qulluqçular və işsizlər arasında üstünlük təşkil edir 20,3±4,7%-dən 23,0±4,9%-a qədər (p>0,05). Bu qruplar ağır fiziki işlə məşğuldurlar və ya stress yükü altındadırlar, açıq havada işləyir və əlverişsiz iqlim amilərinin təsirinə məruz qalırlar,yəni daha yüksək xəstələnmə riskinə məruz qalırlar. Bununla yanaşı, məişətin nizamsızlığı və maddi cəhətdən sıxıntı ona gətirib çıxarır ki, onlar stomatoloji yardıma yalnız ABSQ xəstəliklərinin xronik mərhələsində müraciət edirlər. Pasiyentlərin qalan sosial peşə qruplarında xronik mərhələnin xüsusi çəkisi aşagıdır və 9,5±3,4%-dən yuxarı qalxmır (p<0,05).

Anketləşdirmənin məlumatları aşağıdakı maraqlı bir halı aşkara çıxarmağa imkan vermişdir. Disbakteriozların ən böyük xüsusi çəkisi şəhərin mərkəzində yaşayan xəstələrin payına düşür - 44.7±4,5%. Normal mikroflorası olan xəstələr arasında bu göstərici cəmi 18,1±4,6% taşkil edir (p<0,001). Mərkəzdən uzaqlaşdıqca, onun qiyməti müntəzəm surətdə azalır-mərkəz ətrafında 30,1±4,2%-a qədər, şəhərin kənarında 16,3±3,3%-ə qədər, qəsəbələrdə 8,9±2,6%-ə qədər (p<0,001). Çox güman ki, şəhərin mərkəzinin avtomobillərdan çıxan qazlarla güclü surətdə çirklənmiş atmosfer havası ABSQ-yə qıcıqlandırıcı təsir göstərir və disbakteriozların əmələ gəlməsinə səbəb olur.

Göründüyü kimi, agız boşluğu selikli qişasının (ABSQ) disbakteriozlarənən əmələ gəlmasində sosial-epidemioloji şərait amilləri mühüm əhəmiyyət kəsb edir ki, onların da arasında maddi imkansızlıq, qeyri-qətnaətbexş mənzil-kommunal şəraiti, şəhərin avtomobilərdən çıxan qazlarla çirklənmiş mərkəzində yaşama və müəyyən sosial-peşə yönümü – xüsusilə seçilir. Qeyd olunan sosial-epidemioloji ilkin şərtlərin aktivliyinin azaldılmasına dair tədbirlərin həyata keçirilməsi ABSQ disbakteriozlarının əmələ-gəlmə riskini azaldacaqdır.

## Ədəbiyyat

1. Чебуркин А.В. Дисбактериоз: патогенетический признак или заболевание?//Вопросы охраны материнства и детства, М., 2006, Т.49, с.75-79.
2. Knoke M., Bernhardt H. Microbiologic des Menschen: Microflora bei Gesunden und Kranken. Berlin, 2003, 135 p.
3. Толстых О.Р., Демянтьев Т.М. Нозология заболеваний слизистой оболочки полости рта. Саратов, 2005, 167 с.
4. Haenet H. Human normal and abnormal mouth flora // Amer.J.Clin.Nutr., 2007, No51, p. 1433-1439.
5. Наумов П.К. Социально-эпидемиологическая оценка распространенности заболеваний слизистой оболочки полости рта среди взрослого населения: Автореф.дисс. ... канд.мед.наук., СПб, 2005, 22 с.
6. Laskaris G. Oral manifestations of infections diseases // DentClin.North.Am., 2005, V.40, p. 395-423.
7. Руденко М.Р., Светлов К.Т., Рада С.С. Раздражающее влияние загазованного атмосферного воздуха на слизистую оболочку полости рта // Проф.забол.населения промышлен.центров, Донецк, 2005, с. 119-122.
8. Зайкин М.С., Ноздров Р.К., Хаитова Н.С. Эпидемиологические закономерности распространения заболеваний полости рта // Инфекционная патология и современный мир, Иркутск, 2005, с.61-64.
9. Гланц с. Медико-биологическая статистика. М., 1999, 459 с.

Göndərilib: 16.03.2021 Qəbul edilib: 22.02.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/33-36

**Xuraman İbniyəmin qızı Məhərrəmova**
Azərbaycan Tibb Universiteti
filologiya üzrə fəlsəfə doktoru, dosent

# ÜMUMİ DİLÇİLİK VƏ AZƏRBAYCAN DİLÇİLİYİNDƏ ÜSLUB VƏ ÜSLUBİYYAT MƏSƏLƏLƏRİ

***Açar sözlər**: ədəbi dil, norma, üslubiyyat, funksional üslublar, dilçilik*

## The issues of style and stylistics in general and Azerbaijani linguistics

**Summary**

With the development and rise of literary language, different styles emerge. Our literary language operates on the basis of a system of styles and fulfills its social function. In this process, different styles emerge and language influences society through this means. Functional styles, which are a historical category, arose out of historical necessity. They do not stay in one state, they develop and change.

Language is a social phenomenon and meaning, and performs certain functions, which also cover various areas of human activity. The diversity of existing ideas and thoughts about the term stylistics also confirms once again that stylistics is a fairly broad field of language.

***Keywords**: literary language, norm, style, functional styles, linguistics*

## Giriş

Üslubiyyat hələ antik dövrdə Romada «ritorika» XVIII-XIX əsrlərdə isə Şərq ölkələrində və Azərbaycanda bəlağət adı altında öyrənilmişdir. Lakin, istər yunan və roma fəlsəfəsində, istərsə Şərq elmində XVIII əsrin sonlarına qədər üslubiyyat ədəbiyyatın bir hissəsi kimi başa düşülürdü. Üslubiyyatda qrammatik qaydalara bənzər qaydalar mövcud idi.

Poetik baxımdan dil obrazları əks etdirən xarici formadır. Burada olan hər bir detal estetik qanunlara tabedir. Bədii əsərlərə "poetika" - söz sənəti kimi baxıldığından bədii qanunlar ön plana keçir, dil isə bu qanunlara tabe edilir və nəticədə, dil incəsənət əsərinin özünəməxsus forması kimi götürülür.

Hər bir bədii əsər incəsənət nümunəsi olsa da, dilçilik baxımından bədii üslub faktı hesab olunur. Dil burada da (bədii əsərlərdə də) fəaliyyət göstərir, həm kommunikativ, həm də estetik vəzifə daşıyır. Dilin bu iki vəzifəsi bədii nitqdə bir məqsədə yönəldilir. Buna görə də bədii əsərlərin dili ədəbi dilin fəaliyyətini, onun bir spesifik formasını əks etdirir. Əgər burada dil kommunikativ vəzifəsini icra etməsə, təkcə estetik vəzifə daşısa, məzmun anlaşılmaz olar. Beləliklə, üslubiyyat bədii əsərlərə ədəbi dilin fəaliyyət sahəsi kimi baxır, buradakı hər bir detalı üslubi məqsədəuyğunluq cəhətdən qiymətləndirir. Bu zaman dil ön plana keçir.

Ədəbi dilin inkişaf və yüksəlməsi ilə müxtəlif üslublar əmələ gəlir. Ədəbi dilimiz üslublar sistemi əsasında fəaliyyət göstərir və öz ictimai vəzifəsini həyata keçirir. Bu prosesdə müxtəlif üslublar əmələ gəlir və dil cəmiyyətə təsirini bu vasitə ilə həyata keçirir. Tarixi kateqoriya olan funksional üslublar tarixi zərurətdən yaranmışdır. Onlar bir vəziyyətdə qalmır, inkişaf edir və dəyişir.

Adından da göründüyü kimi, funksional üslublar mürəkkəb bir sistemdir. Bu sistemi öyrənən zaman son dərəcə diqqətli olmaq lazımdır. Hər hansı üslubda işlədilən söz, ifadə, istifadə olunan faktlar elə seçilməlidir ki, oxucu, dinləyici ona çatdırılacaq fikri başa düşsün, ondan faydalana bilsin. Deməli, fikrin həm məzmunu, həm də forması gözəl, cəlbedici və sadə, anlamlı olmalıdır. Elə bu səbəbdən də hər hansı üslubda yazılan yazı, söylənilən nitq üslubu dilin müəyyən normalarını özündə əks etdirməlidir. Əgər ədəbi dilin üslubi normalarına riayat edilsə, bu sahədə müəyyən müvəffəqiyyətlər və nailiyyətlər qazanmaq olar. Yaşadığımız cəmiyyətin mədəni səviyyəsini ицкsялтмяклə bərabər, gələcək nəsillərə də qiymətli yadigarlar miras qalar.

Beləliklə, üslub və üslubiyyat dilçilik elminin mərkəzi problemlərindəndir. Ayrı-ayrı zamanlarda bu məsələ bir çox dilçilərin tədqiqat obyekti olmuşdur.

Hamıya bəllidir ki, hələ M.V.Lomonosov üslubiyyatın ilk özül daşını qoyarkən üç üslub nəzəriyyəsində əsas kimi bədii ədəbiyyatın janrlarını götürmüşdür (nəsr, poeziya, drama). Əslində «Üç üslub» nəzəriyyəsinin yaranma tarixi çox qədimdir. Mənbəyi Roma imperiyası sayılır. Latın dili qədim Romada əsas nitq formalarını özündə birləşdirir: 1) urbanitas – Roma şəhərinin nitqi; azad vətəndaşların nitqi nümunəvi sayılırdı; 2) rusticitas – kənd adamlarının nitqi, yonulmamış, o qədər də düzgün olmayan nitq; 3) peregrinitas – uzaq, ucqar regionların vətəndaşlarının nitqi, bu nitq yerli dillərlə latın dilinin kontaktı nəticəsində yararlandığından romalılar tərəfindən səhf hesab edilirdi.

Üç üslub nəzəriyyəsinin digər əsası isə söz sənətinin 3 əsas janrı «aşağı», «orta» və «yüksək» idi. Bu nəzəriyyə Romaya yunanlardan gəlmiş və 3 növ müxtəlif məzmunlu əsərləri özündə birləşdirdi: çoban şeirləri, əkinçiliklə bağlı şeirlər, qəhrəmanlıqla bağlı epik poemalar. Bu 3 janra uyğun olaraq onların tərtibində nəinki sözlər və onların adlandırdıqları əşyalar, hətta bu əsərlərdəki qəhrəmanların adları da fərqli olmalı idi. Məsələn; heç vaxt çoban xalq qəhrəmanına çevrilə bilməzdi (1).

Ümumxalq dilinin, misal üçün, üslublarının ayrılması və təsnifi zamanı (onun sosial və məkan differensasiyasını nəzərə almaq şərtilə) müxtəliflik şkalası, üslubiyyat rəngləri qamması özünü tam şəkildə biruzə verərək, dil materialını «ali» kitab elementlərindən tutmuş, «aşağı» ara elementlərə qədər əhatə etmişdir. Məsələn, V.P.Murat funksional üslubların təsnifatını aşağıdakı kimi təklif edir: «1) danışıq-ədəbi, 2) poetik, 3) qəzet-siyasi, 4) rəsmi-işgüzar, 5) elmi, 6) professional-texniki, 7) ara-familyar» (2). Digər tərəfdən, məsələn, R.Q.Piotrovskinin təsnifatı daha kompakt şəkildə özünü göstərir və yığcamlıq prinsiplərinə görə digər təsnifatlardan seçilir. O, kitab (və ya intellektual-kitab), ədəbi-danışıq, ara dil üslublarını ayırır və axırıncı iki üslublari ekspressiv xarakterli üslublar kimi səciyyələndirir (3, 20-21).

Göründüyü kimi, hər iki üslubiyyat təsnifatında ümumi şəkildə özünü göstərən amil «ara» və ya «ara-familyar» üslubun təsnifat sisteminə daxil edilməsidir ki, bu üslub da bir çox hallarda, adətən, təsnifatlar sisteminə daxil edilmir.

Göründüyü kimi, dilin funksional üslublar sistemi və onların əsasında qoyulan təsnifat meyarları çox geniş və rəngarəngdir. Ancaq məhz bu tədqiqatlarda da məsələnin tam həllinə nail olmaq bir neçə baxımdan mümkün olmamışdır. Deyilənləri ümumiləşdirsək, üslubiyyatda öndə duran məsələlərdən aşağıdakıları qeyd etmək olar:

l) «funksional üslub» anlamının tərkibi və tərifi;

2) üslubların təsnifi problemi və bu problemdən doğan üslubların sayı;

3) ədəbi dil üslubları sistemində «ədəbi-bədii üslubun» (yəni, bədii ədəbiyyatın dili) yeri və rolu».

Bu məsələyə qısaca da olsa aydınlıq gətirməyi və bu məsələdə öz mövqeyimizi bildirməyi məqsədəuyğun hesab edirik.

Məlumdur ki, dil sosial hadisə və anlam kimi müəyyən funksiyaları yerinə yetirir ki, bu funksiyalar da insan fəaliyyətinin müxtəlif sahələrini əhatə edir. Bu geniş məsələnin dərinliyinə varmadan, dilin ictimai funksiyalarından ən əsas üçünü qeyd etmək olar: 1) ünsiyyət; 2) məlumat; 3) təsir. Məhz bu funksiyaların realizə olunduğu üçün, tarixən dilin müəyyən formaları (növləri) əmələ gəlmiş və formalaşmışdır ki, bunlar da spesifik leksik-frazeoloji, sintaktik vasitələrin mövcudluğu ilə xarakterizə olunur. Məhz bu növlər dilin funksional üslubları hesab olunur. Qeyd edək ki, ekstralinqvistik (yəni dildən kənar, dil xarici mühütündə) yaranaraq, fikrin məzmun, məqsəd və vəzifələri ilə sıx bağlı olan, dilin üslubları əksinə, dil sistemi çərçivəsində məhz dil daxili, dil-sistem daxili, əlamətlərə görə fərqlənir (ümummilli dil sistemindən dil vahidləri və vasitələrinin seçmə, birləşmə və orqanizə prinsipləri ilə fərqlənirlər: (4, 44-45).

Bu elmi prizmadan çıxış edərək, dilin funksiyalarını (göstərilən ən əsas üç funksiyasını) nəzərə alaraq, biz aşağıdakı üslubların ayrılmasına üstünlük veririk: danışıq (ünsiyyət funksiyası), elmi və rəsmi-işgüzar (məlumat funksiyası), publisistik və bədii-ədəbi (təsir funksiyası) üslublar. Bu baxımdan, üslubiyyat elmində yaranmış üslubların təsnifi müxtəlifliyində də D.E.Rozentalın, İ.R.Qalperinin, R.R.Qelqardtın mövqelərini daha məqsədəuyğun hesab edirik. Burada bir şeyi də qeyd edək ki, sadalanan funksional üslublar çərçivəsində bir çox hallarda dilin digər funksiyaları da özünü büruzə verə bilir. Məsələn, dilin estetik və kommunikativ funksiyaları bu çərçivədən kənarda qalmayaraq bədii ədəbiyyat dilində özünü göstərir və s.

Ədəbi dil normalarının içində «muxtar normalar» da mövcuddur. Bu da ədəbi dilin işləndiyi sahələrlə və ya şərti şəkildə desək, «sahə dilləri» ilə bağlıdır. «Sahə dilləri» «üslubiyyat» linqivistik terminində ifadə oluna bilir. Üslubiyyat tarixi kateqoriya olduğu üçün onun tarixi-mədəni kökləri mövcuddur. Əslində ədəbi dil normasının özü də üslublarda gerçəkləşir. Burada ənənə və müasirliyin hər ikisi təsiredici amildir. Üslub termini geniş sahəni əhatə edir.

Üslublar qeyri-ədəbi dillərin, dialekt və şivələrin, etnik tayfaların təsiri ilə yaranmır. O, məhz konkret bir ədəbi dilin özünəməxsusdur, onun tarixi inkişafının və müasir dövrdəki fəaliyyətinin orijinal funksional rəngarəngliyidir. Ədəbi dillərin inkişaf səviyyəsi və inkişaf yolları eyni olmadığı üçün buradakı funksional üslubların da miqdarı bərabər deyildir.

Terminin tarixi köklərinə aydınlıq gətirən H.Həsənov yazır: «Üslub və üslubiyyat terminləri antik dövrlərdən müvazi şəkildə işlədilir. Bu terminlərin işlədilmə və tətbiq olunma sahələri geniş və müxtəlifdir. Hələ qədim dövrlərdə romalılar dil məsələləri ilə məşğul olarkən üslub və üslubiyyat problemləri onların diqqətindən yayınmamışdır» (5, 207).

Dilin kommunikativ funksiyası, onun insanlar arasında ünsiyyət vasitəsi olması məlumdur. Hər bir dilin də özünəməxsus fonemlər sistemi, leksik ehtiyatı, morfoloji özəlliyi və sintaktik xüsusiyyətləri var. İstər

leksik, istərsə də qrammatik baxımdan dillər xarakterik xüsusiyyətlərə malik olur. Dilin müvafiq səviyyələrini əks etdirən vahidlər əlavə məna çalarlığına və məna yaxınlığına görə bir-birindən fərqlənir. Bu fərqlər nitq prosesi zamanı aydın nəzərə çarpır. Ona görə ki, dilin özü məhz nitq prosesində ünsiyyət vasitəsina çevrilir. Dillə nitq arasında dialektik vəhdət vardır. Bunların biri digərinin yaranmasını şərtləndirir.

Filologiya elmində üslub və üslubiyyat terminləri qədim dövrlərdən işlənmişdir. Amma dilçilik elminin müstəqil sahəsi kimi üslubiyyat adlandırılan bölmə yalnız 50-ci illərdən sonra formalaşmağa başlamışdır. E.D.Polivanov, L.V.Şerba, V.V.Vinoqradov, L.P.Yakubinski kimi görkəmli rus dilçilərinin, Praqa funksional dilçilik məktəbinin nümayəndələri V.Matezius, V.Qavranekin tədqiqatları üslubiyyatın problemlərinin, mövzusunun və vəzifələrinin müəyyənləşməsində böyük rol oynamışdır.

Dil insan fəaliyyətinin bu və ya digər sahəsi ilə bağlı müxtəlif funksiyaları yerinə yetirir. Bunlar dilin kommunikativ, ekspressiv və emosional funksiyalarıdır. Məhz bu yolla məlumat ötürülür. Məlumatın ötürülməsində psixolinqivistik amillərin rolu vardır. Xüsusilə nitqin emosionallığı беля amillərdəndir. Əgər kommunikativliyin başlıca elementi məlumatdırsa, emosionallığın əsas vahidi duyğulardır. Yəni danışıq zamanı danışan həm fikrini, həm də həmin situasiyadakı psixoloji ovqatını ifadə edir. Bu baxımdan nitq prosesinin özü bir sıra özəlliklərə malik olur. Təbii ki, bu zaman söyləyənin situasiya və şəraitə uyğun istifadə etdiyi bir üslub da olur. Bu mənada üslub həm də nitqə aid psixoloji xüsusiyyətləri nəzərdə tutur. Şifahi nitq fərdi üslubi özəlliklərlə zəngindir ki, bunların da ayrıca araşdırılmasına ehtiyac vardır.

Bəzi tədqiqatçılar filologiya elmləri içərisində üslubiyyatı müstəqil bir elm sahəsi hesab edirlər. Tədqiqatçıların əksəriyyəti üslubiyyatı dilçilik elmi hesab etsələr də, burada fərqli mülahizələrlə rastlaşırıq. Yəni üslubiyyatın dilçilik sahəsi olub-olmaması məsələsinin qoyuluşu dəqiq deyildir. Çünki üslubiyyat çoxmənalı bir termindir və geniş əhatə dairəsinə malikdir. Dilin üslubları olduğu kimi başqa fəaliyyət sahələrinin də üslubları vardır. Amma bu heç də onların bir elm sahəsi olduğunu şərtləndirmir.

Bəzi tədqiqatçılar isə üslubiyyat elmini bir neçə yerə bölür. V.V.Vinoqradova görə 3 üslubiyyat vardır: 1) dilin üslubiyyatı; 2) nitq üslubiyyatı; 3) bədii ədəbiyyatın üslubiyyatı. Dil üslubiyyatının tarixən dəyişkən əlaqələrini sözlərin, söz birləşmələrinin semantik quruluşunda, leksik və qrammatik sinonimlərdə əks olunan incə məna fərqlərini – ekspressivliyi, intonasiyanın keyfiyyətini, sözlərin cümlədə öz yerinə görə işlənmə variasiyalarını öyrənmək də dil üslubiyyatının vəzifəsidir. Eyni zamanda o göstərir ki, bədii ədəbiyyatın üslubiyyatı ancaq bədii əsərlərin dilini, yazıçının fərdi üslubunu öyrənir.

M.M.Mixaylov dilçilik çərçivəsində üslubiyyatı beş yerə ayırır: 1) ümumi üslubiyyat; 2) xüsusi üslubiyyat; 3) dilin üslubiyyatı; 4) nitq üslubiyyatı; 5) praktik üslubiyyat. O qeyd edir ki, «ümumi üslubiyyat-bütün və ya əksər dillərə aid olan universal məsələləri, xüsusi üslubiyyat isə bu və ya digər konkret dilin üslubi quruluşunu öyrənir. Dilin üslubiyyatı dilin üslubi quruluşunu, yəni üslublar sistemini həm sinxron, yəni üslublar sistemini həm sinxron, həm də diaxron plan da, nitq üslubiyyatı isə nitq üslublarını, yəni əsas janrlar çərçivəsində kompozisiya sistemini, yaxud ictimai nitqin konstruktiv növlərini öyrənir. Praktik üslubiyyat şəraitdən, məzmun və məqsəddən asılı olaraq nitqin rəngarəng imkanlarını, xüsusən nitqin keyfiyyəti məsələlərini araşdırır, nitqdə nəyin yaxşı və nəyin pis olduğunu müəyyənləşdirir (6, 10-11).

Göründüyü kimi, üslubiyyat termininin geniş məzmunlu olması ona olan münasibətlərdə də özünü göstərir. Məlumdur ki, digər elm sahələrində də ədəbiyyatda, musiqidə, təsviri sənətdə və s. sahələrdə də üslub termini işlənir və bu termin müəyyən bir məna ifadə edir. Bu prizmadan baxılsa, təbii ki, üslub linqvistik sahənin sərhədlərinə sığmır. Eyni zamanda, ümumi və xüsusi üslublar da mövcuddur. Üslubiyyatın digər elm sahələri ilə kəsişməsi ona daha geniş məna qazandırmışdır. Amma nəzərdən qaçırmayaq ki, biz ədəbi dilin üslublarını linqvistikaya aid olanını araşdırırıq. Çünki qeyd etdiyimiz kimi, ədəbi dil üslublarda gerçəkləşir. Amma linqivistik kontekstdə araşdırdığımız üslub da təkcə məlum üslubların təsvirindən ibarət deyil. Burada da xüsusi və ümumi səciyyəli üslublar mövcuddur. İstər şifahi nitqdə, istərsə də yazılı dildə daha çox ədəbiyyatşünaslıq yönümündən araşdırılan fərdi üslublar da vardır. Dilçilikdə bu çox zaman heç nəzərə alınmır. Yalnız hansısa yazıçının dili təhlil olunarkən buna qismən toxunulur. Ədəbiyyatda bir sıra məktəblər mövcud olmuşdur ki, onların dili və üslubu bir sıra səciyyəvi xüsusiyyətlərə malik olmuşdur. Məsələn, «Fyuzat» və ya «Molla Nəsrəddin» kimi jurnalların ətrafında birləşən yazıçıların oxşar üslubları olmuşdur. Amma bununla yanaşı bu məktəblərə daxil olan yazarların hər biri fərdi üslubdan da məhrum olmamışdır.

Üslubiyyat termini haqqında mövcud fikir və mülahizələrin müxtəlifliyi də bir daha təsdiq edir ki, üslubiyyat dilin kifayət qədər geniş bir sahəsidir. Təbii ki, biz linqvistik üslubiyyat prizmasından çıxış edirik. Amma təkcə bu elm sahəsində də üslubiyyat sistemini dəqiqləşdirmək mübahisəli məsələlərdən biridir. Buna görə də üslublardan bəhs edən əsərlərdə müxtəlif bölgülərə, təsnifata və təsnifat prinsiplərinə rast gəlirik.

## Nəticə

Ədəbi dil norması baxımından bu tipli kütləvi üslubların tətbiqində meydana çıxan problemlər, xüsusilə də nitq mədəniyyəti ilə bağlı məsələlərin araşdırılması vacib məsələdir. Üslub adı ilə dildə anlaşılmaz leksik vahidlərin və ya sintaktik konstruksiyaların işlədilməsi yolverilməzdir və ədəbi dil normalarına ziddir. Amma elmi üslubda beynəlxalq səciyyəli terminologiyanın işlənməsi tamamilə normal hadisədir. Çünki ədəbi dildə tənzimlənməsi vacib olan məsələlərdən biri və başlıcası terminologiya problemidir. Publisitik üslubda normadan yayınma yolverilməzdir. Çünki əsas funksiyası məlumatlandırma olan mətbuatın dilinin anlaşılmaması onun funksionallığını məhdudlaşdırır. Əməli üslub da emosionallıq və təfərrüat yersizdir.

## Ədəbiyyat

1. Həsənov H.N. Nitq mədəniyyəti və üslubiyyatının əsasları. Bakı: Bakı Dövlət Universiteti Nəşriyyatı, 2003, 397 s.
2. Новое в зарубежной лингвистике. Сб статей. М.: Прогресс, 1980, 432 с.
3. Пиотровский Р.Г. Очерки по стилистике французского языка. Л.: Издво литературы на иностранном языке, 1960, 166 с.
4. Ахманова О.С. Экстралингвистические и внутрилингвистические факторы в функционировании и развитии языка // Вопросы языкознания, 1963, №4, с. 44-45.
5. Həsənov H.N. Nitq mədəniyyəti və üslubiyyatının əsasları. Bakı: Bakı Dövlət Universiteti Nəşriyyatı, 2003, 397 s.
6. Михайлов М.М. Стилистика русской речи. Чебоксары, 1968.

Göndərilib: 11.02.2021 Qəbul edilib: 18.02.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/37-42

**Gülbəniz Hacıbaba qızı Mehdiyeva**
Bakı Slavyan Universiteti
filologiya üzrə fəlsəfə doktoru, baş müəllim
gulbeniz57@mail.ru

# ALBAN ÖLKƏSİNİN QƏDİM ÇAYLARI (M.KALANKATUKLUNUN "ALBAN TARİXİ" ƏSƏRİ ÜZƏRİNDƏ)

***Açar sözlər:*** *çaylar, morfemlər, coğrafi adlar, müasir areal, hidronimlər, onomastika*

## Ancient rivers of the Albanian country by Musa Kalankatuklu's work "History of Alban"

**Summary**

Most of the onomastic units mentioned in the written monuments of ancient times are valuable sources in terms of studying the past, language, lifestyle, ethnogenesis, ethnography of our people today. While these monuments are important in terms of clarifying historical realities and shedding light on obscure issues, on the other hand, their study is politically important in modern times. At a time when our hated neighbors are looking at our lands and making historical distortions, the study of onomastic units in ancient monuments – toponyms, anthroponyms, oronyms, hydronyms, etc. – can be a convincing answer to baseless fabrications. It should be noted that we come across information and explanations about each of these hydronyms in scientific and historical sources written from ancient times to the present day, and the core of each of them is of Azerbaijani-Turkish origin. The monument involved in the study names countless water bodies associated with the territory of Azerbaijan. They are also very valuable in terms of studying the lexical and semantic development of our language. We come across information and explanations about each of these hydronyms in scientific and historical sources written from ancient times to the present day. One of the hydronyms directly connected with the territory of Azerbaijan in the source is the *Caspian Sea*. Books and articles about the *Caspian Sea* give it different names and etymological-linguistic analysis of the word *Caspian*. Another hydronym mentioned in the source is *Tartar river*. The article provides extensive information about the *Tartar River* in terms of its geographical structure. The hydronym *Tartar* is given in Arabic, Russian, Georgian and ancient Turkic sources with different phonetic structure. The name of the *Urdun River* is mentioned several times in the source.

However, it should be noted that the *Urdun River* flows not in the Albanian country, but in the Middle East, and most of it flows in the territory of modern Jordan. Although the explanation of some of the hydronyms included in the ancient Caucasian Albanian territory in the source is convincing, the exact explanation of many ancient hydronyms still remains controversial. One example of such controversial hydronyms is the *Urdun River*. The last hydronym mentioned in the article is *Goycha* river. Extensive geographical, historical, etymological interpretations and linguistic analysis of the hydronym are given.
***Key words:*** *river, morphemes, geographical names, modern areal, hydronyms, onomastic*

Qədim dövrlərin yazılı abidələrində adları çəkilmiş onomastik vahidlərin əksəriyyətinin bu gün xalqımızın keçmişini, dilini, yaşayış tərzini, etnogenezini, etnoqrafiyasını öyrənmək baxımından qiymətli mənbələrdir. Bu abidələr bir tərəfdən tarixi gerçəkliklərin dəqiqləşdirilməsi, qaranlıq mətləblərin işıqlandırılması baxımından əhəmiyyət kəsb edirsə, digər tərəfdən onların öyrənilməsi müasir dövrdə siyasi baxımdan önəmlidir. Mənfur qonşularımızın torpaqlarımıza göz dikdiyi və tarixi təhriflərə yol verdikləri bir zamanda qədim abidələrdə yer alan onomastik vahidlərin – toponim, antroponim, oronim, hidronim və s. öyrənilməsi əsassız uydurmalara verilən tutarlı cavab ola bilər.

Araşdırmaya cəlb olunmuş abidədə Azərbaycan ərazisi ilə bağlı saysız-hesabsız su obyektlərinin adları çəkilir. Onlar həm də dilimizin leksik-semantik inkişafını öyrənmək baxımdan çox qiymətlidir. Təbii ki, M.Kalankatuklu bu ərazidə olan hidronimlərin mənşəyi, semantikası haqqında məlumat verməyi qarşısında məqsəd qoymamışdır. Müəllif bu coğrafi adları başqa məqsədlə-ticarət əlaqələrini, tarixi münasibət və müharibələri təsvir etmək üçün istifadə etmiş və bu zaman onlar haqqında maraqlı fikirlər irəli sürmüşdür. Qeyd edək ki, bu hidronimlərin hər biri haqqında ta qədim dövrlərdən başlayaraq bu günümüzə qədər yazılmış elmi və tarixi mənbələrdə məlumatlara, izahlara rast gəlirik və onların hər birinin nüvəsi Azərbaycan-türk mənşəli olması tarixi faktdır. "Hər hansı bir dil mənsub olduğu xalqın tarixi, etnik tərkibi, dini-mifik baxışlarını, adət və ənənələrini, ictimai və siyasi əlamətlərini, əsrlər boyu keçib gəldiyi yolu öyrənmək işində çox böyük vasitədir. Hər bir dilin zənginliyi onun lüğət tərkibinin sferası ilə ölçülür. Dilin

lüğət tərkibinin əhatəliyi həmin dilin böyük ideyalar, böyük amallar, fəlsəfi-estetik fikir yaradıcılığından ən böyük vasitə sayıla bilər. Bu mənada dilin lüğət tərkibinin müəyyən bir qismini təşkil edən coğrafi adlar xüsusən toponimlər, hidronimlər cəmiyyət tarixinin öyrənilməsində böyük əhəmiyyət kəsb edir" (2,42)

Mənbədə Azərbaycan ərazisi ilə bilavasitə bağlı olan hidronimlərdən biri Xəzər dənizidir. Mənbədən: "Bu möhtəşəm tikinti üçün onlar inşaatçıları səfərbərliyə alıb çoxlu müxtəlif tikinti vəsaiti daşıtdırdılar və bunlar Qafqaz dağları ilə Şərq (Xəzər) dənizi arasındakı keçidləri bağladılar" (17,155) Xəzər dənizi haqqında yazılmış kitab və məqalələrdən onun müxtəlif adlarla adlanması göstərilir. Xəzər dənizinin bəzən 60, bəzən isə 70-ə yaxın adı qeydə alınmışdır. Bunlardan biri də M.Kalankatuklunun mənbədə Xəzər dənizini Şərq dənizi adlanmasıdır. Xəzər dənizinin adlarının müxtəlifliyi haqqında ən qədim məlumatlara əsasən "Assuriya gil qabları"üzərindəki yazılarda Cənub dənizi kimi rast gəlinir. Hekatey Miletski öz (e.ə.VI əsr) əsərlərində bu dənizi Kaspi və Hirkan kimi adlandırır. Hirkan və Kaspi adları Herodot (Vəsr) tərəfindən də istifadə olunmuşdur. Hirkan sözü farsça "*canavarlar ölkəsi*"mənasında dərk edilir. Qədim yunan tarixçisi, "Tarix" əsərinin müəllifi Herodot Əhəmənilər imperiyasına daxil olan xalqlardan bəhs edərkən Azərbaycanın şimalında Kaspi etnoniminin də adini çəkir.

Əsrlər boyu antiq müəlliflər Xəzər dənizinin adını Coşqun dəniz və Hirkan dənizi adlandırmışlar. Qədim slavyan abidələrində Xəzər dənizi Göydəniz adlandırılmışdır. Xəzər ətrafında yaşayan xalqlar da bu dənizə məxtəlif adlar vermişlər. Məsələn, ruslar — Xvalın, tatarlar — Ağ dəniz, türklər — Kiçik dəniz, çinlilər — Si Hay, tərcümədə Qərb dənizi adlandırmışlar. Bakı dənizi adını birinci dəfə XIII əsrdə Marko Polo işlətmişdir. Venesiya Respublikasının 1474-1477-ci illərdə İrandakı səfiri A.Kontarini də onu Bakı dənizi adlandırmışdır.

Əl – Məsudi (956- cı il) Xəzər və Aralıq dənizlərinin göl olmaları haqqında fikir söyləyən ilk ərəb coğrafiyaşünasıdır(6,59)

Əvvəlcə o, "Kaspi" sözünü Qa-asp, yəni farsca "atların yeri" mənasını verən birləşmə kimi qəbul etmiş, sonra onu türkmən dilinə tərcümə etmiş "At-ili" mənasını almışdır. Bu isə artıq "Atlantida" sözünə yaxın bir sözdür. Buna sübut olaraq İ.İ.Şopen Xəzər dənizində batmış şəhərləri misal gətirir. İ.İ.Şopen belə hesab edirdi ki, xəzərlər - möcüzəli Atlantidanın sakinləridirlər (28,100)

Xəzər dənizinin geoloji quruluşunu öyrənənlərin fikrincə, təxminən 70 milyon il bundan əvvəl indiki Xəzər dənizi, Qara dəniz və Aral dənizi arasındakı sahədə böyük su hövzəsi varmış. Bu su hövzəsi eyni zamanda Atlantik, Hind və Şimal Buzlu okeanları ilə əlaqədar imiş. Sonralar yer səthinin qabarması nəticəsində Alp, Karpat, Balkan, Qafqaz və Kiçik Asiya dağları əmələ gəlmiş, bu hövzənin sahəsi get-gedə azalmışdır. Deməli, belə qənaətə gəlmək olar ki, tarixən bu dəniz okeanlarla əlaqədar olmuş, sonralar müəyyən səbəblər nəticəsində ayrılmışdır. Məlumdur ki, Xəzər dənizi okean və dənizlərlə əlaqəsi olmayan, ən böyük qapalı su hövzəsidir.

Mənbələrdən məlum olur ki, eradan əvvəl V əsrdə Xəzər adı "Kaspi" kimi çəkilir. Bəs bunun səbəbi nədir? Səbəbəbini Abasqulu ağa Bakıxanov "Gülüstani-İrəm" əsərində belə izah etmişdir: "Kaspilər Azərbaycan ərazisində məskən salmış qədim və böyük tayfalardan biridir" (4,50)

Bünyadov Z. yazır: "E.Bore də Xəzər dənizi sahillərində bir Alban şəhərindən və Qafqaz dağlarından axıb Xəzər dənizinə tökülən Albanus çayından bəhs edir" (6,13)

Ə.Dəmirçizadə yazır: "....Əslində, VII əsrin sonlarında məlum olan Xəzər adı ilə Qaspi adı arasında məzmun etibarilə və dil vahidlərinin nisbət dəyərinə görə heç bir fərq yoxdur; çünki hər iki sözün birinci hissəsi qas/xaz şəklində ad bildirildiyi kimi, hər iki sözün ikinci hissəsi də cəm mənası bildirən pi/ar şəkilçilərindən ibarətdir. Bu adların hər ikisini də eyni əsldə və eyni məzmunlu olduğunu, eyni dənizin həm /Kaspi/, həm də/Xəzər/adlanması ilə də izah etmək olar" (9, 30)

Q.Qeybullayev isə bu sözün izahını belə vermişdir: "...Xəzər sözü qədim türk dilində kas etnonimindən və "ər", "igid", "kişi" mənasını verən qədim türk şəkilçilərindən ibarətdir (20,138)

Deməli, bu günə qədər bütün araşdırmaçıların son nəticəsi budur ki, "Xəzər" hidronimi tayfa adı ilə bağlıdır. Kas/xəz tayfanın adı, ar/ər isə "igid", yəni "igid kaslar" deməkdir. Bəxtiyar Tuncay "Qafqaz albanlarının dili və ədəbiyyatı" kitabında ərəb mənbələrində Qəbələ şəhərinin "Xəzər" adlandırılması kimi bir gerçəklikdən bəhs edir (27,25) Deməli, bu günə qədər bütün araşdırmaçıların son nəticəsi budur ki, "Xəzər" hidronimi tayfa adı ilə bağlıdır. Kas/xəz tayfanın adı, ar/ər isə "igid", yəni "igid kaslar" deməkdir.

Ümumiyyətlə, Xəzərin tarixi haqqında qədim dövrdə daha çox yunan müəllifləri (Hekatey, Herodot, Erotosfen, Strabon, Ptolomey və s.) ilk orta əsrlərdə isə yunanların fikirləri ilə tanış olmuş ərəb müəllifləri (Yaqut Həməvi, Zəkəriyyə Qəvzini, Əbül Fida, İstəhri, İdrisi) sonrakı əsrlərdə isə fars, türk, Avropa və rus səyyahları (İ.F.Seymanov, Q.V.Abix, N.N.Andrusov və s.) məlumat vermişlər.

X əsrdə yaşamış Məsudi Xəzərdə üzən rus gəmiləri, Bakıda çıxarılan neft haqqında məlumat vermişdir. Eramızın 900-cü illərində ərəb müəllifləri İstəxri və İdrisi Xəzərin qapalı olduğunu sübut etmişdir. İstəhri

yazırdı: "Hövzeyi-bəhru-əl Xəzərin bir nöqtəsindən çıxıb onun sahili boyu hərəkət etməklə, yenə həmin nöqtəyə qayıtmaq olar" Xəzərin göl olması, qapalı hövzə olması həqiqəti iki min ildən artıq mübahisədən sonra təsdiq edilmişdir.

**Tərtər** – "Sonra onlar yerlərini dəyişib düşərgələrini Tərtər çayının sahilində Divtakan kəndinin yanında saldılar" (17, 90)

Bərdə VI əsrdən başlayaraq Arranın (Qafqaz Albaniyası) əsas şəhəri, paytaxtı olmuşdur. Şəhərin xarabalıqları eyni adlı Azərbaycan şəhəri Bərdənin yaxınlığında, **Tərtər** çayının Kürə qovuşduğu yerdə yerləşir (24, 116)

Q.Qeybullayev Tərtər çayı haqqında belə yazmışdır: "VII əsrdə Arsakda baş verən hadisələrlə əlaqədar (qədim erməni dilində Trtuqet) "Tərtər çayı"nın adı çəkilir" (21,37)

XIII əsrdə isə Yaqut əl-Həmavi Arranda iki Tərtər çayının olduğunu (o, bu çayı Turtur adlandırır, yəni Böyük və Kiçik Turtur) qeyd edir (7, 22)

Çayın adı Balazaruninin əsərində Trtur, İbn-əl-Əsirin əsərində **Sərsur** fonetik tərkibində olmuşdur. Əhməd bəy Cəfərqulu bəy oğlunun 1906 -cı ildə Tiflisdə "Qeyrət" mətbəəsində çap etdirdiyi "Asari-Əhməd bəy" əsərində yazmışdır: "tərtər"i şərqi - türk tayfalarından biri kimi qəbul etmək lazımdır (12,46)

"Qədim rus əlyazmalarında cənubi rus düzənliklirinin sakinləri olan qıpçaqların arasında tərtər etnonimindən əmələ gələn *tertrobçi* sözü, tərtər, oba və içi patrionomik (... öz dövrünə görə məhsuldar olan "içi" şəkilçisindən) ibarətdir" (3,129)

Artıq VII əsrə qədər qıpqaçların və tərtərlərin Albaniyada məskunlaşması tarixdən məlumdur (23,123)

Tərtər çayının eramızdan əvvəl mövcud olması antik dövr müəlliflərinin əsərlərindən məlum olur. Bu etnonimin adı Trtu formasında VII əsrdən məlumdur. Deməli, Tərtər çay adı kimi verilməzdən əvvəl türk tayfalarının birinin adı olmuşdur. Tərtərlilər tayfasının başqa bir hissəsi isə Səfəvi şahlarının dövründə yenidən Azərbaycana qayıtmışdır. Azərbaycan tarixində tərtərlilər bəzən qıpçaq adı ilə də göstərilir. Ancaq tərtərlilər bir türk tayfası olub qıpçaqlarla birləşmişlər. Onlar Tərtər çayının sahilində yaşamışlar. Buna əsasən belə nəticəyə gəlmək olar ki, tərtərlərin müəyyən hissəsinin Azərbaycana gəlməsi, eranın ilk əsrlərində Şimali Qafqazda hakim mövqe tutmuş, hunlarla əlaqədardır. Bunu eranın II əsrində Qafqazda Tərtər adlı bir yer adının olması haqqında Plutarxa aid edilən mənbədəki məlumat da təsdiq edir (20,258)

Aristov Y.L. yazırdı: III əsrdə qıpçaqlar artıq hunların tərkibində idilər (3,209)

Ehtimal ki, onlar (tərtərlər - qıpçaqlar) bu əraziyə (Azərbaycan) hunların tərkibində daxil olublar. Məşhur rus türkoloqu A.N.Baskakovun yazdığına görə, ilk orta əsrlərdə cənubi rus çöllərində yaşamış qıpçaqlar VI-VII əsrlərdə geniş bir ərazini əhatə etmiş və cənub - qərb sərhədləri Dərbəndə qədər uzanmış, Qərbi türk xaqanlığının əsas kütləsini təşkil etmişlər. Qərbi türk xaqanlığı eramızın ilk əsrlərində cənub - şərqi Avropa və cənubi rus çöllərində mövcud olmuş Hun imperiyası əsasında yaranmışdır (5,81) Qədim, mötəbər gürcü mənbələrində "qədim qıpçaqlar" haqqında bəhs olunur. (18,156) Qeyd etmək istəyirik ki, bir çox Azərbaycan etnotoponimləri cənubi rus çöllərində yaşamış məşhur qıpçaq tayfalarının-Qarabərk, Tuq, Urus, Xuç adlarından yaranmışdır. Bu adlar Qarabərklu, Tuğ, Cücənli, Aruz və Xuç toponimlərində öz əksini tapmışdır (28, 22) Qədim türk lüğətinin 539-cu səhifəsində **Tartar** sözü çox böyük olmayan quş mənasında verilmişdir. Mahmud Kaşğaridə də "**Tartar** qumruya bənzər bir quş" anlamında verilmişdir. Mahmud Kaşğari I cild (19,467)

Cənubi Uralda Tərtəroba adlı yaşayış məskəni olmuş və indi də qalmaqdadır.

B.Əhmədovda *tər* morfemi "sərin", "tərli" kimi qeyd edilir (11,237)

Nəbi Əsgərovun "Areal türk onomastik vahidlərinin linqvistik xüsusiyyətləri" əsərində isə Tərtər hidronimi ilə bağlı olan xalq əfsanəsinə əsasən "sərin", "tərli" kimi qeyd edilir. Əfsanəyə görə "...qəhrəman qılıncını necə endirirsə, qaya parça-parça olur. Ara torpaqları dinə-imana gəlir. Bu zaman qəhrəmanın alnından iki damcı tər çaya düşüb suya qarışır. Bu hünərin tamaşasına yığışanlar çayın adını həmin damcılardan quraşdırıblar: tərtər, yəni iki damcı tər" deməkdir (13,237)

Lakin bu sadəcə əfsanədir. Mötəbər mənbələrdən gətirdiyimiz dəlillər, istərsə də alimlərin araşdırmaları bizə əsas verir ki, Azərbaycan ərazisində yaşamış ən qədim tayfalardan birinin adı Tərtər və bu adı uzun illər yaşadan Tərtər çayı olmuşdur.

Ərəb mənbələrində Tərtər "Sursur" kimi yazılmışdır. Tarixdə Sur-sur adı ilə qeyd olunan tayfa Nadir şahın əmri ilə Dərbəndə köçürülmüşdür.

Tayfanın Azərbaycanda qalan digər hissəsi isə özlərinə ərəb ləhcəsilə "Sursur" yox, Tərtər demişlər (24,136)

Apardığımız araşdırmalardan belə qənaətə gəlirik ki, eramızın II əsrində Tərtər adlı bir qıpcaq tayfası olmuş və bu tayfa Tərtər çayının sahilində yaşamışdır. Çayın adı Balazarinin əsərində Trtur, İbn-əl-Əsirin əsərində Sərsur formasındadır. Məşhur rus türkoloqu A.N.Baskakovun yazdığına görə, ilk orta əsrlərdə

cənubi rus çöllərində yaşamış qıpçaqlar VI-VII əsrlərdə geniş bir ərazini əhatə etmiş və cənub-qərb sərhədləri Dərbəndə qədər uzanmış, Qərbi türk xaqanlığının əsas kütləsini təşkil etmişlər. Qərbi türk xaqanlığı eramızın ilk əsrlərində cənub - şərqi Avropa və cənubi rus çöllərində mövcud olmuş Hun imperiyası əsasında yaranmışdır (5,81)

Buna əsasən belə nəticəyə gəlmək olar ki, tərtərlərin müəyyən hissəsinin Azərbaycana gəlməsi, eranın ilk əsrlərində Şimali Qafqazda hakim mövqe tutmuş, hunlarla əlaqədardır. Bunu eranın II əsrində Qafqazda Tərtər adlı bir yer adının olması haqqında Plutarxa aid edilən mənbədəki məlumat da təsdiq edir (21,258)

B.Əhmədovda *tər* morfemi "sərin", "tərli" kimi qeyd edilir (11,237)

Nəbi Əsgərovun "Areal türk onomastik vahidlərinin linqvistik xüsusiyyətləri" əsərində isə Tərtər hidronimi ilə bağlı olan xalq əfsanəsinə əsasən "sərin", "tərli" kimi qeyd edilir. Əfsanəyə görə "...qəhrəman qılıncını necə endirirsə, qaya parça-parça olur. Ara torpaqları dinə-imana gəlir. Bu zaman qəhrəmanın alnından iki damcı tər çaya düşüb suya qarışır. Bu hünərin tamaşasına yığışanlar çayın adını həmin damcılardan quraşdırıblar: tərtər, yəni iki damcı tər" deməkdir (13,237)

Əfsanəyə görə "...qəhrəman qılıncını necə endirirsə, qaya parça-parça olur. Ara torpaqları dinə - imana gəlir. Bu zaman qəhrəmanın alnından iki damcı tər çaya düşüb suya qarışır. Bu hünərin tamaşasına yığışanlar çayın adını həmin damcılardan quraşdırıblar: tərtər, yəni iki damcı tər deməkdir" (12,16)

Lakin bu fikir o qədər də inandırıcı deyil. Çünki istər mənbələrdən gətirdiyimiz dəlillər, istərsə də alimlərimizin müasir araşdırmaları bizə deməyə əsas verir ki, Tərtər Azərbaycan ərazisində yaşamış ən qədim tayfalardan biridir və onu uzun illər yaşadan Tərtər çayıdır.

***Urdun*** – "Oradan *Urdun* çayı, Hor və bir neçə vilayət görünür" (17,173) Yaxud belə bir nümunə: "O, *Urdun* çayıdır ki, onun sularına xilaskarımızın xaçı salınıb, Qüds şəhərindən şərqə beş fərsəng aralıdır" (17,173) *Urdun* çayının adı mənbədə bir neçə dəfə çəkilir. Lakin qeyd edək ki, *Urdun* çayı Alban ölkəsində deyil, Yaxın Şərqdə, böyük hissəsi isə müasir İordaniyanın ərazisində axır. Çayın adı ərəbcə əl-*Urdun,* ivritcə *yarden* (ivritcə feildir, "düşmək, enmək" mənasındadır) kimi səslənir. (15,143) bu fikri A.Relandom tərəfindən təqdim olunub. (16,s.143) Bu etimologiya müasir alimlərdən Pentyuk tərəfindən dəstəklənib (25, 86-87)

Bəzi alimlər sübut etməyə çalışırlar ki, çayın adı hind-avropa kökənlidir. Fars sözü olan *yar* "il", *dan* isə tərcümədə "çay" mənasındadır. Yəni, yalnız yağmurlu fəsillərdə deyil, bütün il boyu axan çay anlamında dərk edilir. *Urdun* çayı Müqəddəs torpaqlarda axan və Fələstini iki hissəyə bölən, ən məhsuldar dörd çaydan biri kimi tanınır.

Q.Qeybullayev *Urdu* toponiminin izahını belə vermişdir: "*Urdu* (Arsakda məntəqə adı) Türkcə *ordu* — xan yurdu, — xan düşərgəsi sözündəndir (20,144) Deməli, belə məlum olur ki, *Urdun* çayı Albaniya torpağından xaricdə yerləşirmiş. 1986-cı ildə çap olunan və 772 səhifədən ibarət olan Qısa Yəhudi Ensklopediyasının III tomunun 769 -cu səhifəsində *Urdun* haqqında belə məlumat verilmişdir: "*Urdun/Əl Urdun İordan* sözünün ərəb variantıdır. İordan / Əl Urdun çayı bulanıq sulu kiçik çaydır. Əl Urdun çayı İordaniyanı Qüdsdən ayırır və Ölü dənizə tökülür. Vatikan XXI əsrdə rəsmi olaraq bu yeri İsanın xaç suyuna çəkildiyi yer kimi qiymətləndirir. Rəvayətə görə bu çaya baş vuran kəs bir çox xəstəliklərdən qurtula bilər". Yekun olaraq deyə bilərik ki, müraciət etdiyimiz mənbədəki qədim Qafqaz Albaniyası ərazisinə daxil olan hidronimlərin bəzilərinin izahı inandırıcı olmasına baxmayaraq, bir çox qədim hidronimlərin dəqiq izahının verilməsi hələ də mübahisəli olaraq qalır. Məsələn, XV əsrin əvvəlində yazılmış "Abidələrin xülasəsi və qüdrətli hökmdarın möcüzələri"adlı əsər, müəllifi bakılı olan Əbdürrəşid əl-Bakuvinin yeganə məşhur əsəridir. Əsərin 35-ci səhifəsində vilayət kimi qeyd edilir: "*Urdun* – Ğutadan qərbdə yerləşən Şamın bir vilayətidir. Mərkəzi - Təbəriyədir..." (1,35)

Qrammatik mənasına görə yəhudi feili **yarad** ilə əlaqələndirilən *Urdun* sözü ivritcə tərcümədə *düşmək, enmək* mənasındadır. Urdun sözü şifahi nitqdə isə **"yarden"** kimi tələffüz olunur. Mübahisəli mənşəyə malik olan "**yarden"** sözünü həm Semit, həm də Hind-Avropa dilləri ilə bağlayırlar(15,56)

Bu mülahizənin elmi olması hələ şübhə altındadır. Lakin bu etimologiyanın müəllifləri Akkad dilinə əsaslanan E.Pentyuk tərəfindən dəstəklənmişlər (25,87)

Urdun hidroniminin XII-XIV əsrlərə aid Emar mənbələrində təsadüf olunur. Bəzi alimlər bu sözün izahını farsca şərh edirlər. Qədim farsca yar – il, don/dan morfemi isə (qədim farsca danav-çay mənasında) deməkdir. Sözün etimologiyası belədir:Yəni "il boyu daim axar çay" mənasında dərk edilir.

**Göyçə gölü -** Mənbədən – "Orada o, Alban ordusunu yanına dəvət etdi onlar da Göycə (Sevan) gölünün sahilinə gəldilər" (17,20) «Ondan Şərukun ucundan Göyçə dənizinə təki el çarpdı» - bu nümunə «Kitabi-Dədə Qorqud» dastanlarından çəkilmişdir (14,134) Ümumiyyətlə, müxtəlif illərdə çap olunan «Kitabi-Dədə Qorqud» dastanlarında Göycə gölünün adı Göycə dəniz Gökcə dəniz formalarında qeyd edilmişdir. Mürəkkəb söz olan Göyçay morfeminin ikinci komponenti çay sözünün "çə" şəklinə qısaldılmış,

şəkilçiləşmiş formasına düşməsi yaxud da son samitin ixtisar olunması nəticəsində yaranmış törəmə söz olan Göyçə kök morfemi əmələ gəlmişdir. Göyçay/Göycə/Göyçə sözü tarixi inkişaf prosesində bu şəkildə dəyişmişdir.

Göyçə sözünün etimologiyasına gəldikdə isə *göy* kök morfemi gölün bu suyunun dumduru, təmiz olması mənasında dərk edilir. XIX əsrdə indiki Ermənistan ərazisi çar Rusiyası tərəfindən işğal edildikdən sonra ermənilər öz məkrli niyyətlərini həyata keçirmiş, Göyçə gölünün adını dəyişdirib albanlar tərəfindən qara daşdan tikilmiş kilsəyə uyğun olaraq Sevvank (yəni Qarakilsə) qoymuşlar. Rus imperiyası Göyçə mahalnı zəbt etdikdən sonra sev (qara), vank (kilsə) sözü də eroziyaya uğramış, ortadakı iki «v» hərfi bir hərf kimi tələffüz olunmuş, sondakı «k» hərfi isə düşmüşdür. Beləliklə, «Sevank» əvəzinə «Sevan» sözü yaranmışdır (29, 157) Göyçə gölünün Sevan adlandırılması və indiyə qədər də bütün dünyaya Sevan adı ilə tanıdılması tarixə vurulmuş qara ləkədir. Göyçəgölü - İrəvan xanlığının Göyçə mahalında, İrəvan quberniyasının Yeni Bayazid qəzasında göldür. İrəvana aid olan Göycə mahalı tarixən Alban ərazisində yerləşmişdir. M.Kalankatuklu II əsrə aid hadisələrdən bəhs edərkən yazır ki, "Artaşes paytaxtında Alban ordularını yanına dəvət edir, onlarla Göycə gölünün sahilinə gəlir və onların köməyilə Yervandı qovub Ərməniyəni işğal edir" – Qeyd etmək istəyirik ki, nümunə gətirdiyimiz bu sitat, əlbəttə, keşiş babaların əsərə müdaxiləsindən sonra bu şəklə düşmüşdür. Sevan gölünün adı Urartu dilindən erməni dilinə keçmiş sue "su" sözündəndir. Lakin qədim erməni mənbələrində Sevan adına rast gəlinmir. Göyçə gölünün Sevan adlandırılması 1930-cu ilə aiddir. Urartu dilindəki sue "su", erməni dilindəki sov "göl" sözləri ilə türk dillərindəki suv "su" sözünün zahiri oxşarlığı diqqəti cəlb edir. (22,27)

Mənbədəki onomastik vahidlərin çox hissəsi türkün poetik təfəkkürünü yaşadır. Mənbənin onomastik sisteminə üslubi-linqvistik yöndən baxılarsa, türk təfəkkürünün süzgəcindən keçmiş adlarda dərin fəlsəfi - psixoloji məna ilə yanaşı emosionallıq, ekspressivlik, ahəngdarlıq və poetikliyin qaynayıb qarışmış şəkildə olduğu aydınlaşacaqdır.

## Ədəbiyyat


1. Абуль-Касим Убайдаллах ибн Абдаллах Ибн *Хордадбех,* О Книге путей и владений, Пер.с араб. Велиханова Н.М, Изв. АН. Аз.ССР, СИФП, 1976, № 1, с. 63-72.
2. Axundov A. Torpağın köksündə tarixin izləri, Бакы, Gənclik,1983, 135 s.
3. Аристов Я.Л. Заметки об этническом составе тюркских племен и народностей и сведения об их численности. «Живая старина», вып. 3-4. СПб., 1896, 309
4. Bakıxanov A. Gülüstani-İrəm. Azərbaycan SSR Elmlər Akademiyası Nəşriyyatı, Bakı – 2000, 255 s.
5. Баскаков Н.А. Имена собственные гуннов, булгар, хазаров, сабиров и аваров в исторических источниках. -Советская тюркология, 1985, №4, 129с.
6. Bünyadov Z. Azərbaycan tarixi VII-IX əsrlərdə. Bakı, Azərnəşr, 1989, 336 s.
7. Буниятов З.М. Йакут аль-Хамави, Муджам аль-Булдан Сведения об Азербайджане Хамдаллах Казвини Нузхат ал-Кулуб сведения по Азербайджану-Баку,1983.
8. Cəfəroğlu Əhməd, Türk dili tarihi, I, İstanbul, 1970.
9. Dəmirçizadə Ə. 50 söz, Bakı: Gənclik, 1986. 102s.
10. 10.Əliyev M.C, Həsənli F.A, "Coğrafi kəşflərin tarixi və səyyahlar" Bakı - 2009
11. Əhmədov B.A. Azərbaycan dilinin qısa etimoloji lüğəti. Bakı, Mütərcim, 1999, s. 23
12. Əhməd bəy Cavanşir Cəfərqulu bəy oğlu, Qarabağ xanlığının tarixi (1747-ci ildən 1805-ci ilə qədər) Bakı: Azərb. SSR EA-nın nəşriyyatı, 1961, 101 s.
13. Əsgərov N. Areal türk onomastik vahidlərinin linqvistik xüsusiyyətləri, Bakı: Elm, 2005, 484 s.
14. Gökçe Deniz, Dede Korkut kitabı, I, Ankara, 1989, s.225
15. V.Gesenius΄a (Gesenius W.Thesaurus filologicus critus linguae Hebraeae et Chaldaeae Veteris Testsmenti. Lipsiae, 1840. T. 2.P. 626)
16. Хадриани Реланди. Палестина из записей старых иллюстраций *Trajecti* Batavorum, *Издатель - Brodelet, 1714,* 271.
17. Kalankatuklu M. Albaniya tarixi. Müqəddimə, tərcümə, qeyd və şərhlər Z.Bünyadovundr, Bakı: "Elm", 1993, 269 s.
18. Картлис-Цховреба. Том I, Тбилиси, 1955; том II, Тбилиси, 1959 (на грузинском языке) 156 стр.
19. Kaşğari Mahmud və onun "Divanü lüğat it-türk" əsəri, I cild. s.467
20. Qeybullayev Q. Qarabağ etnik və siyasi tarixinə dair. Bakı: Elm, 1990, 248s.
21. Гейбуллаев Г.К.Етногенезу Азербайджанцев (историко-этнографическое исследованием) том 1- Баку: Элм,1991, 552 стр.
22. Qeybullayev Q. Qədim türklər və Ermənistan Azərbaycan Dövlət nəşriyyatı, Bakı-1992, 27s

23. Qeybullayev Q. Azərbaycan türklərinin təşəkkülü tarixindən, Azərbycan Dövlət Nəşriyyatı, Bakı:1994, 248s
24. Orta əsr ərəb mənbələrində Azərbaycan tarixinə aid materiallar, Bakı-2005, 126s
25. Пентюк Э. Дж. Западно-семитский словарь в аккадских текстах из Эмара. Озеро Вайнона, 2001. С. 86-87.
26. Попов Л. Я. Названия народов СССР — Л., 1969.
27. Şahverdiyev B. Tuncay. Qafqaz albanlarının dili və ədəbiyyatı, Bakı: Qanun nəşriyyatı, 2010, 368s
28. Шопен И.И. Новые заметки на древней истории Кавказа и его обитателей. СПб:1866, 505 стр.
29. История Армянского народа (С древнейших времён до наших дней) под редакцией проф. М.Нерсисяна Изд. Ереванского Университета, Ереван-1980, 421с

Göndərilib: 10.02.2021 Qəbul edilib: 17.02.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/43-45

**Günay İsfəndiyar qızı Sadıqova**
Gəncə Dövlət Universiteti
aqrar elmlər üzrə fəlsəfə doktoru
Sgi_bioloq@mail.ru
**İlhamə Əlixan qızı Quliyeva**
Gəncə Dövlət Universiteti
Sgi_bioloq@mail.ru

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ FİZİKİ TƏRBİYƏ, İDMAN, MƏKTƏBƏQƏDƏR HƏRBİ ÇAĞRIŞ VƏ BİOLOGİYA FƏNLƏRİ ARASINDA ƏLAQLƏR

***Açar sözlər**: idman dərsləri, sağlamlıq, anatomiya, tədris prosesi, məktəbdənkənar, maraq, əlverişli şərait, yeni təlim texnologiyalarının tətbiqi, təhsilin keyfiyyəti, ailə, təhsil müəssisələri, orta məktəb, ali təhsil məktəbləri*

## Physical education secondary schools, relations sports, preschool military and biology

**Summary**

Sport not only makes us healthier, but also gives us a sense of self-confidence. In general, we become more energetic with an active lifestyle, which affects the rejuvenation of cells and metabolism. While some people consider sports to be a duty to protect their health, there are also people who believe that sport is a form of entertainment, because there are many sports that do not require much physical effort. There are no barriers to exercise for a person who is really worried about his health. Healthy upbringing of young people, equipping schoolchildren with medical knowledge has not lost its relevance today as the main task of pedagogical staff. Because our independent republic must be governed by healthy, well-developed and ready young people.

By conducting research on the teaching of sports knowledge to students in the teaching of biology, it is to study its content, possibilities, directions, forms and methods, optimal forms of organization, ways and effective work system.

***Key words**: sports lessons, health, anatomy, teaching process, extracurricular, interest, favorable conditions, application of new learning technologies, quality of education, family, educational institutions, secondary schools, universities*

## Giriş

Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə sentyabrın 27-dən başlanan Vətən müharibəsi şanlı qələbə ilə sona çatdı, 44 gün davam edən hərbi əməliyyatlar çərçivəsində Azərbaycan Ordusu işğalçı Ermənistanın 30 il ərzində qurduğu silahlı qüvvələrini darmadağın edərək, böyük zəfərə imza atdı.

Əlbətdəki, bu qələbə heçdə asan olmazdı əgər bizim ordumuzda xidmət edən hərbiçilərimizin hazırlıq gücü zəif olsa idi. Güclü ordu üçün isə yaxşı hazırlıq və xidmətdə olan hərbicilərimizin sağlam olmaları vacib şərtdir. Məhs bu səbəbdəndir ki, təhsil müəssisələrində idman dərslərinə xüsusi yer ayrılır. Əsasən də, orta məktəblərdə bu daha diqqətə alınmalı bir mövzudur.

Sağlam yaşamağın əsas şərtlərindən biri idman bilik və bacarıqlarına yiyələnməkdir. İxtisasından, peşəsindən asılı olmayaraq hamının idman bilikləri əldə etməsi zəruridir. Bu işi yalnız və yalnız ümumtəhsil məktəbləri müvəffəqiyyətlə həyata keçirə bilər. Problemin orta ümumtəhsil məktəblərində fənlərin tədrisi prosesində həll edilməsi mümkündür. Orta ümumtəhsil fənlərinin məzmununda sağlamlığın vacibliyi və öyrədilməsi imkanları mövcuddur. Biologiyanın məzmununda isə imkanlar daha genişdir.

Orta məktəblərdə hər bir dərs müassir üsullarla təşkil olunub şagirdlərin marağına çevrildiyi kimi idman dərsləri də maraqla təşkil olunmalıdır ki, dərslərə şagirdi cəlb etmək mümkün olsun. Bunun üçün də hər bir təhsil rəhbərliyi buna xüsusi fikir verməlidir.

Elə bu səbəbdəndir ki, 2003-cü ildən başlayaraq, yəni son 10-15 ildən də artıq müddətdə Azərbaycanda 3000-dən çox ümumtəhsil məktəbi yenidən tikilib və ya əsaslı təmir edilib. Bu da o deməkdir ki, ən azı, 3000 məktəbin idman zalı fəaliyyət göstərir, yaxud da onların idman meydançaları yenidən qurulub, burada idman infrastrukturu ilə bağlı hər hansı iş görülüb. Azərbaycanın elə ümumtəhsil məktəbləri var ki, onların idman infrastrukturu ən müasir səviyyədədir. Şagirdlər onlardan istifadə edirlər. Belə məktəblərdə hətta yüksək səviyyəli yarışlar da keçirə bilərlər.

Azərbaycanın müstəqilliyi dövründə, xüsusilə son 10-15 il ərzində Azərbaycanda məktəb binalarının tikilməsi və yenidənqurulması zamanı idman infrastrukturunun qurulması nəzərə alınır. İdman infrastrukturunun yaradılması gələcəkdə məktəblərin təmiri zamanı da nəzərə alınacaq və təhsil sistemində idman infrastrukturuna diqqətin göstərilməsi siyasəti davam etdiriləcək.

Orta məktəblərdə fiziki hazırlıq yalnız idman zallarında deyil, həm də mövsümdən asılı olaraq, məktəblərin həyətlərində, stadionlarında keçirilə bilər. Hazırda da fiziki tərbiyə dərslərinin keçirilməsi üçün məktəblərin həyətlərindən və bu ərazilərdəki qurğulardan istifadə edilir.

## Material və metod

Biologiyanın tədrisində şagirdlərə idman biliklərin öyrədilməsinə dair tədqiqat aparmaqla, onun məzmununu, imkanlarını, istiqamətlərini, forma və metodlarını, optimal təşkil formalarını, yollarını və səmərəli iş sistemini tədqiq etməkdir. Hazırlanmış iş sisteminin şagirdlərin təlim keyfiyyətinə, onlarda hərbi bilik və bacarıqların formalaşmasına müsbət təsirini üzə çıxarmaqla problemin həllinə xidmət edəcək əsərlər yazmaq pedaqoji ictimaiyyətə çatdırmaqdır.

Biologiya elminin idman ilə əlaqəsi çoxdan məlumdur. Biologiya həyat, canlılar haqqında elmdirsə, məktəbəqədər fiziki hazırlıq bir növ insan sağlamlığı və onun qorunmasından bəhs edir. Insanların sağlamlığında canlıların rolu çox böyükdür. Ona görə də bu elmləri sıx əlaqədə öyrənmək zəruridir. Buradan da aydın görünür ki, biologiya və məktəbəqədər fiziki hazırlıq biri-birinə çox yaxın qarşılıqlı əlaqədə olan, daha doğrusu, biri-digərinin problemlərinin həllinə kömək edən elmlərdir. Onların əlaqə imkanlarından çox geniş yazmaq olar. Orta və ali məktəblərdə tədris edilən biologiya kurslarının məktəbəqədər fiziki hazırlıq elmi ilə əlaqə imkanlarının açılması daha düzgün olar.

## Analiz

Gənclərin sağlam tərbiyə olunması, məktəblilərin fiziki tərbiyyəvi biliklərlə silahlandırılması pedaqoji kollektivlərin əsas vəzifəsi kimi bu gün öz aktuallığını itirməmişdir. Çünki müstəqil respublikamızı sağlam, hərtərəfli inkişaf etmiş, həyata hazır gənclər idarə etməlidirlər. Sağlam yaşamağın əsas şərtlərindən biri isə tibbi biliklərə yiyələnməkdir. Hərbi və idman ixtisasından, peşəsindən asılı olmayaraq hamının öyrənməsi zəruridir. Həyata tam hazır, sağlam gəncliyin yetişdirilməsi fənlərin tədrisi prosesində həyata keçirilməlidir. Tədrisi elə qurmaq lazımdır ki, hər bir məktəbli hərbi və idman sahəsinə aid olan biliklərə yiyələnərək sağlamlığı qayğısına qalmağı bacarsın və firavan həyat sürsün. Problemin məktəblərdə yüksək səviyyədə həllində müəllimlərin tibbi təhsilə malik olmasının, tədris işinin müasir tələblərini, onun nəzəriyyə, metodika və praktikasını yaxşı bilməsinin əhəmiyyəti böyükdür.

Biologiyanın tədrisində tibbi-gigiyenik biliklərin öyrədilməsində əsas məqsəd uşaq və gəncləri tibbi biliklərlə silahlandırmaq, sağlamlığının qorunması, yarana biləcək problemlərin qarşısının alınması, sağlam həyat tərzi keçirmələri, reproduktiv sağlamlığa əmin olması, həyatda, sağlamlıqda baş verə biləcək təhlükələri, riskləri qabaqcadan görməsi və onlara qarşı mübarizəyə hazır olması, zərərli vərdişlərdən uzaqlaşması kimi bilik, bacarıq, vərdişlərə yiyələndirməkdir.

Bədən tərbiyəsi və idmanın inkişafına göstərilən dövlət qayğısı uşaq, yeniyetmə və gənclərin təkcə idman ocaqlarında deyil, ailələrdə də bu qayğını hiss etməsinə zəmin yaradıb. Ailə şəraitində uşaqların fiziki tərbiyəsinin təşkili məsələləri müxtəlif sosial, psixoloji, fizioloji və digər amillərlə şərtlənir. Ailədə uşaqların fiziki tərbiyə məsələlərinin müvəffəqiyyətli həlli tərbiyə prosesinin təşkilindən və imkanlarından, şərait və vasitələrdən səmərəli şəkildə istifadə olunmasından asılıdır.Ailədə fiziki tərbiyə ilə bağlı iş planlı surətdə, müntəzəm və məqsədyönlü aparılarsa, onun keyfiyyət və səmərəsi xeyli yüksələr. Ən başlıcası isə, valideynlər fiziki tərbiyənin sağlamlıq və sosial əhəmiyyətini öz övladlarına inandırıcı şəkildə başa salar, uşaqların idmana olan münasibəti xeyli yaxşılaşar. Bu yolla valideyn uşaqda idmana fəal münasibət yarada bilər. Bundan əlavə, ailədəki ümumi əhval-ruhiyyə və fiziki tərbiyə üzrə aparılan əməli işlər qarşıya çıxan bütün çətinlikləri aradan qaldırmağa imkan verər

Ailədə tərbiyə funksiyasını yerinə yetirən zaman valideynlər bədən tərbiyəsi və idmanın təbliğatçılarına çevrilirlər. Bu funksiya valideynlərin fiziki tərbiyə və idmana böyük maraq bəsləyən uşaqların mənəvi və hətta, maddi baxımdan həvəsləndirmələrini nəzərdə tutur. Hər bir uşaq idmanın bu və ya digər növünə yararlı olub-olmaması baxımından, özünəməxsus xüsusiyyətlərə malikdir. Ona görə də valideyn bədən tərbiyəsi müəllimi və məşqçinin köməyi ilə övladının bu və ya digər idman növündə qabiliyyətini müəyyən etməlidir. Təcrübə göstərir ki, uşağın qabiliyyətinin hansı səviyyədə olması ilə bağlı dəqiq məlumat toplamaq üçün üç metoddan (anket sorğusu, müsahibə və müşahidə) ən münasibi müşahidə və müsahibədir.

## Nəticə və təkliflər

Hər bir idman dərsində əslində müəllim hansısa hərəkətin necə olması haqqında məlumat verir, amma bunu biologiya fənnində uşaqlara çatdırmaq daha məqsədə uyğundur. Cünki dərs əsnasında idmanın onları sağlam saxlayaçağına əmin etmək lazımdır. Pedaqoji praktika zamanı təhlkim olunduğumuz çox orta məktəbdə idman dərslərinin sona salındığından uşaqlarda o dərsə marağın olmadın gördük. Maraqlı bir üsul seçmək qərarına gəldik. Belə ki, idman üzrə və biologiya üzrə praktikaya gələn uşaqlarla birgə oncə o günə olan biologiya dərsinə daxil olub həm biologiya həm idman haqqında məlumat verdik. Hətda idmana getməyənlə idmana gedənin nəbzini yoxlayıb hansının daha sağlam olduğunu onlara anladıb maraq yaratdıq. Sonra isə son dərs olan idmana gedəndə keçdiyimiz dərsin yüksək nəticəsin gördük məktəb şagirdləri nəyinki dərsdə iştirak etmək hətda müəllimlərindən bir azda artıq məşğul olmaqlarını istədiklərinin şahidi olduq.

İdman bizi nəinki sağlamlaşdırır, həm də özünə inam hissi verir. Ümumiyyətlə biz aktiv bir həyat tərzi ilə daha enerjili oluruq ki, bu da hüceyrələrin cavanlaşmasına və metabolizmaya təsir göstərir. Bəzi insanlar idmanı sağlamlıqlarını qorumaq üçün vəzifə, bir borc hesab edirsə, idmanın bir əyləncə növü olduğuna inanan insanlar da var, çünki çox böyük fiziki səy tələb etməyən xeyli idman növü var. Həqiqətən sağlamlığından narahat olan bir insan üçün idman etmək üçün heç bir maneə yoxdur.

Böyük rus alimi Pavlov deyirdi:"Təbiətin ən ali məhsulu olan insan ən mürəkkəb və ən zərif sistemdir. Lakin təbiətin sərvətindən istifadə etmək üçün insan sağlam, qüvvətli və ağıllı olmalıdır. Bunun üçün də mütəmadi olaraq idmanla məşğul olmalıdır"

Biologiyanın tədrisində şagirdlərə idman biliklərin öyrədilməsinə dair tədqiqat aparmaqla, onun məzmununu, imkanlarını, istiqamətlərini, forma və metodlarını, optimal təşkil formalarını, yollarını və səmərəli iş sistemini tədqiq etməkdir. İdman zədələrinin epidemilogiyasını anlatmaq uşaqlar üçün vacib sayılır. Onlar belədir. Məsələn

1.Diz və topuq zədələri, idman zədələrinin dörddə birindən çoxunu təşkil edir. Bel-kürək zədələri həm kişilərdə, həm də qadınlarda rast gəlinir.

2. Ən çox rastlanan xroniki şikayət, oynaq zədəsinin yaralanmadan sonrakı osteoartritdir..

3. Gündəlik və rekreasiya məşqləri ilə edilən idman növləri təhlükəsizdir.

4. Fitness məşqləri və yarış idman növləri orta hesabla 3.1 xəsarət / 1 000 saat məşq riski daşıyır.

5. Məşq zamanı zədə alma riski qadınlara nisbətən kişilərdə bir qədər yüksəkdir, lakin ağır diz zədələrinin ortaya çıxması qadınlarda kişilərə nisbətən daha yüksəkdir.

6. 15 - 34 yaş arasında olan şəxslərdə yüksək idman zədəsi riski var. Yaşla bir yerdə zədələnmə riski də artır. Kardioloji səbəblərlə əlaqədar olaraq məşq riski irəliləyən yaşlarda artır.

7. Yarış və kontaktlı idman növləri adi idmanla müqayisədə daha çox zədə riski daşıyır .

Hər hansı zədə (əzilmə, sınıq, yanıq və s.) almış və ya qəfildən xəstələnmiş şəxsin həyatını xilas etmək və sağlamlığını bərpa etmək üçün ona göstərilmiş ilk həkiməqədər yardımın böyük əhəmiyyəti vardır. Hadisə yerində (işdə, küçədə, evdə və s.) bir sıra sadə tədbirləri yubanmadan həyata keçirməklə ağır fəsadların və xoşagəlməz nəticələrin qarşısını almaq mümkündür. İlk tibbi yardım zədələnmə yerində təcili (15 dəq) göstərilməlidir.

Biologiyanın insan bölməsində hər bir oqan və orqanlar sistemi haqqında dərsin mövzunun yekununda xəstəliklər və ilk yardımlar haqqında məlumat verilir. Bu isə biologiya fənnində idman zamanı necə köməklik etməyin vacibliyini öyrədərək həm dərsi maraqlı etmək olar, həm də ilk yardımı analtmaq olar ki, gələcəkdə şagird və tələbələr özləri və ya kimisə idman zamanı yardım edə bilsinlər.

## Ədəbiyyat

1. Z.V.Muradova, H.M.Hacıyeva. Kimya və biologiyanın əlaqəli tədrisi imkanları (metodik vəsait). Bakı, 2004
2. M.Ş.Babayev, Ə.Hüseynov, Q.Mustafayev və b. "Ümumi biologiya", "Əlfərül" nəşriyyatı (3-cü nəşr), Bakı, 2004
3. M.Ş.Bababayev. "Genetikadan məsələlər (izahlı həlli)", "Nurlan", Bakı, 2004
4. M.Paşayeva. Biologiyanın tədrisində interaktiv təlim üsullarından istifadə metodikası (metodik tövsiyə). Bakı, 2003
5. M.Talıbova. İdmanın təbliğində kitabxanaların iştirakı. Bakı, 2013
6. Ə.Ağayev. Pedaqoji fikrimiz: dünənimiz, bu günümüz. "Elm" nəşriyyatı, Bakı, 2000
7. Firat Hüseyinov. Fiziki tərbiyyə. Dərslik. Bakı, 2017

Göndərilib: 15.03.2021 Qəbul edilib: 23.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/46-50

**Rahilə Mirzəli qızı Məmmədova**
Mingəçevir Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
rahile.mamedova.1959@mil.ru

# MƏKTƏBLİLƏRIN MÜTALİƏ VƏRDİŞLƏRİNİN QAZANILMASINA AİLƏ VƏ MÜHİTİN TƏSİRİ

Kitab elə bir zəmidir ki, ondan hamı yesə də qurtarmaz
**Nizami Gəncəvi**

***Açar sözlər:*** *ailə, mühit, məktəbli, mütaliə, mütaliə vərdişləri*

**The effect of family and environment on the students' acquisition of reading habits**
**Summary**

Reading plays an important role in the development of everyone as a person. Thus, through reading, people can further increase their worldview, life experience, morality, knowledge and skills, and the ability to speak. It is important for an individual to understand himself, his surroundings and the world, and to acquire the habit of reading. The child sees the world in the family, so the environment in which the child is first brought up is the family and parents. Since families are the first collective to influence the mental and physical development of children, their spiritual, cultural and moral qualities are also formed here for the first time. Along with all this, the child's acquisition of reading skills is closely related, first of all, to the efforts of teachers and the media, followed by the family. Since fiction books also give children a broader understanding of the world, they can be linked to a variety of topics in textbooks.
***Keywords****: family, environment, student, reading, reading habits*

Hər bir insanın şəxsiyyət kimi yetişib formalaşmasında mütaliənin böyük rolu vardır. Belə ki, insanlar mütaliə vasitəsilə öz dünyagörüşünü, həyat təcrübəsini, mənəviyyatını, bilik və bacarığını, nitq qabiliyyətini daha da artıra bilir. Fərdin özünü, ətrafını və dünyanı düzgün şəkildə qavrayıb, oxuma vərdişi qazanması mühüm əhəmiyyət kəsb edir.

İnsanlar müxtəlif səbəblərdən bilik, savad meylində olurlar. Bəzi insanlar mütaliəyə qazanılmış bir vərdiş kimi zaman ayırarkən, bəziləri məsuliyyət hissi ilə, bəziləri də müxtəlif ehtiyaclarını aradan qaldırmaq məqsədilə vaxt ayırırlar. Məlumdur ki, oxuma vərdişinin qazanılmasında ailə, məktəb və ətraf mühit kimi üç əsas amil olduqca təsirlidir. Mütaliə vərdişinin qazanılmasında ən təsirli dövr uşaqlıq dövrüdür, çünki erkən yaşlarda əldə edilmiş oxuma vərdişi uşağın inkişafında əsaslı rol oynayacaq və o, həyatının sonrakı dönəmlərində olduqca mühüm üstünlüklər əldə edəcəkdir. İstər valideynlərin, istərsə də müəllimlərin əsas məqsədi gələcəyimizin təminatı hesab edilən övladlarımızın gələcək həyatına yeni-yeni dəyərlər gətirmək, günü-gündən dəyişən və inkişaf edən rəngarəng dünyamızda onların mütaliə aləmini zənginləşdirərək dünyagörüşünü artırmaq, müxtəlif yeniliklərə qarşı onların daha da savadlı və zəkalı böyüməsinə təkan vermək olmalıdır.

Ailə mürəkkəb insan münasibətləri aləmi olduğundan bu aləmdə böyük bir mərifət, qanacaq, nəzakət, həssaslıq, şəxsiyyətin ləyaqət və mənafeyinə dərin hörmət və ehtiram hissi bəsləmək olduqca vacibdir.

"Ailə tarixən ən mühüm tərbiyə ocağı olub və olacaqdır. Burada ilk tərbiyəçi və tərbiyənin memarları isə valideynlərdir. Uşaqlar məktəbə gedənə qədər ailədə tərbiyə alır, lakin onlar məktəbəqədər müəssisəyə getsələr də, birinci yerdə yenə ailə tərbiyəsi dayanır. İllər keçdikcə ailə tərbiyəsi ictimai tərbiyə ilə qovuşmalı, ailədə valideynlər tərəfindən başlanılan tərbiyəvi işlər məktəbəqədər müəssisədə davam etdirilməlidir" (1, 5).

Xalqımızın gələcəyi sayılan uşaqlar bizə bir əmanətdir, bu əmanətin hərtərəfli şəxsiyyət kimi yetişməsi, gələcək həyat yolunda vüqarla addımlaması, müxtəlif nailiyyətlərə yiyələnməsi ilk növbədə onun düzgün tərbiyəsindən, sonra da təlimindən asılıdır.

Hər bir ailədə valideynlər heç bir bəhanəyə əl atmadan övladlarına qarşı həssas və diqqətli olmalıdır. Onlar övladlarının tərbiyəli, ədalətli, xeyirxah, həssas, uğurlu və namuslu insan kimi həyata qədəm qoyması, layiqli vətəndaş kimi formalaşması üçün əllərindən gələni əsirgəməməlidirlər. Çalışmaq lazımdır ki, cəmiyyətimizin sabahı hesab edilən uşaqların bir şəxsiyyət kimi formalaşmasında, yüksək mənəvi və əxlaqi dəyərlərə nail olmasında həlledici rolu kompüter, internet, televiziya deyil, ata və analar oynasın.

Azərbaycan xalqı mədəni, mənəvi və əxlaqi dəyərlərə yüksək qiymət verir, bu baxımdan, böyüklərimizin və valideynlərin övladlarına təsiri olduqca güclüdür. Buna görə də onlar övladlarının asudə vaxtlarının televiziya

qarşısında keçməsinə göz yummamalıdırlar. Professor Milton Çenin dediyi kimi: "Valideynlər övladlarına daha çox diqqət və qayğı göstərib, onları başa düşməyə çalışmalıdırlar". Əlbəttə, ailədə ananın rolu çox böyük və əvəzolunmazdır, onun sevgisi səmalar qədər əngin, şəfqəti günəş kimi parlaq, səbri dəryalar qədər genişdir (1, 5).

Aydın məsələdir ki, ictimai sərvət olan uşaq ailədə dünyaya göz açır, deməli, uşağın ilkin tərbiyə aldığı mühit ailəsi və valideynləridir. Ailələr uşaqların psixi və fiziki inkişafına təsir edən ilk kollektiv olduğu üçün onların mənəvi, mədəni və əxlaqi keyfiyyətləri də ilk dəfə burada formalaşır. Valideyn öz övladında mənəvi və əxlaqi keyfiyyətləri formalaşdırmaq istəyirsə, bu işə uşağın ilk aylarından başlamalı və fasiləsiz şəkildə davam etdirməlidir. Bütün bunlarla yanaşı uşağın oxuma vərdişinə yiyələnməsi də, ilk növbədə ailənin sonra müəllimlərin və kütləvi informasiya vasitələrinin səyi ilə yaxından bağlıdır. Bu vərdişin qazandırılmasında uşağa oxuma səbri və zövqü aşılamaq, uşağın faydalı məlumatlarla dolu kitabı dərk etməsini təmin etmək vacib məqamlardır. Bir yetkin tərəfindən oxunan və uşaq tərəfindən də rəsmlərinə baxılan kitablar, ana-ata ilə uşaq arasında həm fiziki, həm də emosional yaxınlıq təşkil edir. Burada uşaq həm sevdiyi insanlarla birlikdə vaxt keçirdiyi üçün xoşbəxt olur, həm də kitab vasitəsilə yeni təcrübə əldə etməyə başlayır. Bu proses uşaqda valideynləri ilə vaxt keçirməyə, buna şərait yaradan oxuma prosesinə qarşı sevgi yaratmağa, ətrafında danışılan dilin incəliklərini sezməyə imkan yaradır. Deməli, valideynlərin uşaqlarına kitab oxuması, valideynlə uşağın bağlanma prosesinə də müsbət təsir göstərəcəkdir. Evdə uşaqlarla birlikdə kitab oxuyarkən televizor, kompüter və bütün elektron oyunları bağlayaraq, uşağın kitablarla keyfiyyətli zaman keçirməsi təmin olunmalıdır. Ev şəraitində "mütaliə zamanı" yaradılaraq uşaqla birlikdə xüsusi vaxt keçirmək, valideyn və övlad arasındakı bağı gücləndirmək baxımından da çox əhəmiyyətlidir. Bu, kitaba dəyər verildiyinin mühüm göstəricisidir.

Oxumanın məqsədi, sadəcə, uşaqları məlumatlandırmaq və dünyadan xəbərdar etməklə məhdudlaşmamalıdır. Yaradıcı, yəni orijinal ixtira və yenilik axtaran, problemlərin həll yolunu araşdıran, oxunan mətnin məzmununu yenidən müzakirə edən yaradıcı oxu proseslərinin inkişaf etdirilməsi vacib olmalıdır.

Valideynlər yaradıcı oxuma üçün aşağıdakı tədbirləri görə bilərlər:

▪ Oxuduqları hekayə və ya nağıl ən maraqlı yerindən dayandırılaraq, uşaqlardan bunu tamamlamaları tələb oluna bilər. Sonra kitabın əsli ilə uşaqların söylədikləri müqayisə edilə bilər.

▪ Hekayə və ya kitabdakı qeydlərdən istifadə edilərək, yeni bir hekayə yaratmaq və onu danışmaq üçün cəhd edilə bilər.

▪ Oxunan mətn səhnələşdirilərək tamaşa şəklində göstərilə bilər.

▪ Yazılı mətnlə vizual əlaqələr qurularaq, oxunan hekayə və ya romanın şəklinin çəkilməsi uşaqların mütaliə marağını daha da artıra bilər.

▪ Hazırda bir çox uşaq kitabları vardır ki, seriallar və ya filmlər vasitəsilə televizora ötürülür. Uşaqlara kitabı sevdirmək məsələsində bu mənbələrdən də istifadə edilə bilər.

▪ Uşaq kitabı oxuduqdan sonra kitabın filmə çəkilmiş formasına baxıb kitab ilə film arasındakı fərqi ayırd edə və filmin orijinal mətnə nə dərəcədə yaxın olması barədə fikir mübadiləsi apara bilər.

▪ Bayramlarda, ad günlərində və xüsusi vaxtlarda ən yaxşı hədiyyə kitabdır. Valideynlər xüsusi günlərdə kitab hədiyyə etməyi ənənə halına gətirməlidir.

Oxuma vərdişi təkcə kitab oxumaqla məhdudlaşmır. Qəzet, jurnal və digər nəşrlər də təqib edilməlidir. Uşaq jurnalları maraqlı məzmunları, vizual baxımdan zəngin dizaynları ilə seçilən vəsaitdir. Bu jurnallar forma və məzmun baxımından yaxşı hazırlandıqda, uşaqlar tərəfindən maraqla oxunan mətbu orqana çevrilir.

Uşaq jurnallarının seçimində valideynlərin diqqət yetirəcəyi məqamlar aşağıdakılardır:

• Uşağa təqdim olunacaq jurnal seçilərkən onun oxumağa başlamazdan əvvəl cizgilərlə tanış olduğunu nəzərə alaraq təqdim olunan vizual ünsürlərin gözəl çəkilməsinə və estetik dəyərinin olmasına diqqət yetirilməlidir.

• Çəkilən karikaturalar uşağın yaş səviyyəsinə uyğun olmalıdır.

• Uşağa jurnallar haqqında məlumat verilərkən, onlar üçün xüsusi maraq kəsb edən rəsm çəkmə, musiqi, naxış, əl işi və müxtəlif yaradıcı işlərdə uşaqların inkişafına yardımçı olan məlumatlarla bərabər, oxşar maraqlara sahib uşaqların bir-biri ilə ünsiyyət qurmalarına imkan yaradan layihələr də nəzərdən qaçırılmamalıdır.

Animasiya şəkilləri hərəkətə gətirməklə çəkilən film, canlandırma, oyunlaşdırma deməkdir. Oyunların canlandırılması uşaqların həyatında mühüm yer tutur. Uşaqların xəyal dünyaları və yaradıcılıqları olduqca zəngindir. Bu vəziyyət onların bir-biri ilə və ya öz-özlərinə oynadıqları oyunlarda da əks olunur. Uşaqlar müəllimlik, evcik-evcik, həkimlik, sürücülük kimi oyunlarda həm zəkalarından istifadə edirlər, həm də bu rolları canlandırırlar. Bir qəzet məqaləsi, yaşanmış bir hadisə, bir lətifə və ya Azərbaycan dili dərsliyində verilən maraqlı bir mətn, uşağın yaşayış mühitinə uyğun formada canlandırıla bilər. Bu metodla valideynlər uşağın həyat təcrübələrini zənginləşdirə və uşağın öyrənmə prosesini asanlaşdıra bilər. Səhnəyə qoyulacaq hadisə, vəziyyət və mətnlər seçilərkən, uşaqların maraq və qabiliyyətləri də nəzərə alınmalıdır. Səhnəciklər uşaqların istirahət və əyləncəsinə səbəb olmaqla yanaşı, onların tədris proseslərinə də yardımçı olmalıdır.

Psixoloqlar qeyd edirlər ki, uşaqları kitabla tanış etməzdən əvvəl onları mütləq dinləmə vərdişi ilə tanış etmək xüsusilə vacibdir. Bu vərdişə körpəni ana bətnində olarkən alışdırmaq daha məsləhətlidir. Əgər nəzərə alsaq ki, uşağın eşitmə duyğusu 8 həftəliyindən formalaşmağa başlayır, deməli, bu aydan etibarən uşaqla sözlü kontakta girərkən daha ehtiyatlı davranmaq lazımdır. Hər bir ana hamiləlik ərəfəsində körpəsinə mütləq maraqlı nağıllar danışmalı, bir növ körpəni buna hazırlamalıdır. Pedaqoqların fikrincə, əgər ana hamiləlik ərəfəsində davamlı olaraq körpəsinə nağıl danışıb, daha sonra onu əzizləyərsə, həmin uşaq dünyaya gəldikdən sonra sözəbaxan və idarə edilən olar.

Valideynlər körpəlikdən uşağı gələcək həyata sağlam və düzgün şəkildə istiqamətləndirməlidir. Bildiyimiz kimi, uşağın gözü hələ açılmadan onu nəyə öyrətsək, hansı vərdişə alışdırsaq, elə o cür də davam edəcək, buradakı əsas məsələ ona sadəcə kənardan sonadək nəzarət etməkdir. Psixoloqlar uşaqlarda dinləmə qabiliyyətini formalaşdırmaq üçün analara uşağı yatızdırarkən həmişə layla oxumağı məsləhət görürlər: "Uşaqlarda bu cür dinləmə vərdişini formalaşdırdıqdan sonra onu kitabla birbaşa tanış etmək daha məsləhətlidir" (2, 12).

Layla dövrü bitdikdən sonra uşaqlarda dinləmə mədəniyyətini inkişaf etdirmək üçün onlara iki yaşından etibarən nağıl danışmaq məqsədəuyğundur. Bunun üçün ən yaxşı vaxt, məqam isə yatmazdan öncədir. Psixoloqlar sübut etmişlər ki, düzgün dinləmə qabiliyyəti formalaşan uşaqlar iki yaşından nağıl dinləmək istəyəcəklər, əgər bu qabiliyyət düzgün formalaşmayıbsa, uşaqlarda nağıl eşitmək istəyi olmayacaq, bu isə onların gələcək psixi inkişafına mənfi təsir göstərəcəkdir. Çünki uşaqların idrak fəaliyyətinin, yəni duyğu, qavrayış, yaddaş, diqqət-hafizə, həmçinin, təfəkkür və təxəyyülünün inkişafı üçün nağıl dinləmə və mütaliə çox vacibdir.

Kitab oxumağa başlamağın yaşı yoxdur. Kitab sevgisi uşaqlara körpəlikdən qazandırılır. Bu dövrdə uşaqların kitablarla oynaması, kitabları araşdırması, kitabların şəkillərinə baxması onlar üçün elə kitab oxumaq deməkdir. Kitablar körpə uşaqlar üçün oyun tələblərinə cavab verən oyuncaqlar kimi vizual və linqvistik baxımdan uşağın duyğuları vasitəsilə tanıma və kəşf etmə ehtiyacını qarşılayan vasitələrdir.

Körpənin kitabla ilk tanışlığı bir yaşından etibarən əyani şəkildə mərhələlərlə aparılmalıdır, ancaq bu tanışlığın zamanı və səviyyəsi hər uşağa görə dəyişir. Uşağın kitabla əlaqəsi nə qədər erkən başlasa, bu proses uşaq üçün o qədər faydalı olacaq. İlk mərhələlərdə kitab uşaq üçün əyləncəli oyuncaq kimidir. Valideynlər qısa və az cümlələrdən ibarət, əlvan şəkilli, həmçinin, dözümlü materialdan hazırlanmış kitablar seçməlidir ki, körpə onları vərəqləyərkən cırmaq mümkün olmasın. Şəkilləri böyük və qabarıq səthli kitablar seçilməlidir ki, uşaq əllərini səhifə üzərində gəzdirərkən şəkilləri hiss edə bilsin. Həmçinin, kiçik yaşlardan başlayaraq uşağa hədiyyə olaraq, şəkilli, rəngli jurnallar, kitabçalar almaq məsləhətlidir. Beləliklə də, uşağın gözləri kitablara və oxumağa alışmış olacaq. Bütün bunlarla yanaşı, uşaqlara nağıl danışarkən onların marağını daha çox cəlb etmək üçün aşağıdakıları da yerinə yetirmək olar:

– Uşağın nağıla qulaq asmaq, dinləmə qabiliyyətini formalaşdırmaq üçün nağıl obrazlı şəkildə, personajların dili və xüsusi emosiya ilə oxunmalıdır.

– Heyvanları öz səsləri ilə təqlid etmək, mimika, əl-qol hərəkətlərini göstərməklə uşağın diqqəti bir yerə yönləndirilməlidir.

– Valideynlər uşaqları tez-tez heyvanxanaya aparmalı, ətraf mühitlə, canlı təbiətlə tanış etməlidir ki, onlar ətraf mühiti hiss edə bilsin və nağıllara qulaq asmağa vərdiş etsinlər. Məsələn, ana nağıl danışarkən hər heyvanın adını çəkəndə uşağın fikrini onu heyvanxanada gördüyünə yönləndirə bilər.

– Bütün uşaqlar kağızlarla işləməyi sevirlər, buna görə də mütaliə mədəniyyətini formalaşdırmaq, uşaqda kitaba, dəftərə maraq oyatmaq elə buradan başlamalıdır.

Valideynlərin çoxunu narahat edən məqamlardan biri də övladlarına nağılları və yaxud hekayələri kitabdan oxumağın və ya danışmağın hansının daha doğru olmasıdır. Psixoloqlar hər iki metoddan istifadə etməyi məsləhət görürlər: "Uşaqlara nağıl danışmaq onlarda emosional sferanın inkişafına kömək edəcək, lakin nağılı danışarkən oradakı personajları əldən gəldiyi qədər təqlid etmək lazımdır. Bununla da, nağılı uşaqlara sevdirəcəksiniz. Daha sonra nağılın kitabdan oxunması uşaqlarda sevdiyi nağılın fonunda kitabı sevməyi öyrədəcəkdir. Uşağa birbaşa kitabı sevdirməyə çalışmaq məsləhət deyil" (2, 14).

Uşaqlara kitab seçərkən onların yaşı mütləq nəzərə alınmalıdır, əgər seçilən kitab uşağın yaş dövrünə uyğun olmazsa, uşaq həmin kitabdan zövq ala bilməyəcək və kitaba olan marağı azalacaqdır. İki-üç yaşlı uşaqların nağıl qəhrəmanları onların sevdiyi hər hansı bir əşyası olmalıdır. Məsələn, sevdiyi oyuncaq, xoşladığı cizgi film qəhrəmanı, şəkilli paltar və s. Bu yaş dövründə uşaqlar müxtəlif təkrarlayıcı hərəkətləri olan nağılları dinləməyi sevirlər.

Dörd-altı yaşlı uşaqlar daha çox sehrli nağıllara qulaq asmağı sevirlər. Yeddi yaşdan sonra onlar sehrli nağıllarla yanaşı, döyüş, müharibə, faciə, həmçinin, tərbiyəvi süjetli (xeyir və şər, yaxşılıq, pislik və s.) müxtəlif nağılları dinləməyə maraq göstərirlər. Valideynlər bu nüansları nəzərə alaraq uşaqlarına kitablar seçsələr, onlarda kitablara maraq oyatmaqda çətinlik çəkməzlər.

Valideynlərə övladları üçün kitab seçimində tövsiyələr:

- Valideynlər övladlarını yaxşı tanımalı, onların maraq və səviyyələrini müəyyənləşdirməli və düzgün seçilmiş kitablarla uşaqlarının mütaliə maraqlarının inkişafına dəstək olmalıdırlar.
- Üç-beş yaş qrupundakı uşaqlar üçün kitab seçərkən yaxşı təsvir olunan və uşaqların yaradıcılığını stimullaşdıran kitablar seçilməlidir.
- Beş-səkkiz yaş qrupundakı uşaqlar üçün seçilən kitablar dil və üslub baxımından anlaşıqlı, yeni biliklər öyrədən, tərbiyəvi və yeni öyrənənlər üçün qısa və böyük hərflərlə yazılmış kitablar olmalıdır.
- Səkkiz-on iki yaş qrupu uşaqlar üçün seçilən kitabların isə sadəcə bilik verən deyil, onların yaradıcılığını inkişaf etdirən və uşağın özü tərəfindən tamamlana bilən kitablar olmasına diqqət yetirilməlidir.
- Valideynlər uşaqları üçün kitab seçərkən, uşaqların fərdi əlamətlərinin olduğunu unutmamalıdır. Uşağın inkişafı ilə bağlı məlumatlı olmaq, həm uşağı, həm də uşaq ədəbiyyatını tanımaq baxımından əhəmiyyətlidir.
- Uşaqlara aid kitablarda çoxlu sayda obraz olmamalıdır, digər qəhrəmanlara aid hadisələr bir baş qəhrəman ətrafında cərəyan etməlidir.
- Seçilən kitablarda mücərrəd mənalı sözlər deyil, uşaq üçün konkret məna ifadə edən sözlərdən istifadə edilməlidir. Çünki hələ hiss və duyğular aləmində yaşayan kiçik yaşlı uşaqlar hər sözü ancaq konkret mənası ilə dərk edə bilir.
- Uşaq kitablarında istifadə edilən dil, Azərbaycan dilinin quruluşuna uyğun olmalıdır. Tərcümə əsərlərində çətin və məna qarışıqlığına səbəb olan adlar yerinə, azərbaycanca adlardan istifadə olunmalıdır.
- Uşaq kitablarında verilən şəkillər uşağın yaşına və inkişaf səviyyəsinə uyğun

olmalıdır. Məsələn, məktəbəqədər uşaqlar üçün kitabların hamısı şəkilli verilə bilər, birinci sinifdə onun dörddə üçü, ikinci sinifdə dörddə ikisi, üçüncü sinifdə isə dörddə biri şəkillərdən ibarət ola bilər. Bu nisbət dördüncü sinifdən sonra daha da azalmalıdır.

Məktəbəqədər uşaqlar üçün kitabın əsas funksiyası onların anlama səviyyəsinin inkişafı prosesinə yardımçı olmasıdır. Məktəbə getməmişdən əvvəl kitabla tanış olan uşaqların oxu bacarıqları yaşıdlarına görə daha tez inkişaf edir və ibtidai təhsil dövründə onlar kitabı həvəslə oxumağa başlayır. Artıq bu ərəfədə uşaqların həm oxu və yazı bacarığının inkişafını təmin edən, həm də uşağın xəyal dünyasına xitab edən kitablar təqdim olunmalıdır. İbtidai məktəbin üçüncü sinfindən etibarən uşaqlar günün böyük hissəsini oxumağa və ev tapşırıqlarının yerinə yetirilməsinə sərf edirlər. Bu yaş dövründə uşağın evdə və məktəbdə istiqamətləndirilməyə ehtiyacı vardır. Uşaq yavaş-yavaş özü təkbaşına oxuyarkən əldə etdiyi müstəqillikdən həzz almağa başlayır, üçüncü sinifdən sonra elm, tarix və digər mövzularda yazılmış kitabları oxumağa maraq göstərir.

Uşaqlar xüsusilə məktəbəqədər dövrdə səyahətlər etmək və yeni yerlər görmək, maraqlı mövzuların qısa və vizual elementlərini dinləməkdən həzz alırlar. Ailə bağlarının gücləndirilməsi baxımından da ata-analar uşaqlarına özlərini qayğısız hiss etmələri üçün ibrətamiz hekayələr oxumalıdırlar. Məktəb dövründə, xüsusilə on yaşından etibarən uşaqların ailələrindən asılılığı tədricən azalmağa başlayır və onlar daha çox yoldaşları ilə birlikdə vaxt keçirmək istəyirlər. Bu dövrdə uşaqlara maraqlı mövzuları əhatə edən kitablar təqdim edilə bilər. Seçiləcək kitablarda uşaqların zövqü, maraq və istəkləri, intellektual səviyyələri nəzərə alınmalı və müxtəlif variantlar, seçimlər yaradılmalıdır.

Uşağın öz kitablarını evdə saxlayacağı bir kitab rəfinin olması uşaqla kitab arasındakı əlaqəni gücləndirir. Oxuma otağında saxlanılan materiallar uşağın yaşına, maraqlarına və öyrənmə səviyyəsinə görə müəyyən olunmalıdır. Burada təbiətə dair, müxtəlif heyvan və quşlara qulluq haqqında kitablar, azərbaycanca izahlı lüğət, məsəllər və atalar sözləri, uşaqların marağını cəlb edə bilən və yaş dövrlərinə uyğun uşaq ədəbiyyatı nümunələrinə yer verən kitablar, qayçı, rəngli kağız, yapışqan və plastrlar, müxtəlif rəngli qələmlər, nağıllar, nəğmələr və xalq mahnıları ilə bağlı CD-lər saxlamaq olar. Oxu üçün seçilən məkan səs-küylü yerlərdən uzaq olmalı, oxuma otaqları uşaq üçün cəlbedici bir şəkildə təşkil edilməlidir. Yaradılacaq məkanda kitablar açıq rəflərdə saxlanmalıdır.

Müasir dövrümüzdə uşaq psixoloqları uşaqların kitaba maraq göstərməmələrinin səbəbini uşaqlarda deyil, valideynlərdə görür: “Əgər ailə uşağa ilk olaraq dinləmə vərdişini öyrətməyibsə, kiçik yaşlarında nağıl dinləmə və danışma vərdişi formalaşdırmayıbsa, yaşına uyğun kitablar əldə etməyibsə, bir uşaqdan necə kitaba maraq tələb edə bilər?” (2, 14)

Valideynlər uşaqları üçün əhəmiyyətli bir modeldir. Uşaqlar valideynlərini təbii olaraq təqlid edirlər. Bu səbəbdən də, onlar övladlarının gözü qarşısında kitab oxumaqla bu məsələdə uşaqlar üçün müsbət bir model yaratmalıdırlar. Kitab, jurnal və qəzet oxunulan və oxunanlar üzərində müzakirə aparılan ailələrdə yetişən uşaqların kitaba olan marağı, kitab oxunmayan ailələrdə yetişən uşaqlara nisbətən daha çoxdur. Birlikdə kitab oxuma, jurnal və əsərləri nəzərdən keçirmə, stimullaşdırma tədbirləri həyata keçirmə ev şəraitində uşaqların mütaliəsini inkişaf etdirən fəaliyyətlərdəndir.

Müasir dövrdə uşaqlar daha çox televiziya və kompüterə meyillənirlər ki, bu danılmaz bir faktdır. Psixoloqlar qeyd edirlər ki, valideynlərdən uşağın televiziya ilə əlaqəsini kəsməyi tələb etmək olmaz, bunu istəsək də edə

bilmərik. Bu problemi aradan qaldırmaq üçün valideynlər ilk öncə uşağın hər yaş dövrünə uyğun televiziyaya baxma müddətini bilməlidirlər. Məsələn, 2-3 yaş arası uşağın televizora gündə 20 dəqiqə baxması məsləhətdir. Pedaqoqlar bildirirlər ki, valideynlər buna o şərtlə şərait yaratmalıdır ki, uşağın baxdığı verilişlər, cizgi filmlər əvvəlcədən nəzarətdə saxlanılsın, daha sonra baxılan cizgi filmi müzakirə edilsin və uşaq baxdığı filmlərdən yadda qalanları valideyninə danışa bilsin. Günün digər vaxtlarını isə kitabdan nağıllar oxumağa sərf etmək daha məqsədəuyğundur. Valideynlər çalışmalıdır ki, uşaqları həm günün tələblərindən uzaq qalmasınlar, yəni onlar zamanla ayaqlaşa bilsinlər, həm də onların kitaba marağının ölməsinə imkan verməsinlər. Bununla yanaşı, imkan dairəsində uşaqları kitab mağazasına aparmaq, sevdiyi jurnalı, rəngləmək üçün rəsm dəftəri almaq və s. uşaqlarda kitaba və mütaliəyə qarşı böyük sevgi yaradacaq. Bu mərhələdə alınan əşyaların pulunun uşağın özü tərəfindən verilməsi kitabın onun olduğunu mənimsəməsinə səbəb olacaqdır.

Uşaqlar özləri oxu vərdişi qazanana qədər, adətən, istəyirlər ki, valideynləri onlara nağıl kitabları oxusunlar. Bu kitablar müxtəlif və fərqli formada ola bilər: körpələr üçün oyuncaq – kitablar, şəkilli qatlanan kitablar və s. Oxuduqları ilk kitablar uşaqlarda oxu vərdişi yaradır – yazılanlar soldan sağa oxunur, səhifələr də soldan sağa davam edir, ancaq vərəqlər sağdan sola çevrilir. Hekayəni sözlər və şəkillər vasitəsilə danışmaq mümkün olur. Uşaqların savadlı, yetkin insan olmaq istiqamətindəki ilk addımları kimi onlar həmin hekayələr vasitəsilə diqqətlə qulaq asmağı, sual verməyi, mülahizə yürütməyi və s. öyrənirlər.

Oxu vərdişlərinin inkişaf etdirilməsində uşaq ədəbiyyatı mühüm rol oynayır. Uşaq ədəbiyyatı uşaqların həm inkişafına yardımçı olan, həm də onları tərbiyə edərkən əylənmələrini təmin edən şifahi və yazılı mətndir. Uşaq ədəbiyyatının müsbət cəhəti uşaqlara kitab sevgisi və oxu vərdişini qazandırmaqdır. Uşaq ədəbiyyatı materialları uşaqların mütaliə mədəniyyətini təmin etmək və müxtəlif zaman kəsiyində onları ixtisaslı mətnlərə yönəltmək xüsusiyyətinə malikdir. Bu, uşağa yalnız oxu bacarığı vermir, eyni zamanda onun yaradıcılıq və tənqidi düşünmə bacarığının inkişaf etməsinə yardımçı olur, uşaqların dil şüurunu və söz ehtiyatını inkişaf etdirir, beləliklə, onların məktəb həyatının irəliyə doğru inkişafında xüsusi rol oynayır. Xüsusilə, şifahi ədəbiyyat nümunələrindən olan yanıltmaclar və tapmacalar, həm uşağın dil inkişafını təmin edir, həm də söz ehtiyatını zənginləşdirir.

Bədii kitablar uşaqlarda dünya haqqında da geniş təsəvvür yaratdığından onlar dərsliklərdəki müxtəlif mövzularla əlaqələndirilə bilər. Məsələn, "Kərgədan və qarışqa" sadəcə həyatla mübarizə aparmaq və problemin öhdəsindən gəlmək haqqında təmsil deyil. Burada əməyə, zəhmətə rəğbət hissinin ifadə olunması ilə yanaşı, tənbəllik və kobudluğun mənfi cəhətləri də öyrədilir.

5-ci sinif ədəbiyyat dərsliyində verilən "Mərd və namərdin nağılı" isə çox təsirli bir əsərdir. Bu əsər şagirdlərə həyatda qarşılaşdıqları insanların ayrı-ayrı xüsusiyyətlərini müəyyən etməyə və ondan çıxış edərək həmin insanın şəxsiyyəti barədə nəticələrə gəlməyə kömək edir.

Süleyman Sani Axundovun "Nurəddin" hekayəsində Nurəddin uşaqlar üçün cəlbedici personajdır, əsərdə pis niyyətli insanların həyatda heç nəyə nail ola bilməyəcəyi, yaxşılıq və xeyirxahlığın hər bir insan üçün vacibliyi, var-dövlət arxasınca qaçanların xeyirxah ola bilməyəcəyi kimi tərbiyəedici fikirlər aşılanır. Burada əsas məsələ odur ki, uşaqların mütaliəsinin əyləncəli, cəlbedici və onların qavrama səviyyəsinə uyğun olması üçün gərək biz əlimizdən gələni əsirgəməyək. Əgər bir uşaq artıq 10 yaşında oxu vərdişinə yiyələnib və oxumaqdan zövq alırsa, deməK, o, ömrü boyu yaxşı oxucu olacaq.

## Ədəbiyyat


1. Tahirova N. Gənc ana və uşaqların maarifləndirilməsi. F.Köçərli adına Respublika Uşaq Kitabxanası, Bakı, 2015, 33 s.
2. Əliyeva A., Əhmədova S. Oxu! – yaşamaq üçün Bakı: F.Köçərli adına Respublika Uşaq Kitabxanası, 2018, 33 s.
3. Əhmədov E., Hüseynova Ə. Qlobal informasiya məkanı və müasir kitabxanaşünaslıqda mütaliənin yeni təzahürləri. "Kitabxanaşünaslıq və biblioqrafiya" jurnalı, 2007, № 2


Göndərilib: 01.03.2021 Qəbul edilib: 05.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/51-54

**Kəmalə Fuad qızı Nəsirova**
Bakı Slavyan Universiteti
doktorant
kamale_revan@mail.ru

# QAÇQIN VƏ MƏCBURİ KÖÇKÜNLƏRİN BEYNƏLXALQ MÜDAFİƏSİNİN SİYASİ VƏ HÜQUQİ ASPEKTLƏRİNİN TƏHLİLİ

***Açar sözlər:*** *qaçqın, məcburi köçkün, qaçqın və məcburi köçkünlərin beynəlxalq müdafiəsi, miqrasiya*

## Analysis of political and legal aspects of international protection of refugees and internally displaced persons

**Summary**

The article is devoted to the analysis of political aspects of international protection of refugees and internally displaced persons in the system of international relations. If we look at our recent history, we can see that in fact, in the modern system of international relations, the factors that determine the international protection of refugees and internally displaced persons are political elements, political causes and threats, as well as international political and military security. Therefore, the article touches on the issue of ensuring both the territorial integrity of Azerbaijan and the violated rights of refugees and internally displaced persons through counter-attack operations of Azerbaijan in September-November 2020.
***Key words:*** *refugees and IDPs, international protection of refugees and IDPs, migration*

Beynəlxalq münasibətlər sistemində qaçqın və məcburi köçkünlərin beynəlxalq müdafiəsinin məzmununun aydınlaşdırılması və problemin siyasi aspektlərinin hərtərəfli təhlili mühüm nəzəri və konseptual əhəmiyyət kəsb edir. İstər qədim və orta əsrlərin beynəlxalq münasibətlər tarixində qaçqınlarla bağlı məsələlər, istərsə də, yaxın tariximizə diqqət yetirsək görərik ki, əslində müasir beynəlxalq münasibətlər sistemində də qaçqın və məcburi köçkünlərin beynəlxalq müdafiəsini şərtləndirən amillər məhz siyasi elementlər, siyasi səbəblər və təhdidlər, habelə beynəlxalq siyasi-hərbi təhlükəsizlik məsələləridir. Bu təhdid və səbəblər isə son illər planetdə qlobal miqyaslı, xüsusilə Yaxın Şərqdə və dünyanın bir sıra digər konfliktogen zonalarında qaçqın sayını xeyli artırmışdır. Eyni zamanda, Azərbaycanın 2020-ci ildə Ermənistanın hərbi təcavüzünə qarşı həyata keçirdiyi əks-hücum əməliyyatları nəticəsində torpaqlarımızın işğaldan azad olunması da qaçqın və məcburi köçkünlərin qayıdışı ilə əlaqədar problemin aktuallığışərtləndirir.

Qaçqın problemlərinin tədqiqatçısı, professor Gil Loesçer yazır ki, davamlı siyasi və diplomatik təşəbbüslər, inkişafa yardım, insan haqlarının monitorinqi və demokratik institutların qurulması, vətəndaş cəmiyyətinin gücləndirilməsi yolu ilə görülən bütün tədbirlərə vaxtında başlanılsa və kifayət qədər iqtisadi və siyasi dəstək verilərsə, bunlar zorakılığın baş verməsinin və əhalinin kütləvi yerdəyişməsinin qarşısını almağa kömək edər.[1] Müəllifin bu fikirlərinə şərik çıxaraq vurğulamaq lazımdır ki, bir çox hallarda beynəlxalq sistemdə mövcud olan müxtəlif siyasi-hərbi gərginlik və böhran situasiyaları səbəbindən qaçqınların sayı kütləvi şəkildə artmış, qaçqın probleminin mərkəzində qlobal siyasi faktorlar dayanmışdır.

Son illərin praktikasından çıxış edərək, təkcə bir faktı vurğulamaq kifayətdir ki, Ermənistanın Azərbaycana hərbi təcavüzü nəticəsində 1 milyondan artıq qaçqın və məcburi köçkün faktoru məhz siyasi və hərbi, eyni zamanda beynəlxalq təhlükəsizlik prizmasından problemin məzmununu obyektiv qiymətləndirməyə imkan verir. Qaçqın probleminin siyasi elementlərini beynəlxalq münasibətlər sistemindəki dəyişiklilərlə, siyasi böhranlarla bağlılığını xarakterizə edən prof. Musa Qasımlı yazır ki, beynəlxalq syasi şəraitdən yararlanmaqla, 1990-cı illərin beynəlxalq münasibətlərində baş verən Körfəz müharibəsi kontekstində sovet rəhbərliyinin diqqətini bu müharibə ilə bağlı diplomatik səylərə yönəltməsi Ermənistanın işinə yaradı və Azərbaycana kütləvi qaçqın axını başladı. 1990-cı ilin sentyabrında Azərbaycanda Ermənistandan qovulan 201 min azərbaycanlı, 2,5 min kürd, 1,5 minə qədər rus, süni surətdə

[1]Gil Loescher, Refugees as grounds for international action, https://collections.unu.edu/eserv/UNU:2434/nLib 92808 10863.pdf P.32.

törədilmiş münaqişə zəminində Özbəkistandan qovulan 29 min Ahıska türkü var idi. Az sonra Azərbaycanda qaçıqınların sayı 250 min nəfərə çatdı.[2]

Həmçinin, tamamilə siyasi səbəblərdən 1994-cü ildə Ruandadan Zairə qaçqınların faciəli şəkildə çıxması zamanı qaçqın kimi tanınanların ümumi sayı cəmi bir həftə içində 1,2 milyon nəfərə yüksəlmişdir. Məhz bu və ya digər faktlar son dövrlərin beynəlxalq münasibətlər sistemində qaçqın və məcburi köçkünlərin beynəlxalq müdafiəsinin məzmununu şərtləndirən əsas tendensiyalardan biri kimi çıxış etməkdədir. Eyni zamanda, siyasi amillər qaçqın və məcburi köçkün probleminin başlıca səbəbi və həm də müəyyən hallarda nəticəsi kimi çıxış etməkdədir.

Qaçqın və məcburi köçkünlərin beynəlxalq müdafiəsinin məzmunu və siyasi aspektlərinin müxtəlif elementlərini şərh edən professor Edvard Neyman hesab edir ki, tarixi, texnoloji və sosial-iqtisadi dəyişikliklər cəmiyyətlərə bir çox cəhətdən təsir etmiş, münaqişələrin xarakteri və təsiri buna uyğun olaraq dəyişmiş, müharibədən sonrakı dövrdə, məsələn, bir sıra tarixi qüvvələr və proseslər həm leqal, həm də qeyri-leqal formada qaçqın, yerdəyişmə və miqrasiya meyillərinə və qanunlarına təsir göstərmişdir. İkinci dünya müharibəsi Avropada təxminən 40 milyon insanı vətənlərinin hüdudlarından kənarda buraxdı. Dekolonizasiya və müstəqillik uğrunda aparılan müharibələr, dövlətlərin parçalanması, qloballaşma, soyuq müharibənin sonu və şəxsiyyət siyasətinin "dirçəlişi" bütün bunlara təsir etmişdir.[3] Alimin bu fikirindən belə nəticəyə gəlmək mümkündür ki, ümumiyyətlə qaçqın və məcburi köçkünlərin beynəlxalq müdafiəsinin məzmunu şəxsiyyətin hüquqi statusu, zaman və məkan, habelə insanın mənəvi dəyəri ilə sıx bağlıdırsa, bu problemin siyasi aspektləri isə daha çox müharibə, epidemiyalar, iqtisadi və siyasi kataklizmlərin nəticəsi kimi çıxış edir. Biz beynəlxalq münasibətlər sisteminin bu günkü mənzərəsinə nəzər yetirdikdə qaçqın və məcburi köçkünlərlə, əhalinin yerdəyişməyə məcbur olan təbəqəsi ilə, ümumiyyətlə miqrasiya proseslərinin məzmunu ilə bağlı yeni tendensiyaların da şahidi oluruq. BMT Baş Assambleyasının 19 sentyabr 2016-cı il tarixli qətnaməsi ilə qəbul olunmuş Qaçqınlar və miqarantlarla bağlı Nyu-York Bəyannaməsində də qaçqın və məcburi köçkünlərin beynəlxalq müdafiəsinin məzmunu və siyasi aspektləri ilə bağlı qeyd olunur ki, qaçqınların və miqrantların böyük hərəkəti, bütün sərhədləri aşan siyasi, iqtisadi, sosial, inkişaf, humanitar və insan hüquqları ilə əlaqəli nəticələrə malikdir. Bunlar qlobal yanaşmalara və qlobal həll yollarına çağırış edən qlobal fenomenlərdir. Heç bir dövlət bu hərəkəti təkbaşına idarə edə bilməz.[4] Bu sənəddən də göründüyü kimi, qaçqınların müdafiəsi ilə bağlı məsələnin həlli yalnız beynəlxalq münasibətlər sisteminin rasional harmoniyasından, siyasi, sosial və iqtisadi əlaqələrin inkişafından, habelə ölkələrə və icmalara kömək etmək üçün daha böyük beynəlxalq əməkdaşlıqdan asılıdır.

Müasir dövrdə dünyanı bürüyən COVİD-19 (koronovirus) pandemiyası əhali yerdəyişməsinin siyasi aspektləri və qaçqınların beynəlxalq müdafiəsi sistemi ilə bağlı yeni çalarlar ortaya qoymuşdur. Yəni, dünyadakı son proseslər eyni zamanda qaçıqın və məcburi köçkün, əhalinin yerdəyişmə və miqrasiya proseslərinə də fərqli yanaşmaların ortaya çıxmasına səbəb olmuşdur. Koronavirusun yayılması qaçqınların və məcburi köçkünlərin, hakimiyyətin siyasəti və təcrübələri səbəbindən xüsusi risk altında olduğunu qeyd edən Dr. Lina Xatib vurğulayır ki, COVID-19-un qaçqınlara təsiri də siyasi xarakter daşıyır.[5] Eyni zamanda, COVİD-19-un qaçqınların beynəlxalq müdafiəsinə təsiri ilə bağlı araşdırmalar aparan Dünya İqtisadi Forumu öz saytında bildirir ki, bu dönəmdə dünyada qaçqınlar və sığınacaq axtaranlar qorxu və qeyri-müəyyənlik doğuran yanlış məlumatların yayılması ilə çətinləşən COVID-19-un fiziki və siyasi təsirindən əziyyət çəkirlər. Qaçqın icmalarında COVID-19 pandemiyası təhlükəsi artdıqca hazırlıq hər zamankindən daha vacibdir. Dəhşətli vəziyyətlərdən qaçan sığınacaq axtaranlar getdikcə sərt miqrasiya siyasəti və sərhədlərin bağlanmasına görə tələyə düşürlər.[6]

Ümumiyyətlə qeyd etmək lazımdır ki, qaçqın və məcburi köçkün probleminin siyasi kökləri beynəlxalq münasibətlər sistemində gərginləşən situasiyalar və siyasi konfliktlərlə birbaşa bağlıdır. Burada təbii ki,

---

[2] Qasımlı M.C. Ermənistanın sovetləşdirilməsindən Azərbaycan ərazilərinin işğalınadək erməni iddiaları: tarix – olduğu kimi (1920-1994-cü illər). – Bakı: Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondu, 2016.S.448–520 səh.

[3] Refugees and forced displacement: international security, human vulnerability, and the state / Edward Newman and Joanne van Selm, editors. TheUnitedNationsUniversity Press, NewYork, 2003, p. 13. 391 pp.

[4] Resolution adopted by the General Assembly on 19 September 2016, New York Declaration for Refugees and Migrants, https://www.un.org/en/development/desa/population/migration/generalassembly/docs/globalcompact/ A_RES _71_1.pdf

[5] COVID-19 Impact on Refugees is Also Political, https://www.chathamhouse.org/expert/comment/covid-19-impact-refugees-also-political

[6] On World Refugee Day, a look at how COVID-19 is affecting refugees and asylum seekers, https://www.weforum.org/agenda/2020/06/world-refugee-day-refugees-asylum-seekers-coronavirus-covid-19-pandemic-response/

beynəlxalq qurumlar öz missiyasını lazımi şəkildə yerinə yetirmədikdə, problemin həlli qeyri-mümkün olacaqdır. Bununla əlaqədar prof. Gil Loescher qeyd edir ki, Birləşmiş Millətlər Təşkilatının Qaçqınlar üzrə Ali Komissarlığı (UNHCR) kimi beynəlxalq humanitar qurumlar siyasi situasiyaların təcavüzkar münaqişələrə çevrilməsinin qarşısını almaq üçün "yumşaq müdaxilə" konsepsiyasını təbliğ edirlər. Bununla belə, silahlı hərbi əməliyyatlar artıq bir ölkə daxilində baş verdiyi və insan hüquqlarının geniş şəkildə pozulması ilə müşayiət olunduğu təqdirdə, bu cür pozuntuları dayandırmaq üçün "sərt" müdaxilə formaları, o cümlədən hərbi əməliyyatlar lazım ola bilər.[7] Professorun bu fikirinə tam şərik olaraq, qeyd etmək istərdik ki, beynəlxalq siyasi şəraitdən və bütün dünyanın pandemiya ilə mübarizə aparmasından sui-istifadə edərək, 12 iyul 2020-ci ildə Azərbaycanın Tovuz rayonuna Ermənistan tərəfindən silahlı təcavüz edilməsinə cavab olaraq, ölkəmizdə yeni qaçqın kütləsinin yaranmaması üçün real siyasi və hərbi situasiya "yumşaq müdaxilə"ni deyil, "sərt" müdaxilə formasını - hərbi əməliyyatları zəruri etmişdir. Ona görə də 2020-ci ilin sentyabr noyabr ayları ərzində Azərbaycan əks-hücum əməliyyatları ilə həm ərazi bütövlüyünü, həm də qaçqın və məcburi köçkünlərin pozulmuş haqlarını təmin etmişdir.

Prof. Qudvin Qill vurğulayır ki, qaçqın probleminin hər zaman tamamilə qeyri-siyasi ola biləcəyini təsəvvür etmək qeyri-realdır. Onun fikrincə, 1920-1955-ci illər tarixinin də təsdiqlədiyi kimi, dövlətlərin qaçqın axınlarına reaksiyalarında motivasiya amili onların öz maraqlarının davamlı olması idi. Lakin,1940-cı illərin sonu və 1950-ci illərin əvvəllərində qaçınlara dair bir təqib yönümlü tərifin müəyyənləşdirilməsi ilə təkcə beynəlxalq səviyyədə deyil, həm də milli sığınacaq prosedurlarını tənzimləyən beynəlxalq qaçqın rejimini formalaşdırdı.[8]

Baxmayaraq ki, 1950-ci ilin dekabrında BMT Baş Assambleyasının qərarı ilə BMT yaradılmış və 1 yanvar 1951-ci ildə fəaliyyətə başlayan Qaçqınlar üzrə Ali Komissarlığının Ofisi (UNHCR) mahiyyəti qeyri-siyasi xarakterli bir qurum kimi formalaşmışdısa və humanitar təşkilat kimi yaradılmışdısa, bu gün artıq bu qurum bir sıra qaçqınalrı məhz siyasi baxışlarına və ya siyasi əqidəsinə görə dövlətlərin təqibindən qorumaq missiyasını yerinə yetirir. Onun vəzifəsi qaçqınların beynəlxalq müdafiəsini təmin etmək və qaçqın probleminin davamlı həllinə nail olmaqla bu məqsədlərə çatmaqda kömək etməkdir. Əlbəttə, həm də yaddan çıxarmaq olmaz ki, bu qurum hazırda öz vəzifəsini hökumətlərlə siyasi əməkdaşlıq yolu ilə həyata keçirir. Bundan başqa, BMT strukturlarında qaçqınlarla qəbul olunan qərarlar məhz siyasi səbəblərlə əlaqədar olmuşdur. Məsələn, buna bariz nümunə kimi Azərbaycan qaçqınlarına beynəlxalq yardımın göstərilməsi ilə bağlı qərarından da görmək mümkündür. Məhz beynəlxalq siyasi şəraitin, o cümlədən Azərbaycanda pisləşən humanitar vəziyyətin və 1 milyondan çox qaçqın və məcburi köçkünün yaranmasından dərin narahatlığını ifadə edən BMT Baş Assambleyası 1993-cü ildə 85-ci plenar iclasında Azərbaycanda qaçqın və məcburi köçkünlərə fövqəladə beynəlxalq yardımın göstərilməsi haqqında A / RES / 48/114 saylı Qətnamə qəbul etmişdir.[9]

İstər əvvəlki dövrlərin, istərsə də, müasir dövrün beynəlxalq münasibətlər sistemində qaçqın və məcburi köçkünlərin beynəlxalq müdafiəsinin məzmunu və siyasi baxımdan qaçqınların vəziyyəti və institusional idarəetmə ilə bağlı normaların kodifikasiyası da mühüm elmi-praktiki mahiyyət kəsb edən məsələlərdən biri hesab edilir.

A.İ.Qercen adına Rusiya Dövlət Pedoqoji Universitetinin professoru N.Y.İvanovna bununla əlaqədar qeyd edir ki, qaçqınların hüquqları sahəsində kodifikasiya prosesi beynəlxalq səviyyədə insan hüquqlarının tənzimlənməsindən daha əvvəl başlamışdır. Hesab edilir ki, qaçqınların hüquqlarının müdafiəsi institutunun formalaşması beynəlxalq münasibətlərin inkişafı ilə bilavasitə əlaqəlidir. [10] Bu fikirlərin təhlilindən də açıq-aydın görünür ki, insan hüquqları tarixən XIX-XX əsrlərin məhsulu olmuşdursa, qaçqınların beynəlxalq müdafiəsinin siyasi aspektləri də əvvəlki dövrlərə aid olmaqla, daha çox beynəlxalq münasibətlərdə geniş mənada siyasi, həmçinin, sosial-iqtisadi və demoqrafik proseslərin nəticəsində formalaşmışdır. Bununla əlaqədar, qaçqın probleminin sosial-iqtisadi və etnik səbəblərinə toxunan siyasi analitik Z. Bjezinski yazır: "Aydındır ki, qlobal miqyasda artan əhali miqrasiyası kimi bir hadisənin yalnız sosial-iqtisadi sahədə

[7] Gil Loescher, Refugees as grounds for international action, https://collections.unu.edu/eserv/UNU:2434/ nLib92808 10863.pdf P.32.

[8] Guy S. Goodwin-Gill, The Politics of Refugee Protection. Refugee Survey Quarterly, Volume 27, Issue 1, 2008, Pages 8–23, https://doi.org/10.1093/rsq/hdn003

[9] Азербайджан на международной арене, http://files.preslib.az/projects/republic/ru/azr2_4.pdf

[10] Иванова Н. Ю. К вопросу о статусе беженца в международном праве, https://www.gramota.net/articles/issn_ 1997-292X_2009_3_17.pdf

"təhlükəsizlik qapağı" kimi deyil, həm də "etnik və sosial konfliktlərin qitədən qitəyə köçürülməsi vasitəsi" kimi də xidmət edə bilər".[11]

Ona görə də hesab edirik ki, qaçqın və məcburi köçkünlərin beynəlxalq müdafiəsinin siyasi məzmun etibarilə mühüm elementi bu paradiqmaya kompleks yanaşılmasından ibarətdir. Kompleks yanaşma o deməkdir ki, qaçqın probleminin beynəlxalq müdafiəsini zəruri edən amillərə həm siyasi səbəb və maraqlarla yanaşı, həmçinin burada sosial, iqtisadi və demoqrafik faktorlar da aid edilməlidir.

Beləliliklə, qaçqın və məcburi köçkün probleminin siyasi kökləri beynəlxalq münasibətlər sistemində gərginləşən situasiyalar və siyasi konfliktlərlə birbaşa bağlıdır. Burada beynəlxalq qurumlar öz missiyasını lazımi şəkildə yerinə yetirmədikdə, problemin həlli qeyri-mümkün olacaqdır. Digər tərəfdən, dünyadakı son proseslər qaçıqın və məcburi köçkün, əhalinin yerdəyişmə və miqrasiya proseslərinə də fərqli yanaşmaların ortaya çıxmasına səbəb olmuşdur. Ölkəmizdə yeni qaçqın kütləsinin yaranmaması üçün real siyasi və hərbi situasiya "yumşaq müdaxilə"ni deyil, "sərt" müdaxilə formasını - hərbi əməliyyatları zəruri etmişdir. Ona görə də 2020-ci ilin sentyabr noyabr ayları ərzində Azərbaycan əks-hücum əməliyyatları ilə həm ərazi bütövlüyünü, həm də qaçqın və məcburi köçkünlərin pozulmuş haqlarını təmin etmişdir.

## Ədəbiyyat

1. Qasımlı M.C. Ermənistanın sovetləşdirilməsindən Azərbaycan ərazilərinin işğalınadək erməni iddiaları: tarix – olduğu kimi (1920-1994-cü illər). –Bakı: Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondu, 2016. S.448– 520 səh.
2. Азербайджан на международной арене, http://files.preslib.az
3. Бжезинский З. Великая шахматная доска. Господство Америки и его геостратегические императивы. М.: Международные отношения, 1999. С. 232.
4. Иванова Н.Ю. К вопросу о статусе беженца в международном праве, https://www.gramota.net
5. COVID-19 Impact on Refugees is Also Political, https://www.chathamhouse.org
6. Gil Loescher, Refugees as grounds for international action, https://collections.unu.edu
7. Guy S. Goodwin-Gill, The Politics of Refugee Protection. Refugee Survey Quarterly, Volume 27, Issue 1, 2008, Pages 8–23, https://doi.org
8. Refugees and forced displacement: international security, human vulnerability, and the state / Edward Newman and Joanne van Selm, editors. The United Nations University Press, New York, 2003, p. 13. 391 pp.
9. Resolution adopted by the General Assembly on 19 September 2016, New York Declaration for Refugees and Migrants, https://www.un.org
10. On World Refugee Day, a look at how COVID-19 is affecting refugees and asylum seekers, https://www. weforum.org

**Rəyçi: dos. Ş.Əliyev**

Göndərilib: 27.02.2021 Qəbul edilib: 05.03.2021

[11] Бжезинский З. Великая шахматная доска. Господство Америки и его геостратегические императивы. М.: Международные отношения, 1999. С. 232.

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/55-58

**Fatma Ağası qızı Əsədova**
Bakı Slavyan Universiteti
müəllim
fatya.asadova @ mail.ru
orcid id: 0000-0002-2586-9226

# FƏAL TƏLİM TƏHSİL İSLAHATININ TƏLƏBİ KİMİ

***Açar sözlər**: fəal təlim, qloballaşan dünya, təhsil islahatı, əməkdaşlıq, fərdiləşdirmə*

**Active training-as a requirement of educational reform**
**Summary**

In every society, education has served ensuring the interests of the people as a social process. This is so because man is not for education, education is for man. The education reform implemented in the country is aimed at creating a National Education System and is based on the most preferred principles of democratization, humanization, integration, differentiation, individualization and a number of principles in modern times. The implementation of these principles implies that the student becomes a key participant in the educational process, forming him as a personality.

As time changes, so does the education system. Curricula, the content of education and training methods must also change. Active training methods are one of the most important training methods in the field of education in our globalized world.

***Key words:** active training, globalizing world, education reform, cooperation, individualization*

Hər bir cəmiyyətdə təhsil ictimai proses kimi insanların maraqlarının təmin olunmasına xidmət etmişdir. Bu belədir, çünki insan təhsil üçün deyil, təhsil insan üçündür. Ulu öndərimiz Heydər Əliyevin təbirincə desək, "Təhsil sahəsi müqəddəs bir sahədir. Çünki təhsil sahəsi uşaqları, gəncləri hazırlayıb gələcəyə əsl vətəndaş, yüksək səviyyəli mütəxəssis etmək üçün mövcuddur". Onu daim təkmilləşdirmək, yeniləşdirmək, zamanın uğurlarını qabaqlayan bir vasitəyə çevirmək zəruridir. (7, s.3)

Qloballaşan çağdaş dünyamızda bəşəriyyət üçün tamamilə yeni olan problemlər yaranmışdır. Problemlərin həlli təhsildə mütləq əsaslı dəyişikliklərin aparılmasını, onun müasir cəmiyyətin maraqlarına uyğunlaşdırılmasını vacib edir. Dəyişikliklər təhsilin məzmunundan, strukturundan tutmuş təlim metodlarınadək, demək olar ki, bütün sahələri əhatə etməlidir.

Respublikada həyata keçirilən təhsil islahatı Milli Təhsil Sisteminin yaradılmasına yönəldilmişdir və onun əsasında müasir zamanda ən çox üstünlük verilən demokratikləşdirmə, humanistləşdirmə, humanitarlaşdırma, inteqrasiya, differensiallaşdırma, fərdiləşdirmə və bir sıra prinsiplər durur. Bu prinsiplərin həyata keçirilməsi şagirdin təlim-tərbiyə prosesinin əsas iştirakçısına çevrilməsi, onun şəxsiyyət kimi formalaşmasını nəzərdə tutur.

Demokratikləşdirmə-təhsildə maraqlı olan tərəflərin, dövlət strukturlarının, ictimaiyyətin təhsil prosesində fəai iştirakı, tədris müəssisələrində şəffaflığın təmin edilməsidir.

Humanistləşdirmə-şagirdə münasibəyin dəyişdirilməsinin, onun maraqlarının önə çəkilməsinin, humanist şəxsiyyət kimi formalaşmasının, əqli və fiziki imkanlarından, qabiliyyətindən asılı olmayaraq şəxsiyyətinə hörmətlə yanaşılmasının, istedad və bacarığının üzə çıxarılması və inkişafına şərait yaradılmasının nəzərdə tutulmasıdır.

Humanitarlaşdırma – təhsilin məzmununa yeni baxış, tədris edilən fənlərdə bəşəri dəyərlərə geniş yer verilməsi, milli – mədəni, tarixi dəyərləri dərindən öyrənməklə dünyəvi dəyərlərdən bəhrələnməyin əsas götürülməsi, bunların şəxsiyyətin imkişafının vacib şərti hesab edilməsidir.

İnteqrasiya – müxtəlif fənlərin tədrisi zamanı onların arasında təbii mövcud olan əlaqələrdən istifadə edərək şagirdlərdə qlobal düşüncə tərzinin, həmrəylik və məsuliyyətin formalaşdırılmasının mümkünlüyünün nəzərdə tutulmasıdır.

Differensiallaşdırma dedikdə hər bir şagirdin fərdi xüsusiyyəti və imkanlarının nəzərə alınması başa düşülür.

Fərdiləşdirmə - ayrıca götürülmüş hər bir fərdin şəxsi maraq, az\rzu və istəyinin, onun təlabatlarının əsas götürülməsidir. (6, s.7)

"Azərbaycan Respublikasının təhsil sahəsində islahat Proqramı"nda göstərildiyi kimi fəal təlim üsullarından istifadə bu prinsiplərin həyata keçirilməsi yollarından biridir.

Fəal təlimin tətbiqini zəruri edən amillər hansılardır? Təlim üsulları təlim prosesinin səmərəliliyinə təminat yaradan faktordur. Zaman dəyişdikcə, təhsil sistemi də dəyişir. Tədris proqramları, təhsilin məzmunu və təlim üsulları da dəyişməlidir. Fəal təlim üsulları qloballaşan dünyamızın təhsil sahəsində əhəmiyyət verdiyi təlim metodikalarındandır. Fəal təlimin peşəkarlıqla tətbiq edilməsi məktəbdə şəraiti, şagirdin təhsilə münasibətini dəyişir, pozitiv və fəal həyat mövqeyini formalaşdırmağa şərait yaradır. Bu üsullar biliklərin müstəqil mənimsənilməsi və yeniliklərin kəşf edilməsi, qazanılmış biliklərin yaradıcılıqla yenidən işlənməsi, problemi həll etmək üçün yoldaşları ilə əməkdaşlıq etməyi bacarmaq, özünürealizə yollarını axtarıb tapmaq kimi keyfiyyətlərin əldə edilməsinə şərait yaradır. Təlim prosesində fəal təlim metodlarından istifadə edilməsi şagirdlərin təhsilə biganəliyinin aradan qaldırılmasına, lazımi təfəkkür xüsusiyyətlərinin formalaşmasına, ümumiyyətlə, təlimin keyfiyyətinin yüksəldilməsinə şərait yaradır.

Təlimin səmərəliliyinin artırılması yollarından ən effektlisi biliklərin verilməsi zamanı şagirdin yaradıcı təfəkkürünü işə salmaq, ona istinad etməkdir. Şagird yaradıcı təfəkkürünü fəallaşdırmaqla, onun yeni biliklərə müstəqil yiyələnməsinə şərait yaradan ənənəvi metodlardan keyfiyyətcə fərqlənən interaktiv təlim üsulları idrak fəaliyyətinin təşkil və idarə olunması üsulları olub, müəllim tərəfindən idraki problem – situasiyanın yaradılması, problem – situasiyanın həlli zamanı şagirdlərin fəal tədqiqatçı mövqeyinin həvəsləndirilməsi və şagird üçün maraqlı və yeni biliklərin müstəqil kəşf edilməsi və mənimsənilməsi ilə xarakterizə edilir.

İnteraktiv təlimdə mexaniki yaddaş deyil, təfəkkürün inkişafı, şagirdlərin fəal dərketmə mövqeyi, biliklərin müstəqil əldə edilməsi, tədqiqat və dərketmə üçün müvafiq şəraitin yaradılması, təbii öyrənmə fəallığının artırilmasına təkan verən problemli şəraitin yaradılması, biliklərin yaradıcı tətbiqi, ətrafdakılarla əməkdaşlıq etmək bacarığı, təfəkkürün müstəqilliyi və sərbəstliyi vacib amillərdəndir.

Yeni yanaşmanın mahiyyəti ondadır ki, təlim şagirdlərin yaddaşının yalnız yeni elmi biliklərlə zənginləşdirilməsinə deyil, həm də təfəkkürün müntəzəm inkişaf etdirilməsi əsasında daha çox biliklərin müstəqil əldə edilməsi və mənimsənilməsi, ən mühüm bacarıq və vərdişlərin, şəxsi keyfiyyət və qabiliyyətlərin qazanılmasına yönəlib. Bu zaman şagirdlər müəllimin rəhbərliyi ilə,xüsusi seçilmiş, asan başa düşülən və yadda qalan, ən vacib təlim materialının öyrənilməsi prosesində fakt və hadisələrin səbəb – nəticə əlaqələrini, qanunauyğunluqlarını aşkar etməyi, nəticə çıxarmağı, mühüm və dərin ümumiləşdirmələr aparmağı öyrənirlər. İnteraktiv təlim prosesində şagirdin mövqeyi – “kəşf edən”, “tədqiqatçı”, “araşdırıcı” mövqeyidir; o, gücü çatdığı məsələlər və problemlərlə üzləşərkən, bunları müstəqil tədqiqat prosesində həll edir. Şagirdlər təlim prosesində passiv dinləyici deyil, fəal düşünən, danışan, fikir söyləyən, münasibət bildirən, bir subyekt, təlim prosesinin tamhüquqlu iştirakçısı, tədqiqatçısı kimi çıxış edir və bilikləri fəal axtarış və kəşflər prosesində mənimsəyirlər. Müəllimin mövqeyi – fasilitator (bələdçi, aparıcı) daha çox istiqamətverici mövqeyindədir. O, problemli vəziyyətləri planlı və istiqamətlənmiş surətdə təşkil edir, şagirdlər qarşısında tədqiqat məsələlərinin meydana çıxmasına şərait yaradır və onların həllinə metodiki kömək göstərir.

Yeni kurikulumlarla iş prosesində ən zəruri amillərdən biri kimi bütün müəllimlərin fəal təlim metodlarından istifadə bacarıqlarına yiyələnməsi mühüm vəzifələrdəndir.

Ənənəvi dərsdə şagirdlər məlumatları yadda saxlamağa çalışırlar, müəllim isə nəticələri özü çıxararaq bilikləri hazır şəkildə şagirdlərə çatdırır. Öyrədici fəaliyyət ilk növbədə müəllimin fəallığı əsasında həyata keçirilir.

Hamıya məlum olduğu kimi, hər hansı bir məlumat real həyatda tətbiq edilən zaman biliyə çevrilir. Şagirdin cavabına qoyulan tələblərin əsasını əslində biliklərin mənimsənilməsinin yoxlanılması yox, verilən məlumatların yadda saxlanılması təşkil edir. Eyni zamanda, ənənəvi təlim prosesində biliklərin praktik tətbiqini təsəvvür etmək üçün şagirdə müvafiq imkanlar yaradılmır. Dərsin məzmunu, adətən daha çox nəzəri öyrənilir və həyatın tələbatlarına uyğunlaşdırılmır.Şagirdin şəxsi təcrübəsi, onun təlabatları, maraqları, qabiliyyətləri və fərdi xüsusiyyətləri nəzərə alınmır. Bu cür prosesin nəticəsində heç kim əmin ola bilməz ki, bütün şagirdlər bu bilikləri lazımı səviyyədə dərk edəcək. Şagirdin hazır bilikləri mənimsəməsi nəinki onun təfəkkürünün inkişafı üçün stimul yaratmır, eyni zamanda idrak prosesini kütləşdirir, uşağı yaradıcılıqdan, sərbəstlik, müstəqillik, təşəbbüskarlıq kimi keyfiyyətlərdən məhrum edir. Nəticədə təlimin səmərəliliyi azalır, çünki onun keyfiyyəti şagirdin əqli qabiliyyətinin və hafizəsinin inkişaf səviyyəsi, idrak motivasiyasının olub – olmaması kimi psixoloji amillərdən birbaşa asılı olur.

Ənənəvi təlim sisteminin ən mürəkkəb problemlərindən biri istifadə olunan pedaqoji texnologiyaların konservatizmi, qeyri-çevik olmasıdır. Müasir informasiya – kommunikasiya dövründə elmin müxtəlif sahələrində toplanmış bilik kütləsi elə sürətlə artır ki, təlimin ənənəvi sxem və prinsiplərinə əsaslanaraq onları həm öyrənənə çatdırmaq, həm də mənimsətmək, əslində qeyri-mümkün işə çevrilir. Əgər əvvəllər bilikləri əldə etmək üçün şagirdi iki əsas bilik mənbəyi (müəllim və dərslik) qane edirdisə, bu gün həmin mənbələr çoxsaylı məlumat mənbələri ilə müqayisədə geridə qalır. Bu səbəbdən müasir təlimin başlıca vəzifələrindən biri öyrənməyi

öyrətməkdir, yəni şagirdləri bilikləri müstəqil əldə etməyə yiyələndirməkdir, biliklərdən çox biliklərin əldə edilməsi yollarını öyrətməkdir. Yalnız təlim metodlarının keyfiyyətcə dəyişdirilməsi, onların şəxsiyyətə, onun tələbatlarına yönəldilməsi, bilikləri mənimsəmə zamanı yaradıcı təfəkkürdən fəal istifadə edilməsi şəraitində təkim böyük səmərə verə bilər. Eynizamanda, şəxsiyyətyönümlü tədris prosesi inkişaf proseslərinin keyfiyyətinə də təsir edəcək: idraki və sosial fəallığı artırmaqla şəxsiyyətin dəyərlərini və vərdişlərini formalaşdıracaqdır.

İnteraktiv təlim metodunun tədris prosesinə daxil edilməsi şagirdlərin passivliyinin aradan qaldırılmasına, lazım olan təfəkkür xüsusiyyətlərinin və yaradıcılığın formalaşdırılması və təlim keyfiyyətinin yüksəldilməsinə şərait yaradır. Təlimin səmərəliliyi (daha az müddətdə daha çox informasiyanı mənimsəmək imkanı) xeyli artır: şagirdlərin idrak fəaliyyəti və təlim motivasiyası hesabına; təfəkkürə əsaslanaraq biliklərin müstəqil, məhsuldar və yaradıcı şəkildə əldə edilməsi və mənimsənilməsi sayəsində. Bu metodla keçilən dərslər şagirdlər üçün çox maraqlı və cəlbedici olur. Fəal interaktiv təlim həm təlimin məzmununun öyrənilməsini, həm də bu məzmunun tətbiqini daha səmərəli edir, şagirdlərin dərketmə fəaliyyətini daha da fəallaşdırır. Şagirdlərin öyrənməyə həvəsi və nailiyyətləri artdıqca, müəllimin də fəaliyyəti yüngülləşir. Lakin bu o demək deyil ki, müəllimin zəhməti azalır. İnteraktiv təlim əslində dərsin hazırlanması və idarə edilməsi üçün müəllimdən böyük zəhmət , işgüzarlıq və yaradıcılıq tələb edir.

Qeyd etmək lazımdır ki, interaktiv təlim metodlarından hər bir mövzunun tədrisində istifadə etmək məsləhət görülmür. Dərsdə qarşıya qoyulan məqsəd, şagirdlərə veriləcək bilik, bacarıq və vərdişlərin məzmunu, xarakteri, inteqrasiya imkanları, şagirdlərin hazırlığı, yerli şərait, məktəbin maddi bazası və s. nəzərə alınmaqla interaktiv priyomlara müraciət edilməlidir. İnteraktiv metodlar təlimin keyfiyyətini xeyli dərəcədə yüksəldir, şagirdlərdə yeni idraki və əxlaqi keyfiyyətlər formalaşdırır. Məsələn; söylənilən fikirlərə hörmət etməyi, müstəqil, tənqidi və yaradıcı düşünməyi, kollektivin fikrinin formalaşmasında fəallıq, işgüzarlıq göstərməyi, birgə qərar verməyi, emosional situasiyada özünü ələ almağı, özünü idarə etməyi, ədalətləyanaşmağı bacarmaq və s. İnteraktiv metodlarla keçilən dərslərdə şagirdlərdə hər şeyi bilmək həvəsi, təşəbbüskarlıq yüksəlir, onların öyrənmə fəallığı, təlimin keyfiyyəti və səmərəliliyi artır, nəticədə mexaniki yaddaş deyil, yaradıcı təfəkkür inkişaf edir. İnteraktiv təlim bilik, bacarıq, təcrübə və vərdişlərə yiyələnməyə, cəmiyyətin vətəndaşları üçün zəruri sosial və intellektual təfəkkürün, müstəqil çalışma, müstəqil düşünmə bacarığının inkişafına kömək edən demokratik üsullarla aparılan təlim prosesidir. İnteraktiv təlim prosesində dərsdə yaranan, meydana çıxan şagirdlərarası öyrənmə - öyrətmə ünsiyyəti və əməkdaşlığı, müəllim – şagird birliyi və əməkdaşlığı nəzərdə tutulur. İnteraktiv metodlar təlim prosesində öyrənmə və anlaşmaya, bacarıq və keyfiyyətlərə şagirdlərin yiyələnməsini həyata keçirən üsullar, tərzlər, işlər, yanaşmalar, vasitələrdir. İnteraktiv təlim prosesində ilk baxışdan elə görünə bilər ki, müəllim sinifdə fəal rol oynamır. Əslində isə müəllim şagirdi ruhlandıran, ona özünü tapmaqda kömək edən “yaradıcıya” çevrilir. İnteraktiv metodlar müəllimin təkcə başqalarını öyrətməsinə deyil, onun özünün öyrənməsinə, daha yaradıcı və enerjili pedaqoq olmasına imkan verir.(5)

Fəal təlim zamanı müəllim və şagirdlər qoyulmuş təlim problemini birgə qarşılıqlı fəaliyyət əsasında həll etməyə çalışır, əməkdaşlıq edir. Dərs kiçik tədqiqata bənzəyir, şagirdlər bilikləri müstəqil əldə edir, müəllim isə şagirdləri lazımi istiqamətə yönəldir. Biliklərin müstəqil kəşf və mənimsəməsi üçün müəllim lazımi şərait yaradır: fikri təhrik edir, məlumatla təmin edir, təşkilatı və psixoloji dəstək verir. Bütün dərs ərzində şagirdlərin fəal dərketmə mövqeyinin saxlanması üçün müəllim təfəkkürünü formalaşmasına əsaslanır. Müəllim şagirdlərə hörmətlə və etimadla yanaşır, şagirdlər arasında da qarşılıqlı hörmət münasibətini dəstəkləyir.

İnteraktiv təlim metodlarının tətbiqi müasir dövrün şagirdlərinə bir sıra geniş imkanlar yaradır. Belə ki, müasir məktəbin şagirdləri əvvəlki şagirdlərlə müqayisədə, qarşıya çıxmış problemləri həm tək, həm də qrup və kollektivlə həll etmək bacarığına malikdirlər. İndi texnologiyanın inkişafı şagirdlərə lazımi informasıyanı geniş məlumat mənbələrindən əldə etməyə imkan verir. Şagirdlərin axtarıcılıq və müstəqillik vərdişləri formalaşır, qazanılmış biliklər uğurla təcrübədə tətbiq edilir.

Fəal təlim şagirdlərin idrak fəaliyyətinin təşkili və idarə olunması metodlarının məcmusudur. Fəal təlimdə müəllim və şagirdlərin hüquqları bərabər olduğundan müasir təlim metodları demokratik metod sayılır. Yeni yanaşmanın mahiyyəti onunla ifadə olunur ki, şagirdlərin yaddaşı hazır informasiya ilə zənginləşdirilmir, biliklər müstəqil qazanılır, təfəkkür inkişaf etdirilir.

Dərsdə interaktiv təlim metodlarının və üsullarının tətbiqi tədris prosesinin intensivliyini yüksəldir, tədrisi hər bir şagird üçün əhəmiyyətli və maraqlı edir, dərsdə fəallığın daim yüksək olmasına zəmin yaradır və nəticədə təlimin inkişafetdirici yönümünü xeyli dərəcədə gücləndirir.

İnteraktiv təlim metodları hər bir mövzunun xarakterinə uyğun tətbiq edilir və dərslərin maraqlı keçməsində müstəsna rol oynayır. Fəal təlimin ən böyük üstünlüyü ondadır ki, bu üsul gənclərə daim dəyişən şəraitə

"Dəlilik" mövzusunun dünya ədəbiyyatında çox işlənməsinə baxmayaraq, Pinterin "Gözətçi" pyesi orijinaldır. Azərbaycan dramaturgiyasında da bu mövzu çox uğurlu alınıb. Elçinin "Dəlixanadan dəli qaıb", "Mənim ərim dəlidir", "Qatil", "Şekspir" və b. əsərlərində "ağıllılar və dəlilər" yeni rakursdan işlənir. Elçin C.Məmmədquluzadədən sonra bu mövzuya bir neçə əsərində geniş şəkildə müraciət edir. C.Məmmədquluzadənin "Dəli yığıncağı" əsərində dəliləri müalicə etməyə gələn həkim Lalbruz xəstələrlə ünsiyyət qura bilmir, çünki özü laldır. Yaşar Qarayevin fikrinə görə, Mirzə Cəlil əsərlərindəki fəlsəfi ironiya ilə, mətnaltı məna qatı ilə, təltəlşüur ifadə, üslub tərzi ilə o, özündən çox-çox sonrakıları - Platonovu, Bulqakovu, Markesi qabaqlayır. Halbuki "Ölülər"də, "Dəli yığıncağı"nda Qoqolla yanaşı, İoneskonu, Sartrı xəbər verən aşkar novator cizgilər və şəksiz modern əlamətlər var! Tədqiqatçı tam doğru olaraq M.F.Axundzadənin maarifçi surətlərinin nadan ziyalı obrazları ilə əvəzlənməsi qənaətinə gəlir. "Dəli yığıncağı"na həyatımızın müxtəlif sahələrində rast gəlmək mümkündür (2013: 1;4). "Bu pyeslərdəki ağıllı "dəlilər", sərsəm "ağıllılar" dövrün öz həqiqətidir" (Paşayeva, 2004: 106). Həqiqətən də, dram əsərlərinin qəhrəmanları öz dövrünün güzgüsü rolunu oynayır. Elçinin "Şekspir" dramında dəlixanadan qaçan dəlilər özlərini tarixi şəxsiyyət hesab edirsə, Pinterin "Gözətçi" əsərində "ağıllı" Devis sərsəmləyir, "dəli" Aston isə ağıllı təkliflər verir, evini təmir edəcəyi, anbar tikəcəyi haqda planlar qurur. Cəmiyyətin dəli kimi qəbul etdiyi personaj pyes boyunca heç bir nevrotik pozuntu halı nümayiş etdirmir, hətta Astonun arzu və gələcək planları haqqında eşidəndə onu tam normal qarşılayırıq.

Devis evsiz-eşiksiz, kimsəsi olmayan bir qocadır, cəmiyyət içərisində özünü apara bilməyən, hamıya qarşı əks mövqedə duran, hirsli, aqressiv, hörmətə layiq olmayan bir tipdir. Devisin fantaziyaları - Sidkapa gedib tanışında olan sənədlərini gətirmək və bununla guya nəyəsə nail olmaq xəyalı gülüncdür, həm də onun faciəsidir. İnsan öz imkanlarını qiymətləndirə bilmir, öz qüvvəsini düzgün hesablamır.

Dünya haqqında xəyallarının boş ümidə çevrilməsi əlaqə və ünsiyyətin çatışmazlığı kimi izah edilə bilər. Personajların qeyri-sabit psixoloji durumu mütləqiyyət üsuli-idarəli dövlətlərin vətəndaşlarının halını xatırladır. Fərdlərin özünü köməksiz hiss etməsi və sərbəst qərarlar qəbul edə bilməməsi ("Birhtday party", Stenli), özünə lazımi dəyəri verə bilməməsi, təhqir edilməmək və alçaldılmamaq üçün ünsiyyət qurmaqdan çəkinməsi ("Family voices", cavan oğlan), eyni zamanda idarə olunmaq istəməyən və məqsədinə çatmaq üçün ətrafdakılara ehtiyac duyulması ("A night out", Albert) kimi şəxsiyyət pozuntusu adını alan problemlər Pinter obrazlarının xarakterində əksini tapır.

Pinter yenə də hadisələrin cərəyan etdiyi məkan kimi otağı seçir. Tamaşaçı otaqdan kənarda baş verənləri arzu, istək və fantaziya kimi qəbul edir. Otaq və Astonun psixoloji durumundakı qarışıqlıq müqayisə edilə bilər. Şüuru müdaxilə görən qəhrəman dülgərlik etməklə əşyalar üzərində sanki həmin prosesi həyata keçirir. Əsərdə hər üç obraz təmir-tikinti işləri aparmaq istəyi ilə məkanı dəyişdirməyə cəhd göstərir. Məkanla insanların daxili aləmi arasındakı əlaqənin mövcudluğu təsvir edilməklə xaotik dünya canlandırılır.

Hər qəhrəmanın özünəməxsus danışıq tərzi var, onlar sözlərdən təzyiq vasitəsi kimi istifadə edirlər. Pyesdə dialoq və monoloqlar gündəlik ehtiyac və qayğıları əhatə edir. Bununla da dramaturq həyatın absurdluğunu göstərməyə çalışır. Müəllif qəhrəmanlarının daxili aləminə, hislərinə, eləcə də psixologiyalarına xüsusi diqqət yetirməyə başlayır. Mənəviyyatların konflikti, qəhrəmanların düşüncə və fikirlərinin xırdalıqlara qədər təsviri, hadisələrin çox yavaş tempdə inkişafı "Gözətçi"yə psixoloji dram statusunu qazandırır. İngilis tənqidçisi Martin Esllin bu əsərdə simvolizmin əlamətlərini axtararaq iki qardaşı iki başlanğıc, iki qüvvə-xeyir və şərin təcəssümü hesab edir, hətta Bibliya qəhrəmanları və anlayışlarından istifadə edərək pyesi təhlil edir (2010: 31-94). Devisin Astonun mənzilindən atılması Adəmin cənnətdən qovulması kimi dəyərləndirilir. Süjetin real əsası simvolik moralite içərisində əriyib itir. İntibah dövründə moralite adlanan tamaşalarda olduğu kimi iştirak edənlər insanlar deyil, abstrakt anlayışlardır.

Reallaşması mümkün olmayan anlayış, ad, iştirakçı abstrakt olaraq təxəyyülümüzdə yaranan xəyali dünyadır, virtual reallıqdır. Virtual dünyası cəmiyyət tərəfindən düzgün qəbul edilməyindən Aston "dəli" hesab edilir. Xeyirxahlıq etməyə çalışan, Devisin halına acıyaraq onu evinə gətirməsi xüsusiyyətlərinə görə Astonu xeyirin təmsilçisi kimi qələmə verməyə məcbur oluruq. Kobudluq edən, hər kəsə şübhə ilə yanaşan, Astonun kədər və bədbəxtlik gətirdiyini bəhanə edərək onu evdən qovmaq istəyən Mik sanki şəri səciyyələndirən qüvvədir. Devis isə mənəviyyatsız, yalançı, səfeh etirazları və xəyanətkar təbiəti ilə hamını bezdirən narahat bir tipdir (Pinter, 2010: 419-483).

"Ad günü" pyesində olduğu kimi "Gözətçi"nin finalında faciə vasitəsi kimi zorakılıqdan deyil, qaranlıqdan istifadə edilir. Qaranlıq nədir? İşıqdan məhrum olmaq, işığın yoxluğu, zülmət mənasında işlədilir. Anlaşılmaz, aydın olmayan, bəlli olmayan məsələ haqqında danışılanda qaranlıq məsələ deyirlər. Cəhalət, mədəni gerilik, mədəniyyətsizlik, heç nə bilməmək mənalarında da istifadə olunur. Fikrimizcə, nadanlıq, cahillik təzyiq və zorakılıqla müşayiət olunduğundan dramaturq qaranlıq otaqda Devisin təşvişə düşməsini, özünü bıçaqla qorumağa çalışmasını, çox gülməli vəziyyətə düşməsini bu hallarla əlaqələndirir.

Qarşındakı təhlükəni görə bilməmək, qorxu, həyəcan və acizlik hissi yaratmağın özü arxa planda zorakılığın olduğunu göstərir.

Qorxu və fobiyalar müxtəlif olur. Qaranlıqdan qorxmaq psixologiya elmində akluofobiya adlanır. Həmin insanlar qaranlıq məkanlara düşərsə, ürək döyüntüsü sürətlənir, tərləmə, titrəmə, başgicəllənmə, qan təzyiqinin artması, nəfəsalmada çətinlik və s. halları özünü göstərir. Devis "qaranlıq"la mübarizə aparmaq üçün bıçaqdan istifadə etmək qərarına gəlir. Bıçaq özü də qorxu və zorakılıq yaratmaq üsulu hesab edilir. Pinter qaranlıq qorxusu səhnəsindən faciə vasitəsi kimi istifadə edir.

Qorxunun başqa bir növündən də əziyyət şəkən Devis yad hesab olunan insanlara qarşı nifrət bəsləyir. Ksenofobiya adlanan bu problem insanların fərqliliklərindən irəli gəlir, yəni özünə oxşamayanı təhlükəli hesab etmək düşüncəsi ilə yaranan qorxudur.

## Xəyal gücü və fantaziya məntiqsizlikdən qaçmanın bir yolu kimi

Pinter 1952-1956-cı illərdə - pyes yazmağa başlamadığı dövrlərdə "Cırtdanlar" (*"Dwarfs"*) romanını yazır, amma sonradan yenidən üzərində işləyərək 1992-ci ildə nəşr etdirir. 1960-cı ildə isə həmin süjeti radiopyes kimi qələmə alır. Müharibədən sonrakı Britaniyada gənclərin həyatı və problemləri təsvir edilir. Pyesdə romanın əsas obrazlarından biri Virciniya iştirak etmir. Roman pyesi xatırladaraq dialoq və monoloqlardan ibarətdir. Qısa həcmli pyes tamamilə abstrakt tərzdə yazılır. Mücərrədləşmə obrazın öz xəyal aləmi ilə baş-başa qaldığı zamanlar daha qabarıq görünür.

Mark Gilbert təsadüfi aktyor və diqqət cəlb edən tipdir. Pit Koks qapalı, laqeyd, şəhərdə işləyən ziyalı təsiri bağışlayır. Len Vaynşteyn dəmiryolunda yükdaşıyan uğursuz musiqiçi, çoxdanışan fantastdır. Pyesi oxuduqca hər üç personajın psixoloji durumunda problemin olduğu qənaətinə gəlirik.

Len hallüsinasiyalardan əziyyət çəkir, özünü siçan əti yeyən cırtdanlar arasında görərək onlardan qorxur və dediklərini həyata keçirir. Görüntülər çəkilən zaman pis olur, özünə yer tapa bilmir. Lenin reallığı qəbul etməsi daima dəyişir, yəni "otaq" probleminə yenidən toxunulan zaman otağın ölçüsünün müəyyən ardıcıllıqla deyil, necə gəldi dəyişməsi qəhrəmanı narahat edir. Çırtdanlar Lenin təsəvvürlərinin məhsuludur, onun daxili "məkan"ında kiçik varlıqlar gözəgörünməz şəkildə yaranır. Onların peyda və yox olması personajdan asılıdır, həm də çırtdanlarla tüstü vasitəsilə işarə verərək əlaqə yaradır (Harold Pinter The Chaotic Energies of Youth,The Dwarfs, 2015: 149-151). "Gəncliyin xaotik enerjisinin qaçan simvolu" hesab edilən cırtdanlar oranı tərk edib gedəndə Lenin məyus halda söylədiyi monoloq diqqətimizi çəkir. Lenin otağında yaşayan Piti və Mark dostlar arasında münasibəti pozmağa çalışır. Əsər şüurun normal təsəvvürlərə malik olmaması probleminə həsr edilir.

Leni Aston ("Gözətçi") və Stenli ("Adgünü") kimi xəyal aləmindən qoparırlar, şəxsi təsəvvürlərə malik olmağa qoymurlar. Müalicə Len və Astonu fantaziyalardan məhrum edir, bu da onların həyatının bir hissəsinin məhv edilməsi deməkdir. Stenli də öz fantaziyaları ilə xoşbəxt olduğu halda onu bu aləmdən uzaqlaşdırırlar.

Otaqda əşyaların yerləşdirilməsi ilə Lenin təfəkkürü arasında əlaqə nəzərə çarpır. İşığın söndürülməsi və yandırılması ilə hadisələr müxtəlif istiqamətdə cərəyan edir. Sözlərin omonim mənasından istifadə edərək ikiqat effekt yaradılır. Mark sözü ingilis dilində işarə, nişan, iz deməkdir. "Pete sits where Mark has been". Bu cür işarələrlə hərəkətlərin inkişaf məqsədi aydın olur. Remarkada "Swift blackout" sözləri ilə Lenin cırtdanlar barədə təsəvvürləri Conatan Sviftin "Qulliverin səyahəti" adlı romanındakı liliputlarla "sürətli" (swift-ing. dilində tez, sürətli deməkdir) şəkildə, bir göz qırpımında müqayisə edilir. Evi mühafizə edən və hər şeyi görən çırtdanlar ilə diqqətli oxucu və ya tamaşaçı tərəfindən müşahidə edilən bu nüans qiymətləndirilir.

A.P.Çexov yaradıcılığına istinad bədii oyun kimi diqqəti cəlb edir. Qağayının öldürülməsi və Pitin ona çevrilməsi səhnəsində Çexov pyesindəki məqamdan istifadə edilir (Доценко 2010: 29-33).

Elçinin "Poçt şöbəsində xəyal" tragikomediyasında Ədilə də Len və Aston kimi hallüsinasiyalardan əziyyət çəkir, onların psixoloji vəziyyəti oxşardır. Seyfəddin Eyvazova görə, əsərdəki Kişi – hər şeyi bilən bu adam - ali həqiqətmi, vicdanmıdır? Hər halda, həqiqətləri çılpaq deyən bir obrazdır (Eyvazov, 2008: 60). Həyatın yeknəsəkliyi, cansıxıcılığı Ədilənin tənhalığına səbəb olur, bu tənhalıqdan yaxa qurtarmağa kömək edən xəyali surət isə əslində öz daxili səsidir. Lenin də illüziya və təsəvvürləri onun daxili səsi kimi qəbul edilə bilər. O, reallığı təhrif olunmuş şəkildə canlandıraraq aldadıcı duyğular yaşayır, həyata keçməyən arzularının qanadında özünü rahat hiss edir.

Len qırılmış güzgünü və ya qırmaq istədiyi güzgünü görə bilmir, görə bilmədiyi bir şeyi necə qıra biləcəyini düşünür (Pinter, 2013: 92-126). Güzgünün əks etdirmə xüsusiyyətindən istifadə edilərək Lenin daxili aləmində baş verən təlatümlər tutuşdurulur.

Pauzaların sayı çoxdur, Pinter hesab edir ki, susmaqla fikirləri daha düzgün və daha dəqiq bildirmək mümkündür. Danışan zaman insanlar maskalanaraq həqiqəti gizlədə bilir, qarşısındakını yanlış fikirləşməyə məcbur etmiş olurlar. "Susmaq Pinterə görə - işarədir, hansı ki, deyilmir, lakin söhbət zamanı həmişə iştirak edir. İnsan sözlərlə əsl niyyət, qəzəb, alçaqlığını gizlətməyə çalışır, hansı ki, xarici təhlükəni hiss edən kimi sivilizasiya maskası altında gizləndiyi aşkara çıxır" (Идлис, 2005: 3, 6).

Öz çaşqınlığını dərk edən obraz inam, məqsəd və arzularının əksinə gedərək mühitə uyğunlaşmağa məcbur olur. Bu mühitdə isə dünyəvi qanun-qaydaların məntiqi məlum deyil. Məntiqsizlik isə onları laqeyd və aqressiv vəziyyətə salır. İnsanların eqoizmi qarşılıqlı anlaşmaya mane olur, nəticədə mübahisələr, fikir toqquşmaları baş verir ki, nəticədə onlar öz xəyal aləmləri ilə tək-tənha qalırlar.

## Nəticə

Öz çaşqınlığını dərk edən obraz inam, məqsəd və arzularının əksinə gedərək mühitə uyğunlaşmağa məcbur olur. Bu mühitdə isə dünyəvi qanun-qaydaların məntiqi məlum deyil. Məntiqsizlik isə onları laqeyd və aqressiv vəziyyətə salır. İnsanların eqoizmi qarşılıqlı anlaşmaya mane olur, nəticədə mübahisələr, fikir toqquşmaları baş verir ki, nəticədə onlar öz xəyal aləmləri ilə tək-tənha qalırlar.

"Otaqlar"ına qayıdan personajlar gündəlik məişət qayğıları ilə üzləşirlər. Pinter isə onların siyasi-sosial fəaliyyətini deyil, psixoloji vəziyyətini təsvir edir. Dramaturq özünü sərt realist hesab edir, onun qəhrəmanları həyat reallıqlarına uyğunlaşma və ya ona qarşı durmaq mərhələsindədir. Onun pyeslərində personajların həyatının bir neçə günü, yəni çox qısa dövrü təsvir olunur. Bu insanların həmin andakı düşüncələri və illüziyaları əsas götürülür, şəxsi həyatları və ictimai fəaliyyətləri qaranlıq qalır. Absurd dramaturgiyanın qaydalarına uyğun olaraq obrazlar vacib olmayanı müzakirə edirlər, təsadüfi hadisələri gündəmə gətirirlər ki, sözlərinin etibarsızlığı və mənasızlığı ortaya çıxır. Hətta özləri belə dolayı yolla deyilmiş sözlərə inanmır və vacib olanı fasilələr vasitəsilə çatdırırlar.

## Ədəbiyyat

1. Qarayev Yaşar (2013). *Nəsrin və səhnənin ağrı yaddaşı-Cəlil Məmmədquluzadə,* Ədəbiyyat, 12 aprel.
2. Paşayeva Nərgiz (2004). *Yeniləşən ədəbiyyatın yeni insanı. (xalq yazıçısı Elçinin yaradıcılığı əsasında),* Bakı, "ATİ" nəşriyyatı, 224 s.
3. Эсслин, Мартин (2010). *Семюэль Беккет. В поисках себя,* (Эсслин М.Театр абсурда. Пер. с анг. Г. Коваленко) СПб., Балтийские сезоны, с. 31-94.
4. Pinter H. *Seçilmiş əsərləri*. Bakı, "Şərq-Qərb", 2010, 632 s.
5. Harold Pinter The Chaotic Energies of Youth,The Dwarfs.
https://www.faber.co.uk/blog/wp-content/uploads/2015/09/Imlah_extract.pdf
6. Доценко Е.Г. (2010). *«Выбывший из игры»: сочинители историй в пьесах А.Чехова, Г.Пинтера и М.Равенхилла*, Филологический класс. № 24, с.29-33.
7. Eyvazov, Seyfəddin (2008). *Xalq yazıçısı Elcinin dramaturgiyası,* Bakı, ADPU nəşriyyatı, 208 s.
8. Pinter H. *Plays 2*/H.Pinter. – London: Faber & Faber, Incorporated, 2013, 238 p. https://www.booktopia.com.au/harold-pinter-plays-2-harold-pinter/ebook/9780571300785.html
9. Идлис, Юлия (26.10.2005). *Гарольд Пинтер: «Убийство автора ради наследство Нобеля»*, Книжное обозрение, 2005, № 43 (2053), с.3, 6.

**Rəyçi: prof. N.M.Sadıqova**

Göndərilib: 10.02.2021 Qəbul edilib: 17.02.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/72-75

**Rəvanə İbrahim qızı Abbasova**
Bakı Dövlət Universiteti
magistrant
aqliyev@mail.ru

# CƏNUBİ QAFQAZDA GEOSİYASİ VƏZİYYƏT

***Açar sözlər:*** *II Qarabağ Müharibəsi, Forpost ölkə, Uğurlu strategiya, geosiyasi çəki, iqtisadi böhran, Geosiyasi səhnə, qlobal meyllər*

## Geopolitical situation in the South Caucasus

**Summary**

The article discusses the importance of geopolitical weight in modern times, provides information about the geopolitical landscape of the new era. The geopolitical realities of a number of processes taking place here are discussed in the interest of a number of countries in the Caucasus, both in and out of the region. It reflects the interests of Western countries in the region, as well as Azerbaijan's position in the Caucasus and the processes taking place there. Also touched upon the events that took place during the Second Karabakh War in 2020.
***Key words:*** *II Karabakh War, Outpost country, Successful strategy, geopolitical weight, economic crisis, Geopolitical scene, qlobal trends*

## Giriş

XX əsrin sonlarından başlayan dünyanın bir qütbdən idarə olunması qlobal miqyasda müxtəlif istiqamətli radikal meyllərin artmasına səbəb oldu və bunun qarşılığında ortaya atılan "fobiya" lar geosiyasi mühitdə əsas trendə çevrildi. Hazırda davam etməkdə olan qlobal iqtisadi böhranı və bəşəriyyətin qarşılaşdığı mənəvi tənəzzülü də bura əlavə etsək, təkqütblü dünya nizamının uzun müddət davam gətirə bilməyəcəyini aydın görmək mümkündür.

Yeni dövrün geosiyasi mənzərəsində Qafqazda artıq çoxqütblü dünya nizamının formalaşması istiqamətində yeni bir proses gedir. Bu isə geosiyasi həssas regionlarda daha çox hiss olunur. Baş verməkdə olan proseslər böyük-kiçikliyindən asılı olmayaraq bütün ölkələr üçün müstəsna əhəmiyyət kəsb edir. Yeni dövrün tələblərinə uyğun olaraq ölkələrin təbii ehtiyatları, coğrafi mövqeyi, insan resursları, iqtisadi potensialı ilk növbədə dövlətin geosiyasi çəkisi ilə müqayisədə hər hansı bir rola malikdir. Doğrudur, sadaladığımız amillər hər bir ölkənin inkişafı üçün vacibdir. Lakin milli maraqlara söykənən müstəqil xarici siyasəti olmadan həmin ölkə geosiyasi çəkiyə yiyələnə bilməz. Hansı siyasi dayağa və ya iqtisadi potensiala malik olmasından asılı olmayaraq müstəqil xarici siyasət kursu olmayan forpost ölkələrin geosiyasi çəkisi də ola bilməz. (1)

Digər tərəfdən, çoxqütblü dünyada müxtəlif güc mərkəzlərinin rəqabəti və nüfuz müharibəsi ilə müşayiət olunması təbii prosesdir. Bu isə geosiyasi həssas regionlarda öz təsirini daha çox göstərir. Henri Kissencer, Zbiqnev Bjezinski, Samuel Hantinqton da daxil olmaqla bir çox məşhur siyasi təhlilçilər Qafqaz regionunu belə geosiyasi bölgələr sırasına daxil edirlər. Müxtəlif sivilizasiyaların, mədəniyyətlərin, dinlərin təmsilçilərinin yanaşı yaşaması regionun həssaslığını bir az da artırır. Müqayisə üçün qeyd etmək olar ki, Avrasiya materikində Qafqaz qədər həssas region olaraq yalnız Balkan və Mərkəzi Asiya regionlarını göstərmək olar. Təsadüfi deyil ki, qlobal geosiyasi mühitdə transformasiya mərhələsi yaşayan yeni dünya nizamında hər üç region qaynar bölgə hesab olunur və etnik-dini münaqişələr davam edir. (2)

Əvvəla onu qeyd edək ki, regional və qlobal mübarizənin oyunçuları ilə bağlı 22 il öncəki proqnozlar özünü tam doğrultmamışdır. Nə AB, nə də Yaponiya 1991-ci ildə onlardan gözlənilən rolu sonrakı illərdə təmin edə bilməmiş, əvəzində meydana həm yeni güclər çıxmış, həm də meydana çıxacağı gözlənilən bəzi güclər daha sürətli inkişaf yolu keçmişdir. AB həm genişləmənin gətirdiyi inteqrasiya problemləri, həm də düzgün olmayan daxili iqtisadi sistemin və qlobal iqtisadi böhranların təsiri ilə artıq bir neçə ildir ki, iqtisadi poblemlərini həll edə bilmir. Yaponiya da bir neçə regional və qlobal iqtisadi problemin öhdəsindən tam gələ bilməmiş və 2003-cü ildən sonra sürətlə artan neft qiymətlərinin ağır təsirini hiss etmişdir. Buna ardıcıl olaraq yaşadığı təbii fəlakətlərin ağır nəticələrini də əlavə etmək mümkündür.

Onların əvəzində Çin ilə yanaşı həm də Hindistan və Braziliyanın qlobal, Türkiyənin regional imkanları artmış, beynəlxalq sistemdə Qərb qurumlarına alternativ kimi Rusiya və Çinin liderlik etdiyi Şanxay

Əməkdaşlıq Təşkilatı və BRICS (Braziliya, Rusiya, Hindistan, Çin və Cənubi Afrika Respublikasının ingilis dilində adlarının baş hərflərindən ibarət olan qısaltma) adı daha çox hallanmağa başlamışdır.

Keçən müddət ərzində Cənubi Qafqaz həm özünün birbaşa malik olduğu dəyərlər (strateji coğrafi mövqe, təbii ehtiyatlar və s.), həm də Qara dəniz, Xəzər hövzəsi, İran və Orta Asiya kimi qlobal siyasi mübarizənin əsas sahələrinə yaxınlığı səbəbindən əhəmiyyətini mütəmadi olaraq artırmışdır. Bu mənada ABŞ tərəfindən də böyük əhəmiyyət verilən Avropanın enerji təhlükəsizliyinin təmini prosesində (neft və təbii qazın həm mənbəyi, həm də keçiş yolu kimi) oynamağa başladığı rol Cənubi Qafqazın Qərbin gündəliyindəki yerini möhkəmləndirmişdir. ABŞ və müttəfiqlərinin 11 Sentyabr hadisələrindən sonra Əfqanıstandakı hərbi mövcudiyyəti Qərb üçün; İranın digər istiqamətlərdən maksimum təcridə məruz qalması isə İran və Rusiya üçün Cənubi Qafqazın qeyri-enerji sahəsindəki tranzit əhəmiyyətini artırmışdır. Bu siyahıya şərti olaraq "Ərəb baharı" kimi də adlandırılan prosesin yayıla biləcəyi coğrafiya ilə bağlı müxtəlif proqnozları, Suriyadakı prosesləri və İran ilə bağlı ssenariləri də əlavə etmək olar. Bütün bunlar isə önümüzdəki mərhələdə region uğrunda mübarizənin daha da dərinləşəcəyini göstərir. Ola bilsin ki, bu mübarizə özünü 2003-cü ildə Gürcüstanda baş vermiş "rəngli inqilab", ya da 2008-ci ilin avqustunda Rusiyanın Gürcüstan ərazilərini ələ keçirməsində olduğu kimi ani hərəkətlər şəklində göstərməyəcək. Amma mübarizənin dərinlik və genişlik (çoxşaxəlilik) qazanaraq davam etməsi qaçınılmazdır.

Qafqaz yeni dünya nizamında xüsusi əhəmiyyətə malik regiondur. Qlobal və regional güc mərkəzləri Qafqazda öz təsir dairələrini yaratmağa çalışırlar. Belə bir şəraitdə müstəqil və balanslaşdırılmış xarici siyasət yeritmək olduqca çətindir. Bu prizmadan yanaşdıqda yalnız havadarlarının siyasi xəttini yerinə yetirən və bu missiyasından öz mənafeyi üçün istifadə etməyə çalışan Ermənistan forpost ölkədir. Əhalisinin yüksək sürətlə ölkədən qaçması, strateji iqtisadi subyektlərinin xaricilərin əlində olması Ermənistanın geosiyasi tərəzidə heç bir çəkiyə malik olmayan mövqeyini müəyyənləşdirir. Gürcüstan isə xarici siyasət kursunda ifrat dərəcədə bir qütbə meyilli olduğu üçün problemlərlə qarşılaşır. Regionda balanslaşdırılmış xarici siyasət, çoxvektorlu əməkdaşlıq, bərabərhüquqlu tərəfdaşlıq və milli maraqlara söykənən müstəqil siyasi kurs Azərbaycanı Qafqazda geosiyasi çəkisinə görə fərqləndirir.

Ümumiyyətlə, müasir dövrdə milli dövlətlərin beynəlxalq münasibətlər sistemində mövqeyini möhkəmləndirən, nüfuzunu artıran başlıca strateji amil həyata keçirilən xarici siyasət kursunun səmərəliliyidir. Bu kontekstdə qeyd edə bilərik ki, çoxşaxəli, tarazlaşdırılmış xarici siyasət kursuna malik olan Azərbaycan Cənubi Qafqaz regionunun lider dövləti olmaqla yanaşı, müasir beynəlxalq münasibətlər sistemində etibarlı tərəfdaş kimi tanınır. Milli maraqlara müvafiq surətdə reallaşdırılan xarici siyasət sayəsində ölkəmiz həm ikitərəfli münasibətlər, həm də beynəlxalq təşkilatlar çərçivəsində səmərəli və qarşılıqlı faydalı əməkdaşlıq əlaqələri formalaşdırıb.

Qeyd etdiyimiz kimi, müstəqil milli inkişaf Azərbaycanın beynəlxalq münasibətlər sistemində nüfuzunu artıran əhəmiyyətli amildir. Sahib olduğu resurslardan səmərəli istifadə edərək qarşılıqlı faydalı əməkdaşlıq əlaqələri formalaşdıran ölkəmiz həm beynəlxalq təşkilatlarda, həm də ayrı-ayrı əməkdaşlıq platformaları çərçivəsində öz mövqeyini gücləndirir. Bu isə Azərbaycanın pozitiv beynəlxalq imicinin möhkəmlənməsinə müstəsna töhfələr verir.

Azərbaycanın beynəlxalq mövqeyi mütəmadi olaraq möhkəmlənməkdədir. Beləliklə, Azərbaycan özünün çoxvektorlu və balanslaşdırılmış xarici siyasət strategiyası ilə həm ikitərəfli münasibətlər kontekstində, həm də çoxşaxəli əlaqələr fonunda regional miqyaslı, qlobal xarakterli əməkdaşlıqlar platformasının mərkəzi oyunçusu rolunu oynamaqdadır. Ən əhəmiyyətlisi isə odur ki, bütün bunlar Azərbaycanın beynəlxalq mövqeyinin möhkəmlənməsinə, əməkdaşlığa əsaslanan tərəfdaşlıq münasibətlərinin inkişafına təkan verir, eyni zamanda, perspektiv nailiyyətlər üçün strateji zəmin rolunu oynayır. Həm də ölkəmizin milli maraqlarına uyğun olmaqla bərabər, Azərbaycanın suverenlik səviyyəsini, heç bir dövlətdən, təşkilatdan asılı olmadığını da təsdiq edir.

Azərbaycan regionda sabitləşdirici faktor kimi fəaliyyət göstərməklə bölgədə və beynəlxalq səviyyədə əməkdaşlıq və təhlükəsizliyə mühüm töhfələr verir. Bu kontekstdə son dönəmlərdə ölkəmizin iştirakı ilə gerçəkləşdirilən enerji layihələrinin əhəmiyyəti deyilənləri təsdiq edir. (3)

Prezident İlham Əliyev müşavirədə qlobal trendlər və bununla əlaqədar Azərbaycan Respublikasının qarşısında dayanan çağırışlara da toxunmuşdur. Resurslar uğrunda qlobal miqyasda mübarizə və ərzaq təhlükəsizliyi kimi qlobal trendlərin aktuallığı səsləndirilmişdir. Prezident bildirmişdir ki, "Dünyada indi resurslar uğrunda mübarizə gedir: enerji, su resursları uğrunda… Ərzaq təhlükəsizliyi enerji təhlükəsizliyi kimi, bəlkə də ondan da vacib olan məsələdir. İstisna edilmir ki, gələcək illərdə bu, əsas məsələlərdən birinə çevriləcəkdir. Çünki qlobal meyillər bunu göstərir."

Müasir dövrümüzdə içməli su mənbələrinin çatışmazlığı dünyanı təhdid edən qlobal problemlərdən biridir. Hesablamalara görə, hazırda dünyada təxminən 1,5 milyard nəfər içməli su çatışmazlığından əziyyət

çəkir. BMT-nin 1998-ci ildə bununla bağlı hazırladığı hesabatda göstərilir ki, 2050-ci ildə 65 ölkədə 10 milyard nəfərə yaxın əhali bu problemlə qarşı-qarşıya qalacaqdır.

Su problemi yeni minillikdə geosiyasi faktora çevrilmişdir. XXI əsrdə su geostrateji əhəmiyyətinə görə neftin XX əsrdəki yerini tuta bilər. Neft uğrunda aparılan gizli və açıq mübarizələrin və hətta müharibələrin yeni minillikdə su uğrunda olma ehtimalı da var.

Artıq dünyada su ehtiyatlarının yaratdığı dövlətlərarası gərginlik nöqtələri mövcuddur. İsraildən Hindistana, Türkiyədən Botsvanaya qədər su uğrunda mübahisələr münaqişələrə çevrilmək üzrədir. Yaxın Şərqdə Nil hövzəsində Misir-Sudan-Efiopiya, İordan çayı hövzəsində İsrail-Suriya-İordaniya, Dəclə və Fərat hövzəsində Türkiyə-Suriya-İraq və İran-İraq, Mərkəzi Asiya ölkələri arasında su münaqişələri daha aktualdır.

Beləliklə, ölkəmiz geosiyasi səhnədə hər keçən gün öz mövqelərini daha da gücləndirir. Artıq Azərbaycanın iştirakı olmadan regionda heç bir layihə həyata keçirilə bilməz. Azərbaycanın mövqeyi regional çərçivəni aşaraq daha böyük əhatə dairəsinə doğru genişlənməkdədir. Geosiyasi səhnədə yüksələn Azərbaycan qlobal trendlərə uyğun çevik xarici siyasət həyata keçirir və artıq xüsusi geosiyasi çəkiyə malik ölkəyə çevrilməkdədir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin ardıcıl, səmərəli və düşünülmüş fəaliyyəti sayəsində respublikamız yeni geosiyasi və iqtisadi üfüqlər fəth etmək əzmindədir. (4)

Onu da qeyd edək ki, sentyabrın 27-də əks hücum kimi başlanan və Vətən müharibəsi kimi xarakterizə edilən II Qarabağ müharibəsi 44 gün müddətində davam etdi. Müharibənin başlanğıcını isə 2020-ci ilin İyul ayında baş verən Tovuz döyüşləri qoydu. Üç gün çəkən bu döyüşlərdə Azərbaycan, general-mayor Polad Həşimov, polkovnik İlqar Mirzəyev və iki mayor olmaqla 11 hərbçisini itirdi.

Müharibə vəziyyətində Ermənistanda iqtisadi gərignlik yaşanmağa başladı. Erməni milləti Azərbaycan əsgərinin Dağlıq Qarabağa qayıtmasını həzm edə bilmədi və Azərbaycanı yalan xəbərlər yaymaqda ittiham etdi. Lakin 10 noyabrda Azərbaycan, Rusiya və Ermənistan arasında bağlanmış sazişə əsasən tərəflər Dağlıq Qarabağda atəşkəs elan etdi və bəyanat imzaladı. Bəyanatın şərtləri isə aşağıdakılar oldu:

1. 10 noyabr 2020-ci il tarixində Moskva vaxtı ilə saat 00.00-dan etibarən Dağlıq Qarabağ münaqişəsi zonasında atəşin və bütün hərbi əməliyyatların tam dayandırılması elan olunur. Bundan sonra Tərəflər adlandırılacaq Azərbaycan Respublikası və Ermənistan Respublikası hazırda tutduqları mövqelərdə qalacaqlar.
2. 20 noyabr 2020-ci il tarixinədək Ağdam rayonu Azərbaycan Respublikasına qaytarılır.
3. Dağlıq Qarabağda təmas xətti və Laçın dəhlizi boyu Rusiya Federasiyasının 1960 sayda odlu silahlı hərbi qulluqçusundan, 90 hərbi zirehli texnika, 380 ədəd avtomobil və xüsusi texnikadan ibarət sülhməramlı kontingenti yerləşdirilir.
4. Rusiya Federasiyasının sülhməramlı kontingenti erməni silahlı qüvvələrinin çıxarılması ilə paralel şəkildə yerləşdirilir. Rusiya Federasiyasının sülhməramlı kontingentinin qalma müddəti 5 ildir və müddətin bitməsinə 6 ay qalmış hazırkı müddəanın tətbiqinə xitam verilməsi niyyəti ilə bağlı Tərəflərdən hər hansı biri çıxış etməzsə, müddət avtomatik olaraq növbəti 5 ilə uzadılır.
5. Münaqişə tərəflərinin razılaşmalara əməl etməsinə nəzarətin səmərəliliyinin artırılması məqsədilə atəşkəsə nəzarət üzrə sülhməramlı mərkəz yaradılır.
6. Ermənistan Respublikası 15 noyabr 2020-ci il tarixinədək Azərbaycan Respublikasına Kəlbəcər rayonunu, 1 dekabr 2020-ci il tarixinədək isə Laçın rayonunu qaytarır. Dağlıq Qarabağla Ermənistan arasında əlaqəni təmin edəcək və bununla belə Şuşa şəhərinə toxunmayacaq Laçın dəhlizi (5 km. enliyində) Rusiya sülhməramlı kontingentinin nəzarəti altında qalır.

Tərəflərin razılığı əsasında növbəti üç il ərzində Dağlıq Qarabağla Ermənistan arasında əlaqəni təmin edən Laçın dəhlizi üzrə yeni hərəkət marşrutunun inşası planı müəyyən ediləcək və bununla da həmin marşrutun mühafizəsi üçün Rusiya sülhməramlı kontingentinin gələcək yerdəyişməsi nəzərdə tutulur.

Azərbaycan Respublikası Laçın dəhlizi üzrə hər iki istiqamətdə vətəndaşların, nəqliyyat vasitələrinin və yüklərin hərəkətinə təhlükəsizlik zəmanəti verir.

7. Daxili məcburi köçkünlər və qaçqınlar Dağlıq Qarabağın ərazisinə və ətraf rayonlara BMT-nin Qaçqınlar üzrə Ali Komissarlığının Ofisinin nəzarəti altında geri qayıdır.
8. Hərbi əsirlər, girovlar və digər saxlanılan şəxslərin, habelə cəsədlərin mübadiləsi həyata keçirilir.
9. Bölgədəki bütün iqtisadi və nəqliyyat əlaqələri bərpa edilir. Ermənistan Respublikası vətəndaşların, nəqliyyat vasitələrinin və yüklərin hər iki istiqamətdə maneəsiz hərəkətinin təşkili məqsədi ilə Azərbaycan Respublikasının qərb rayonları və Naxçıvan Muxtar Respublikası arasında nəqliyyat əlaqəsinin təhlükəsizliyinə zəmanət verir. Nəqliyyat əlaqəsi üzrə nəzarəti Rusiyanın Federal Təhlükəsizlik Xidmətinin Sərhəd Xidmətinin orqanları həyata keçirir. (5)

Tərəflərin razılığı əsasında Naxçıvan Muxtar Respublikası ilə Azərbaycanın qərb rayonlarını birləşdirən yeni nəqliyyat kommunikasiyalarının inşası təmin ediləcəkdir. 10 noyabr Bəyannaməsi Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin beynəlxalq, dövlətlərarası xarakterini bir daha təsdiqləmiş oldu. Ermənilərin onu 1988-1991-ci illərdə SSRİ-nin tərkibində olduğu kimi daxili münaqişə formasında saxlamaq cəhdləri birdəfəlik aradan qalxdı. Dağlıq Qarabağın statusu məsələsi danışıqların predmetindən çıxmış oldu, orada yaşayan ermənilərə öz müqəddəratını təyinetmə prinsipinin heç daxili aspekti də şamil edilməyəcək. Onlar adi Azərbaycan vətəndaşına verilən hüquqlardan yararlanmalı olacaqlar. Təəssüf hissi ilə qeyd etməliyik ki, müharibə zamanı 2783 vətən oğlu şəhidlik zirvəsinə ucaldı.

**Nəticə**

Qafqazda yerləşən bir sıra dövlətlər kimi Azərbaycan Respublikası da ötən əsrin 90-cı illərində müstəqillik əldə etmişdir. Lakin, müstəqillik tariximizlə, iqtisadi və siyasi inkişafımızı müqayisə etsək, təəccüblü nəticələrə şahid olarıq. Belə ki, qısa müddət ərzində böyük inkişafa nail olmaq hər dövlətin əldə edə biləcəyi bir uğur deyil. Bu da düzgün idarəetmənin, məntiqli iqtisadi, siyası və sosial strategiyanın bariz nümunəsidir. Bəzi dövlətlər hegemon dövlətlərin himayəsində hərəkət etsələr də, Respublikamız tam müstəqil xarici siyasət yürüdür və bunun da uğurlu nəticlərinin şahidi oluruq. 2020-ci il bir çox ölkələrin yaddaşında Korona virusunun yaratdığı böhranla yadda qalsa da, Respublikamızda isə "Qələbə" olaraq tarixə keçdi.

**Ədəbiyyat**

1. Əli Həsənov (2010) - "Geosiyasət"
2. http://newtimes.az/az/politics/344/
3. Əli Həsənov (2015) - "Azərbaycanın geosiyasəti"
4. Ərəstü Həbibəyli "Azərbaycan: geosiyasi səhnədə yeni çağırışların işığında"
5. https://www.bbc.com/azeri/azerbaijan-54878139

**Rəyçi: dos. G.Cəfərova**

Göndərilib: 10.03.2021 Qəbul edilib: 17.03.2021

ELMİ İŞ beynəlxalq elmi jurnal. İmpakt faktorlu. 2021 / Cild: 15 Sayı: 3 ISSN: 2663-4619
SCIENTIFIC WORK international scientific journal. With Impact Factor. 2021 / Volume: 15 Issue: 3 e-ISSN: 2708-986X

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/76-78

**Türkan Baba qızı Qəniyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
magistrant
qenizadeturkan@gmail.com

# IX SİNİF BİOLOGİYANIN TƏDRİSİNDƏ ROLLU OYUNLAR METODUNUN TƏDBİQİNİN İMKAN VƏ YOLLARI

***Açar sözlər***: *ahəngdar şəxsiyyət, IX sinif biologiyanın tədrisi, rollu oyunlar metodu, dərs nümunəsi*

## Possibilities and ways of application of the method of role-playing games in teaching biology of IX grade

**Summary**

I emphasized. The way of harmonious personality development pass from quality education. After, possible ways to present role-playing games in the teaching of ninth-grade biology and difficult topics with role-playing games explained on base of an example

***Key words:*** *harmonious personality, 9th-grade biology teaching, method of role-playing games, lesson an example*

Təhsilin əsas vəzifələrindən biri Azərbaycan dövləti qarşısında öz məsuliyyətini dərk edən, xalqın milli ənənələrinə və demokratiya prinsiplərinə, insan hüquqları və azadlıqlarına hörmət edən, vətənpərvərlik və azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirməkdir. Ahəngdar şəxsiyyətin inkişaf yolu məhs təlimin səmərəli və keyfiyyətli qurulmasından keçir. Səmərəli və keyfiyyətli təlimin reallaşması, xüsusi ilə IX sinif biologiyanın tədrisində keyfiyyətli nəticənin alınması fəal təlim metodları əsasında öz əksini tapır. Fəal təlim metodlarından beyn həmləsinə daha çox isdifadəyə yer verilir. IX sinif biologiyanın tədrisində rollu oyunların tədbiqi sanki kölgədə qalır. Amma IX sinif biologiyada bir sıra mövzular mövcuddur. Bu mövzuların məhs rollu oyunlar əsasında reallaşmasına ehtiyac duyulur.

Həmin mövzuların siyahısı

- Zülalların xassələri və bioloji funksiyalar
- Hüceyrə strukturları və onların funksiyaları
- İnsanın formalaşmasında sosial amillərin təsiri
- Düşüncəli fəaliyyət, nitq, təfəkkür
- Ali sinir fəaliyyətinin əsas tipləri
- Orqanizmin yaşayış mühiti, ekoloji amillər

Rollu oyunların tədbiqinin vacibliyini dahi şairlərimizin Məhəmməd Füzulinin "Meyvələrin söhbəti", Mirzə Ələkbər Sabirin" Ağacların bəhsi "təmsillərində rast gələ bilərik. Biologiya fənni həyatla bağlı olduğu üçün rollu oyunların tədbiqini görmək daha rahatdı. IX sinifdə rollu oyunlarının səmərəli tədbiqini reallaşdırmaq üçün rollu oyunlar haqda məlumat verib, səmərəli tədbiqini nümunə əsasında ön plana çəkirik.

### Rollu oyunlar nədir?

Rollu oyun – hər hansı bir problemə müxtəlif aspektdən yanaşma tərzidir. Bu metodda şagirdlər müxtəlif rolları öz üzərinə götürür, hər hansı hadisəni müxtəlif aspektdən qiymətləndirirlər. Metodun tədbiqində əsas məqsəd şagirdlərin nəzəri biliyini birbaşa praktik fəaliyyətə yönəltməkdir. Şagirdlər bu metodla məlumatı qeyri-adi qavrayır və yadda saxlayırlar. Həmçinin təlimin başlıca faktoru olan öyrənilən mövzu üzrə ünsiyyət çıxış edir. Bu oyundan əldə olunan başlıca keyfiyyət emosianal təəssüratın yaradılmasıdır. Rollu oyunların iki növü var. Strukturlaşdırılmış və strukturlaşdırılmamış. Strukturlaşdırılmış rollu oyunun ssnerasi əvvəlcədən hazırlanır və gözlənilən nəticəsi vardır. Strukturlaşdırılmamış rollu oyunda isə şagirdlər öz planlı ssenarilərini seçməkdə azaddırlar. Strukturlaşdırılmış rollu oyunlar bir neçə mərhələ üzrə hazırlanır.

Həmin mərhələlərə aiddir:

- Motivasiyada oyunun mövzusu, iştirakçılar müəyyən edilir.
- Rolların təsviri olan kartlar hazırlanır.
- Şagirdlər arasında rollar, vəzifələr bölüşdürülür.
- Tapşırıqlar verilir, oyunun gedişi müəyyənləşdirilir.
- Məzmun və müxtəlif obrazların rolunu təqdim edən hekayəçi, seçilir, əsas fəaliyyət başlayır.
- Qruplar və ya sinif üzrə tapşırıq izah edilir.

➢Oyun başlayır, səhnə götürülür, sonda müzakirə aparılır.

Rollu oyunların tədbiqi zamanı yarana bilən problemlər:

➢Mövzu və məqsəd aydın olmaması problemi
➢Rola girmək problemi
➢Söz ehtiyatının azlığı problemi
➢Vaxtın düzgün bölüşdürülməməsi problemi
➢Vasitələrdən düzgün istifadə edilməməsi problemi
➢Yaradıcı yanaşılmama problemi

Rollu oyunların tədbiqi ilə qazanılan bacarıqlar :

➢Təqlit etmək, fəaliyyət və hadisələri yaratmaq bacarığı
➢İncəsənət yolu ilə məlumat əldə etmək bacarığı
➢Problemə digər adamların gözü ilə baxmaq
➢Tənqidi və yaradıcı təfəkkürün formalaşması, qarşılıqlı ünsiyyət bacarığı

Rollu oyunun IX sinif biologiyanın tədrisində səmərəli tədbiqini görmək üçün "Düşüncəli fəaliyyət, nitq, təfəkkür" adlı nümunəvi mövzu əsasında baxaq.

**Nümunə**

Sinif: IX

Mövzu: Düşüncəli fəaliyyət. Nitq. Təfəkkür.

Alt standart: 3.1.2. İnsanın ali sinir fəaliyyətinin mexanizmini şərh edir və təqdimatlar hazırlayır.

Təlim nəticələri: Düşüncəli fəaliyyət" anlayışını şərh edir.

Nitq və təfəkkür əməliyyatlarının növlərini təsvir edir, mexanizmini şərh edir.

İnteqrasiya: 1. Fənndaxili inteqrasiya: Ali sinir fəaliyyəti. Şərtsiz reflekslər

Şərti reflekslər. reflekslərin tormozlanması.

2.Fənnlərarası inteqrasiya: Az.dili.-1.1.1; H.B.-2.1.1; Ədəbiyyat.

Təlimin forması: kollektiv iş.

Təlimin üsulları: Beyn fırtınası, müzakirə, rollu oyun.

Resurslar: Dərslik, paylama materialı, İKT.

Dərsin mərhələləri

I. Motivasiya: İnsan düşünür. Biz hamımımız insan cəmiyyətinin bir üzvüyük. Bir-birimizi anlamaq üçün ünsiyyət qurmalıyıq. Görəsən ünsiyyətin qurulması, bir –birimizi anlamağımız nəyin hesabına baş verir.

Tədqiqat sualı: Düşüncəli fəaliyyət nə deməkdir?. İnsanda düşüncəli fəaliyyətin xüsusiyyətləri nədən ibarətdir?

II Tədqiqatın aparılması: Düşüncəli fəaliyyət, nitq və təfəkkür öz vacibliyini ortaya qoydu. Birinci olaraq düşüncəli fəaliyyət cavab verdi:

- İnsan çox düşünmə cavab sadədir.

İnsan soruşdu:

- necə?

Düşüncəli fəaliyyət cavab verdi:

- Mənim hesabıma baş verir. Əşya və hadisələr haqqında qanunauyğunluğu duymaq və yeni şəraitə tədbiq etmək xüsusiyyəti mənə aiddir. Ətraf mühitə uyğunlaşmanın ali formasıyam. Bu cəhətdən davranışınada nəzarət edirəm. Buna görə mən əsasam.

Bu fikirləri eşidən nitq dedi:

- Ey!. Düşüncəli fəaliyyət ən vacib mənəm. Çünki mən əşya və hadisələri ifadə edən sözlərdən təşkil olunmuşam. İnsan!. Sən, duyğu orqanların vasitəsilə qavradığın hər şeyi sözlə ifadə edirsən. Mənim iki formam var. Yazılı və şifahi. Şifahi formamın formalaşmasında sol yarımkürələrin alın payı, yazılı formamın formalaşmasında isə gicgah və təpə payları iştirak edir. Mənim hesabıma siz insanlar məlumatları bölüşür, biliklərinizi gələcək nəslə ötürürsüz.

Bu fikirləri duyan təfəkkür cavab verdi:

- Nitq yaman özünü tərifledin. Cəmiyyətdən təcrid olunan uşaqlar danışa bilmir. Ən vacib mənəm. Əşya və hadisələrə qarşı münasibəti bildirirəm. Mən mücərrəd oluram. Özümdə 6 prosesi yəni analiz, sintezi, müqayisə, mücərrədləşdirmə və ümumiləşdirməni birləşdirirəm.

Altı proses arasında çaxnaşma düşür.

Analiz dedi:

- Mən olmasam əşya və hadisələri xəyalən hissələrə ayıra bilməsissiz.

Sintez dedi:

- Əsas mən olmasam hissələri və xüsusiyyətləri birləşdirə bilməssiz.

Müqayisə dedi:

- Əşya və hadisələri bir-birindən fərqləndirə bilməssiz.

Müccərrədləşdirmə dedi:

- Əksinə mən olmasam bir əlaməti digərindən ayıra bilməssiz.

Analiz dedi:

-Mücərədləşmə mənim hesabıma bir əlaməti digərindən ayırd edə bilirsən.

Ümumiləşdirmə dedi:

- Əsas mənəm çünki, əşya və hadisələri xəyalən mühüm əlamətlərinə görə birləşdirərəm.

Nitq qəzəblənərək təfəkkürə dedi:

- Sənin o müccərrəd forman mənim iştirakımla baş verir. Sözlər olmasa əşya və hadisələr haqqında təsəvvür olmaz.

Eyni anda düşüncəli fəaliyyət aqresiyasını təfəkürrə bildirdi.

Düşüncəli fəaliyyət dedi:

- Mənim yüksək şəkildə inkişafımın nəticəsisən.

İnsan deyilənləri təhlil edərək, yaranan komflikti aradan qaldırıb dedi:

- Hər birinizi dinlədim, hamınız vacibsiniz. Bir-birinizlə daim vəhdətdəsiniz. Ünsiyyətin qurulması və bir-birimizi anlamaq sizin hesabınıza baş verir.

III. İnformasiya mübadiləsi: hər bir şagird öz rolu haqqında fikirlərini bölüşür. İnformasiya mübadiləsi baş verir.

IV. İnformasiya müzakirəsi: sinif və müəllimin iştirakı ilə təhlillər aparılır, müsbət və mənfi cəhətlər ortaya çıxarılır nəticə etibarı ilə fikirlər müzakirə olunur.

V. Ümumiləşdirmə və nəticə: Bu mərhələdə fikirlər, məlumatlar umumiləşdirilərək mövzuya yekun nəticə vurulur. Həmin nəticə aiddir: insan cəmiyyətində yaşamaqda, ünsiyyət qurmaqda, bir-birini anlamaqda düşüncəli fəaliyyətin, nitqin, təfəkkürün rolu əvəz olunmazdır. Həmçinin şagirdlərdə düşüncəli fəaliyyətin nə olduğunu, şərti refleksdən fərqi, ikinci siqnal sistemi olan nitqin növlərini, təfəkkür əməliyyatları haqqında tam təsəvvür formalaşdı.

VI. Yaradıcı tədbiqetmə: Düşüncəli fəaliyyət, nitq və təfəkkürün insan həyatında əhəmiyyəti mövzusunda təqdimat hazırlayın.

VII. Qiymətləndirmə və refleksiya: standartlardan meyar çıxarırıq. Həmin meyarlara aiddir: şərh etmə və təqdimat hazırlama.

Refleksiya sualları:

- Bu dərs xoşunuza gəldi mi?
- Dərsin hansı hissəsi sizdə daha çox təəssürat yaratdı?

**Problemin praktik əhəmiyyəti:** IX sinif biologiyanın tədrisində rollu oyunların tədbiqi ilə mövzunun şagirdlər tərəfindən mənimsənilməsi, onlarda praktik təfəkkürü formalaşması addir.

**Problemin aktuallığı:** Dövr dəyişdikcə, inkişaf etdikcə təhsil sistemi də dövrün tələbinə uyğun olaraq dəyişir. Bir sözlə zamanla uzlaşır. Texnologiyanın inkişafı biz insanlara müsbət təsir göstərdiyi kimi, mənfi təsir də göstərir. Sosial şəbəkənin geniş istifadəsi ünsiyyəti ikinci plana atmışdır. Uşaqlarda canlı ünsiyyət virtual ünsiyyət formalaşmışdır bu da əməkdaşlığın qurulmamasına, özünə qapanmağa gətirib çıxarır. Məhs rollu oyunların tədbiqi həmin texnologiyanın mənfi cəhətlərini aradan qaldırılmasında canlı ünsiyyətin yaradılmasında, əməkdaşlığın qurulmasında böyük rol oynayır. Bəzən problem olaraq şagirdlərin yaş xüsusiyyəti ortaya atılaraq rollu oyunların istifadəsini səmərəsiz kimi göstərirlər. Lakin belə deyildir. IX sinif biologiyanın tədrisində rollu oyunlarının tədbiqini tələb edən mövzular mövcuddur. Həmin mövzuların adlarını işıqlandırdım. Rollu oyunların tədbiqinin vacibliyini hətta dahi şairlərimizin əsərlərində şahid ola bilərik. Şagirdlər artıq çətin mövzuları rahat mənimsəyə bilir, problemi rahat təhlil edə bilir, yamsılama qabiliyyətinə malik olmaqla özlərini rahatlıqla ifadə edə bilir. Fikrini rahat ifadə edə bilmək üçün söz ehtiyatına daha çox müraciət edir. Tənqidi, məntiqi və yaradıcı təfəkkürü formalaşır.

**Ədəbiyyat**

1. IX sinif biologiya dərsliyi. Bakı 2019
2. IX sinif biologiya fənn kirukulumu. Bakı 2019
3. Ə.Hüseynov, M.Əliyənnağı. Biologiyanın tədrisinin ümumi və xüsusi metodikası. Bakı 2007
4. Ə.Hüseynov, M.Əliyənnağı. Biologiya tədris metodikasının ümumi əsasları. Bakı 2009.
5. G.Hacıyeva. Biologiyanın tədris metodikasından mühazirələr. Bakı 2016

**Rəyçi: prof. M.İlyasov**

Göndərilib: 11.03.2021 Qəbul edilib: 18.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/79-82

**Aytən Tofik qızı Abbasova**
AMEA Dilçilik İnstitutu
magistrant
aytan.abbasova1998@mail.ru

# QƏDİM İVER SALNAMƏSİNİN DİLİNDƏ TÜRK MƏNŞƏLİ ETNOTOPONİMLƏR

***Açar sözlər:*** *Van yazıları, Araqez, Bərdə, Day, Tibet, Kaçi qalası*

## Ethnotoponyms of turkish origin in the language of the ancient Iver chronicle

**Summary**

The ancient Iberian chronicle was found in the valley of Lake Van. The author of the chronicle isn't known. The first copy of the chronicle was obtained during World War I. When Tsarist Russian troops occupied Eastern Anatolia, Caucasian scholars brought many church chronicles from Turkey to Tbilissi including the Ancient Iberian Chronicle.

At that period, research on the chronicle began. It was defined that the language of the chronicle was a completely different language from Georgian.

***Key words:*** *Van inscriptions, Aragez, Barda, Day, Tibet, Kachi fortress*

## Giriş

Türkiyə ərazisindəki Van gölü vadisi qədim yazılı mətnlərlə zəngindir. Oradakı ən qədim mətnlər Urartu dövrünə aiddir. Van gölü vadisi e.ə.IX-VIII əsrlərdə Urartunun mərkəzi olmuşdur. Yazıların bir hissəsi gölün kənarındakı qayaların üzərindədir (Кероп Патканов, 1883: 199-200; İlhami Cəfərsoy, 2014: 86-105).

Urartu qaya yazıları mixi yazılardır. Bu mətnlərdə sözlər hecalarla yazılır. Hecalar birləşdirilir, müəyyən səslər ixtisar olunur, sözlərin deyiliş forması tapılır.

"Qədim İver salnaməsi isə gürcü əlifbası ilə yazılmışdı.Gürcü əlifbası sillabik işarələrlə yox, hərflərlə yazılıb. Hər bir hərf ayrıca səsi bildirir.

Mətnin üzərində yazıldığı qaya 1914-1915-ci illərdə tədqiqatçıların diqqətini cəlb etmişdir. Akademik Marr və L.Meliksetbekov başda olmaqla qafqazşünas alimlər Tiflisdən Van bölgəsinə getmiş, qayadakı mətnlərin surətini çıxarmışlar.

Mətnin yazıldığı əlifba indiki gürcü əlifbasından bir qədər fərqlənir. Tarixən gürcülərin 4 əlifbası olmuşdur. Van qaya yazılarının mətni həmin əlifbanın qədim variantlarından birində yazılmışdır.

Yazıların surəti Tiflisə gətirildikdən sonra müəyyən olundu ki, o yazıların dili indiki ermənilərin və gürcülərin dilinə qohum deyildir. İver dili adlanan qədim gürcü dilinə və qrabar dili adlanan qədim erməni dilinə yaxındır (Кероп Патканов, 1883: 202-203)

Qədim gürcü dili adlandırılan iver dili indiki gürcülərin dili deyildir. Salnamə yazılan dövrdə, yəni V əsrdə gürcülərin əcdadları olan baqrationlar hələ Qafqaza gəlməmişdilər. Onlar gələnə qədər iverlər Xəzər dilinə bənzəyən bir dildə danışırdılar (İlhami Cəfərsoy, 2014: 106-117).

İverlər xəzərlər kimi suya su, göyə gök, hökmdara xan və xaqan, zadəgan xanımlarına xatun deyirdilər. Bunlar hamısı türk sözləri və titullarıdır.

Akademik Marr (1907: 3-64) yazır ki, iverlərin dili Yafəs dillərindən biri idi. Həmin dil qrammatik quruluşuna görə iltisaqi olub indiki gürcü dilinə bənzəmirdi, qədim erməni və gürcü dillərinə bənzəyirdi.

İverləri erməni tarixçiləri Vik adlandırırlar. Onlar çox zaman sözün əvvəlindəki saiti ixtisar edirlər. Etnik adların sonuna isə -k səsi artırırlar. Nəticədə, İver etnonimi Vik formasına salınır. Vik – iverlər deməkdir. K səsi erməni mətnlərində çoxluq və etnik mənsubluq bildirir (İlhami Cəfərsoy, 2020: 3-12).

Ermənilərlə gürcülər salnamənin kimə aidliyi barədə uzun zaman mübahisə etdilər. Sonda razılığa gəldilər ki, salnamə onların əcdadlarına məxsusdur (Меликсетбеков, 1938: 26-29).

Əslində isə salnamə xəzərlərə qohum olan iverlərin dilində yazılmışdır. H'Ay dili indiki erməni dili olmadığına görə, yəni qrammatik quruluşuna görə iltisaqi olduğuna görə salnamənin dili o dilə də bənzəyir.

Qrammatik quruluşua baxanda qədim iver dili sami dillərinin təsirinə uğramış türk dillərinə bənzəyir. Qrammatik quruluşua görə bu dil türk dillərinə bənzəməsə də, leksik fondunda çoxlu türk sözləri və söz kökləri vardır. Bu da ondan irəli gəlir ki, Qafqazın bir çox etnosları kimi iverlər də özlərinin ən qüdrətli çağlarında Fələstini, İudeyanı, Suriyanın bir hissəsini tutmuş və burada yəhudilərin və ərəblərin əcdadları ilə iqtisadi, siyasi, mədəni əlaqələrdə olmuşlar. Ona görə də salnamədə bəzi prototürk sözləri olduğu kimi qalmış, bəziləri fonetik quruluşuna görə bir qədər dəyişilmişdir.

Qrammatik şəkilçilərə diqqət yetirərkən görürük ki, o şəkilçilərin çoxu sami mənşəlidir.

Qədim İver salnaməsində ermənilərin indi Ararat adlandırdıqları dağ Araqez adlanır. Kerop Patkanov (1883: 226) təsdiq edir ki, o, indiki Alagöz dağıdır. Ermənilər indi Alagöz dağını Araqats adlandırırlar. Araqats Alagöz etnotoponiminin erməniləşmiş variantıdır.

Alagözdən başqa sonrakı – V əsrdən sonra yazılmış kilsə salnamələrində Qaragöz etnotoponimi də vardır. Son tədqiqatlara görə Alagöz və Qaragöz sadəcə oronimlər (dağ adları) deyildir, etnotoponimlərdir.

Faruk Sumər (1992:126) yazır ki, Alagöz və Qaragöz türk tayfalarıdır. Onlar Qazi Bürhanəddin Əhmədin dövründə, yəni XV əsrin sonlarında Türkiyənin Sevas və Kayseri mahallarında yaşayırdılar.

Salnamədə verilən ən maraqlı məlumatlardan biri Bərdə etnosu haqqındadır. Biz Bərdəni indi Azərbaycanda bir şəhər adı kimi tanıyırıq. Salnamədə Bərdə etnonimi Bardak və Bardos formalarında verilmişdir. Bundan başqa Gürcüstanla Azərbayan arasında Berdexoç çayının adı çəkilir (Кероп Патканов, 1883: 226).

Erməni tədqiqatçılarına görə Bərdə şəhərinin qədim adlarından birini Partav olmuşdur. Əslində isə Bərdə şəhərinin qədim adı Bərdək idi. Ermənilər onu Partav, gürcü salnaməçiləri Berdexos adlandırıdılar.

Berdak Bərdək şəhər adının qismən gürcüləşdirilmiş formasıdır, Berdoxos sözündə isə -os yunan şəkilçisidir.

Ərəblər Qafqazı işğal edənə qədər Bərdə şəhəri Bərdək adlanırdı. Ərəblər akademik Ziya Bünyadovun yazdığı kimi sözün son samitini tələffüz etmirlər. Nəticədə, Gəncək şəhərinin adı Gəncə, Bərdək şəhərinin adı isə Bərdə formasına salınmışdır (İlhami Cəfərsoy, 2020: 335).

Salnamədəki maraqlı etnotoponimlərdən biri Daydır. Kerop Patkanov bu sözün mənşəyi haqqında bir məlumat vermir, yalnız onu qeyd edir ki, sonrakı erməni salnamələrində Day mahalı Tayq adlandırılır (Кероп Патканов, 1883: 226).

Bu etnotoponimin əsl forması Daydır. Erməni və gürcü salnaməçiləri həmin etnotoponimi bəzən Dayaeyni, bəzən də Tayq adlandırırdılar.

-eyni – latın dilindən alınma şəkilçidir, -k isə daha çox ermənilərdə etnik adların sonuna artırılır və etnik mənsubluq, çoxluq, cəmlik bildirir.

Orta əsr müsəlman mənbələrində həmin etnotoponim Day formasındadır. Day etnonimi türk xalqlarının ata totemik münasibəti ilə bağlıdır. Əbu Osman Cahid əl-Bəsri "Türklərin fəzilətləri" (1992: 39-40) əsərində yazır ki, türklər sürətlə qaçan və qaçdığı yerdə geri dönə bilən döyüş atlarına tay deyirlər. Bu söz indi Azərbaycan dilində day və daylan formalarında işlənir. Azərbaycan dilində dayçadan böyük, ayğırdan kiçik erkək atlara day deyilir. Daylan isə daydan 1 yaş kiçik olur.

Salnamədə maraqlı etnotoponimlərdən biri də Tibetdir. Tibet mahalı Albaniya ilə İveriyanın arasında Loru dərəsində yerləşirdi. Eyni zamanda mahaldan axıb keçərək Kür çayına tökülən çay da Tibet adlanır.

Gürcü tədqiqatçıları o etnohidronimi xeyli saxtalaşdırmışlar. Keçən əsrin 30-cu illərindən bəri Tibet mahalını Debet, Tibet çayını Tbeti adlandırırlar (Лордкипанитзе, 1978: 62; Кекелидзе, 1961: 34).

Daha qədim mənbələrdə də - XIX əsrdə tərtib edilən rus hərbi xəritələrində mahalın və çayın adı Debet və ya Tbeti yox, Tibet formasındadır.

Tibet nəsli xristian dinini qəbul edəndən sonar Loru dərəsində Tibet kilsəsini tikmişdir. V əsrdən sonar onlar xristian kimi yaşayır və o kilsəyə ibadətə gəlirdilər.

Azərbaycan ictimai elmi üçün maraqlıdır ki, Tibet kilsəsi İveriyadakı Şuşa kilsə kafedrasına tabe olmuşdur (İlhami Cəfərsoy, 2020: 349).

Dilçilik elmində Tibet etnotoponiminin və etnohidroniminin mənşəyi mübahisəli olaraq qalır. Məlum olan odur ki, Tibet ölkəsi Uzaq Şərqdə-Hindistan ilə Çinin arasında yerləşir. Bu məlumatlar belə bir fikri irəli sürməyə imkan verir ki, onlar Albaniya ilə İveriyanın arasına Hindistanla Çinin arasından gəlmişlər.

Akademik Marr 1909-1910-cu illərdə Tibet mahalının kəndlərini gəzmiş, onların dilindən çoxlu sözlər tolamışdır. Həmin sözləri tədqiq edərkən görürük ki, Qafqazdakı tibetlilər gürcü dili ilə türk dillərinin qarışığında danışmışlar.

N.Y.Marr (1911: 26-37) yazır ki, tibetlilər qovurmaya kavurma, plova pilav, toya dügün, doşaba pekmez, səfirə elçi, qarmona nay, tütəyə duduk deyirlər. Akademik Marr bu sözlərin hansı dilə məxsusluğu barədə bir söz demir. Ancaq hər şey göz qabağındadır. Azərbaycan dilində həmin sözlər qovurma, tütək, plov və s. kimi işlənir.

Bundan başqa Qafqaz tibetlilərinin dilində Tutuxadze, Tuladze, Boridze, Şaxruz adları və soyadları da var idi. Şaxbuz Naxçıvandakı Şahbuz rayonunun adıdır.

Tuladze soyadının kökündə tula sözü durur. Tula Azərbaycan dilində ov itinə deyilir. Bu sözdə heç bir təhqiramiz məna yoxdur. At, it və pişik insanların ən qədim dostlarıdır.

Tutux sözü qədim türk abidələrində əsir mənasında işlədilmişdir. Bu adın kökündə tutmaq feili durur. Çünki əsirləri tutub təsərrüfatda işlədirdilər.

Maraqlı Tibet soyadlarından biri Buridzedir. Buridze soyadının kökündə qədim türk dilindəki "buri" sözü durur. Bu söz indi bir çox türk dillərində böri formasında işlənir. Türk dillərində canavara buri, böri deyilir. Ona görə belə deyilir ki, o böyürür, yəni ulayır.

Qədim İver salnamələrində maraqlı məlumatlardan biri Kaçi qalası haqqındadır. Həmin qala Van qaya yazılarında Kaçi Kaqak formasında yazıya alınmışdır (Кероп Патканов, 1883: 229).

Salnamədə göstərilir ki, Kaçi Kaqak, yəni Kaçi qalası Van gölü ilə Almaz dağının arasında tikilmişdir. Eranın IV əsrindən əvvəl şəhərin mərkəzində Kaçi adlı məbəd var idi. İnsanlar oraya ziyarətə gələrdilər.



Yunanlarla uzun döyüşlərdən sonra Kaçi qalası işğal olundu. Kaçi tayfası şəkildə göstərilən sıldırım dağın başında məbəd tikdilər. Həmin məbədə qalxmaq üçün yalnız kəndir nərdivanlardan istifadə olunurdu.

IV əsrin ortalarından Van bölgəsindən tutmuş Qafqaza qədər xristianlıq yayılmağa başladı. Kaçi tayfası məbəddə qızıldan keçi bütü saxlayır və ona qurban kəsirdilər. Həmin bütü çıxarıb yeni tikdikləri dağ başındakı məbədə gətirdilər.

Xristian dini yayılanda Kaçi tayfası da xristian dinini qəbul etdi, ancaq qızıl keçi bütünü çıxarıb atmadılar, uzun zaman məbəddə saxladılar (İlhami Cəfərsoy, 2020: 352).

Türkoloji tədqiqat üçün maraqlıdır ki, bir sıra türk dillərində keçiyə kaçi deyilir. Çuvaş dilində bu, indi də belədir.

Kaçi məbədinin, daha sonra Kaçi kilsəsinin adı onu inşa edən tayfanın adı ilə bağlıdır. Kaçi, keçi etnotoponimləri keçiyə totemik münasibətlə bağlı olaraq yaranmışdır. Bu inancın izləri Altay türklərinin dilində indiyədək qalmaqdadır. Altay şamanların 1 qolu Kaçi Kam adlanır. Onlar keçinin qızıl bütü ətrafına toplaşır və keçinin timsalında əcdadlarının ruhlarına dua oxuyurdular (Анохин, 1924: 111).

Kaçi İberiyanın qədim türk etnoslarından biridir. Onların bir hissəsi yunanlarla vuruşa-vuruşa şimala doğru çəkilmiş, sonralar Abxaziyanın aparıcı etnoslarından birinə çevrilmişlər. Osmanlı səyyarı Övliya Çələbi XVII əsrin ortalarından Qafqaza səyahət edərkən onların bir hissəsinin Qara dənizlə Qafqaz dağları arasında yaşadığını görmüşdür.

Səyyah (1983: 33, 49) yazır: "Keçi Abaza tayfalarından biridir. Başçıları biy adlanır. Keçi tayfasının 70 kəndi var. Onlar Elbrus dağından başlayıb Qaqra şəhəri yaxınlığında Qara dənizə tökülən Lipo çayı sahilində yaşayırlar. Keçililərin 10 minlik cəsur döyüşçüləri var. Onlara kafir deyəndə hirslənirlər. Özlərini müsəlman sayırlar. Ancaq islam dini ehkamlarından xəbərləri yoxdur".

## Nəticə

"Qədim İver salnaməsi"nin dilində çoxlu miqdarda türk mənşəli etnotoponimlər işlənmişdir. Salnamə V əsrdə yazılmışdır və onun dili indiki gürcü dilindən fərqlənən, xəzərlərin dilinə yaxın olan bir dildir.

Salnamədə işlənən türk mənşəli etnonimlərə misal olaraq Araqez (Alagöz), Qaragöz, Bardak və ya Bardos, Day, Tibet, Kaçi göstərə bilərik. Bu sözlər indi də Alagöz, qaragöz, Bərdə, tay, Tibet, keçi formalarında müasir Azərbaycan dilində istifadə olunur.

## Ədəbiyyat

1. Патканов Кероп. Ванская надписи и значеные их для историй Передней Азий. О дневней грузинской хроник. 1883, с. 3-274.
2. İlhami Cəfərsoy. İber və H'Ay folklorunda türk təfəkkürünün izləri. Bakı, 2014, 224 s.
3. Марр Н.Я. Тексты и разыскания по армяно-грузинской филологии. кн. X. Санкт-Петербург, 1907.
4. İlhami Cəfərsoy. H'Ayların və ermənilərin mənşəyi. Bakı, 2020.
5. Меликсетбеков Л.М. Армазии. Историко-археологический очерк. вып. 2, Тбилиси, 1938.
6. Faruk Sumər. Oğuzlar. Bakı, 1992.
7. Əbu Osman Cahid əl-Bəsri. Türklərin fəzilətləri. Bakı, 1992.
8. Лордкипанитзе Гурам. Колхида в VI-IV вв. до н. э. Тбилиси, Мецниереба, 1978.
9. Кекелидзе К.С. Этюды по истории древнегрузинской литературы. Тбилиси, Мецниереба, 1961
10. Марр Н.Я. Древник поездки Шавшетию и Кларджетую. Тифлис, 1911, 216 с.
11. Анохин А.В. Материалы по шаманству у Алтайцев. С предсловием С.Е. Малова. Издание Российской Академии Наук, Л., 1924, 151 с.
12. Эвлия Чеелеби. Книга путешествия. вып. 3, М., Наука, 1983, 376 с.

**Rəyçi: f.f.d. İ.Cəfərsoy**

Göndərilib: 17.03.2021 Qəbul edilib: 27.02.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/83-86

**Sabina Əzim qızı Əzimova**
Azərbaycan Turizm və Menecment Universiteti
magistrant
sabina_azimova25@mail.ru

# ERKƏN NİKAHLARIN PSİXOSOSİAL NƏTİCƏLƏRİ

***Açar sözlər:*** *Ailə yaşı, uşaq istismarı, psixososial aspektlər*

## Psychosocial consequences of early marriages

**Summary**

One of the most common forms of child exploitation in the world is early marriage. Although the number of underage marriages has declined to some extent, it continues to rise in a number of countries. Early marriage usually means the marriage of a child under the age of 18. Many of these marriages are also referred to as "child and forced marriages" because they are performed without conscious consent. Early marriage separates children from their families and peers, exposes them to domestic violence, and jeopardizes their development, educational, social and professional opportunities. Such marriages can also lead to psychological problems such as depression, adaptation disorders, post-traumatic stress, and suicide attempts. This review article aims to assess the causes and psychosocial consequences of early marriage.

***Key words:*** *Family age, child exploitation, psychosocial aspects*

## Giriş

Erkən nikahlar, digər adıyla uşaq evlilikləri - 18 yaşın altında, uşağın fiziki və psixoloji olaraq evlilik və uşaq sahibi olmaq kimi məsuliyyətləri daşımağa hazır olmadan həyata keçirilən evlilik olaraq təyin olunur. Evliliyin müəyyən bir səviyyədə fiziki, mənəvi, zehni, psixoloji yetkinlik tələb etməsi səbəbinə görə uşaq yaşdakı evliliklərin "gəlin" olaraq görülməməsi lazım olduğu mübahisə edilməkdədir. Lakin gündəlik həyatda erkən nikahlar əvəzinə uşaq nikahları, uşaq gəlinləri ifadəsinin işlədilməsi mövzuya daha çox diqqət çəkdirir. Rəsmi olaraq problemi təyin etmək üçün uşaq nikahı konsepsiyasından istifadə edilməli olduğu bildirilir. BMT ekən nikahları kişilərin xəyrinə qadın və uşaqların istismar edildiyi, ortadan qaldırılması lazım olan bir tətbiq olaraq təsnif etmişdir. Ailənin iqtisadi səviyyəsi və təhsil vəziyyəti, məişət zorakılığı mühiti, fərdin təhsil səviyyəsi, ailədəki gərginlik, ailənin və fərdin sahib olduğu stereotiplər, genderə baxış və ənənəvi tətbiqlər qız uşaqlarının erkən evləndirilməsinə mühit hazırlayır. Erkən nikahların həqiqi tezliyini müəyyənləşdirmək qeyri - rəsmi nikahların qeydiyyata alınmaması, 18 yaşınadək qeydiyyatsız uşaq nikahları və evlilik statistikasını təyin etmək üçün istifadə olunan məlumat toplama metodları səbəbindən mümkün deyil. Bu səbəbdən mövzu ilə bağlı etibarlı məlumat əldə etmək üçün müxtəlif mənbələrə müraciət etmək lazım gəlir.

Psixologiya ədəbiyyatına nəzər yetirdikdə erkən nikah mövzusuna çox diqqət çəkmədiyi görülür. Erkən nikahlar fərdin psixoloji və fiziki inkişafına təsir göstərən, təhsilini axsadan, peşə və sosial funksionallığını pozan mühüm travmatik amildir. Qadın, uşaqlar və cəmiyyət cəhətdən sağlamlıq və sosial nəticələri ağır olan bu problemlə mübarizə edə bilmək üçün problemin hazırlayıcı faktorları, yəni səbəb və nəticələrini əhatəli bir şəkildə araşdırılmasına ehtiyac yaranır.

## Erkən nikahın səbəbləri

### Təhsilsizlik və ailənin sosial - iqtisadi səviyyəsi

Erkən nikahların mövcud olmasını şərtləndirən amillərdən biri ailələrin təhsil səviyyəsinin aşağı olmasıdır. Erkən nikahlara daha çox təhsil səviyyəsi aşağı və sosial - mədəni quruluşu zəif ailələrdə rast gəlindiyi müşahidə edilmişdir. Bu cür ailələrdə oğlan və qızlar üçün fərqli evlilik planları qurulur. Oğlanların evləndirilmələri minimum səviyyədə təhsil almalarına və əsgərlik xidmətinin bitirməsinə bağlıykən qız uşaqlarında isə təhsilə ehtiyac duyulmur, həmçinin ailənin məhdud olan gəliri oğlanın təhsilinə xərclənir. Bu səbəbdən də qızlar yetkinlik yaşına başladıqdan dərhal sonra nişanlanır və sonra ailə qurulur (5).

Beynəlxalq müqayisələrə əsaslanan araşdırmalar, erkən evliliyin kənd yerlərində və az inkişaf etmiş bölgələrdə üstünlük təşkil etdiyini göstərir və ölkələrin rifah səviyyəsi arasındakı əlaqəyə diqqət çəkir. Yoxsul ailələrin öhdəsindən gələ bilmədikləri xərclərini, qız uşaqlarını erkən yaşda evləndirərək azaltma və eyni zamanda başlıq pulu ilə ailə gəlirini artırma yolunu seçdikləri də görülür. Erkən nikahlar ailənin iqtisadi qurtuluşu olaraq həyata keçirilir. İqtisadi səviyyə yüksəldikcə erkən evliliklərin nisbəti düşdüyü müəyyən olunmuşdur. Erkən yaşda uşaqlarını evləndirən ailələrinin iqtisadi səviyyəsi aşağı olur, kiçik yaşda evləndirilən qız uşaqları böyük nisbətdə

təhsil almır, xüsusilə bu qızların valideynlərinin çoxu heç təhsil almamış olur. Valideynlərin və ya uşağa görə qərar verən digər şəxslərin təhsili isə erkən nikah riskinə təsir edir.

Təməl bir insan haqqı olan təhsil, fərdlərin digər insan haqlarından faydalanmalarının və hüquqlarını müdafiə edə bilmələrinin əsas şərtdir. Qızların təhsili erkən nikahların qarşısının alınmasında vacib mövzulardan biridir. Məktəbdə oxuduğu müddətdə, 18 yaşına qədər evliliyə icazə verməyən məcburi və fasiləsiz təhsil erkən nikah probleminin kökündən həllinə böyük töhfə verən əsas amildir. Qızların təhsil səviyyəsi yüksək olduğu qədər evlənmə müddəti də bir o qədər gec olur və əksinə qızların təhsil səviyyəsi nə qədər aşağıdırsa, evlənmə müddəti də bir o qədər tez olur. Bu, bir qanunauyğunluq olmasa da, statistika bu halın dünyada geniş yayıldığını göstərir (1, s.108).

Təhsilin keyfiyyət və gender bərabərliyi perspektivi ilə layihələndirilməsi və həyata keçirilməsi erkən nikahlar kimi sosial problemlərin aradan qaldırılmasında mühüm rol oynayır.

**Məişət zorakılığı**

Erkən nikahların səbəblərindən biri də məişət zorakılığıdır. Böhran vəziyyətləri insanların mənfi nəticələri ola biləcək müdafiə mexanizmləri mənimsəmələrinə səbəb ola bilər. Ailə daxili şiddət, uşaq qayğısının yoxluğu, kiçik yaşlarda ana/atadan birinin itirilməsi və ögey ana/ataya sahib olunması digər bir ifadəylə ailə daxilində uşağın ehtiyacı olduğu rahat mühitin olmaması əksər hallarda uşaqlarda evlənmə nəticəsində bu vəziyyətdən xilas olacağı inancını inkişaf etdirərək erkən yaşda evliliklərə gətirib çıxara bilən səbəblərdəndir (7).

**Ənənəvi fərziyyələr (stereotiplər), dini inanclar və gender bərabərsizliyi.** Şimali Efiopiyada erkən nikahın səbəblərini sosial – mədəni məzmunda açıqlayan Dagne, qız uşaqlarını erkən nikaha istiqamətləndirən səbəblərini valideynlərin yaşlanmadan və ölmədən əvvəl qızların gələcəyinin zəmanətə alınması, qohumluq bağlarının gücləndirilməsi, ailənin statusunun yüksəldilməsi, yetkinlik yaşında evlənməməsi vəziyyətində qarşılaşa biləcəyi etiketlənmələrinin qarşısının alınması şəklindəki ənənəvi qəbullarla açıqlamışdır (6). Ənənəvi cəmiyyətlərdə qızların dominant sistemin tələbi olaraq erkən yaşda ərə verildiyi bildirilmişdir. Bu sistem qadınlara qarşı qeyri - bərabər münasibəti qanuniləşdirən və davam etdirən inancları və normaları olan qızların erkən nikahını dəstəkləyir. Belə sistemdə qadınlara öyrədilən gender rolları erkən nikaha nəzarət edən mexanizmlərdən biridir. Erkən nikahın keçmişdən günümüzə qədər uzanan və qadın üzərindən mədəni olaraq formalaşdırılan bir problem olduğu bildirilir. Erkən nikah bir çox cəmiyyətdə mədəni olaraq ərsəyə gətirilir və qorunur (3).

Qadına qarşı təməl insan hüquqları və azadlıqlarının pozulması, qadın və kişilər arasında qeyri - bərabər güc münasibətlərinə səbəb olan gender bərabərsizliyi, erkən nikahların davam etdirməsinə səbəb olur. Erkən evliliklərə əksəriyyətlə qız uşaqlarının məruz qalmasının kökündə qadına istiqamətli baxış bucağının payı var. Ənənəvi cəmiyyətlərdə qızlar dünyaya gələndən ev daxili rollara uyğun olaraq düşünülür və neçə yaşında olursa olsun evinin, ailənin məsuliyyətini yerinə yətirə biləcəyinə istiqamətli yayılmış bir inanc mövcuddur (2, s.20).

Ətrafında öz yaşıdlarının evlənməsi, ailəsində erkən yaşda evlənənlərin çoxluğu, uşaqları mənfi nümunələrin təsirində qalaraq evliliyə təşviq edir. Cəmiyyətin bəzi seqmentlərində hələ davam etdirilməkdə olan başlıq pulu, beşik kertmesi və qan əvəzi evliliyi kimi ənənəvi tətbiqlər qız uşaqlarının erkən yaşda evləndirilməsinə səbəb olur (4). Ortaq dəyər mühakimələrini bölüşən və oxşar mədəni dəyərlərə sahib olan dini qruplarında da daxili evlilik normalarının yayılması erkən nikahı təşviq edən amillərdəndir.

Başda qızlar olmaq üzrə uşaqlara edilən "tez evlənənlə tez yuxudan duran qazanar", "bəxtin bağlanar", "qız yükü duz yükü", "bir an əvvəl evlən və uşaq dünyaya gətir" və bənzəri cəmiyyət təzyiqləri də erkən yaşda evliliklərin önünü açır. Bu dəyər mühakimələri altında böyüyən qız uşaqları, sosial rolun ev qadınlığı və analıq olduğu şüuruna uşaqlıqdan etibarən məruz qalır. Qızların erkən ərə getmələri ilə bağlı belə açıqlamalar cəmiyyətin də evliliyə münasibətini ortaya qoyur.

**Digər səbəblər**

Erkən nikahların ən çox yayıldığı bölgələrdə səbəblərdən biri də müharibələr və təbii fəlakətlərdir. Əfqanıstanda yaşanan müharibə və quraqlıq, İndoneziyada yaşanan sunami kimi təbii fəlakətlərdə erkən evliliklərin ortaya çıxmasında təsirli hadisələr olaraq qarşımıza çıxır. Belə ki, İndoneziyadakı sunami sonrası həyat yoldaşları ölən və daha sonra kiçik yaşdakı qız uşaqlarıyla evlənən kişilər üçün "sunami dulu" kimi anlayışlar da yaranmışdır. Bəzilərində təbii fəlakətdən sonrakı evliliklər iqtisadi cəhətdən gəlir gətirəcək bir hərəkət olaraq görülür, digərlərində fəlakətdən sonra kimsəsiz qalan insanları, xüsusilə qız uşaqlarını qorumaq üçün həyata keçirilir (2, s.22).

**Erkən nikahın psixososial nəticələri**

Erkən yaşda həyata keçirilən evliliklərin bir çox baxımdan problem yaratmasının ən fundamental səbəbi evliliyin yeniyətməlik dövrünə bərabər gəlməsi olaraq ifadə etmək olar. 18 yaşının altında inkişaf mərhələsində olan şəxslər, sosial mənada yetkinləşməmiş, lazımlı sosial rollara tam mənasıyla uyğunlaşma

təmin edə bilməmiş fərdlər olaraq qəbul edilir. Bu səbəbdən sosial inkişaflarını tamamlamamış olan kiçik yaşdakı qız uşaqlarının evləndirilməsi, uşaqlarda daha tam meydana gəlməmiş olan sosial şəxsiyyətlərində problem yaşamalarına səbəb olur. Evlilik sonrası həmyaşıdlarının mühitlərindən qopma, sosial fəaliyyətlərdə özünə inam əksikliyi kimi əks olunmalarla tamamilə sosial ətrafından qopmaqla ailəsinə və ev içinə həpsolmuşluqla baş - başa qalır (2, s.23).

Erkən nikahlar, əksər hallarda qızların bir növ kölə kimi istifadə olunmaları ilə nəticələnir. Evlilik fərdin seçəcəyi bir vəziyyət olsa da, erkən nikahlar fərdin seçim hüququnu əlindən alır. Uşaqlıq nikahları insan hüquqları pozuntusunun bir növüdür və xüsusilə qızlar arasında ən çox yayılmış istismardır. Biopsixososial inkişafını tamamlamadan əvvəl qızların evlənməsi bir çox problem gətirir. Erkən nikahlar bir növ uşaqların uşaqlığını əllərindən alır və ciddi fiziki və psixoloji zərər verir (2, s.23). Bu uşaqlara erkən yaşda ailə, ev və uşaq baxımı kimi məsuliyyətlər verilir və təhsil həyatından məhrum olurlar. Erkən ərə gedən uşaqların çoxu məktəbi tərk edir. Erkən nikah qurbanlarının daha çox qız olduğunu nəzərə alsaq, bu vəziyyət qızların həyat yoldaşlarından daha çox iqtisadi baxımdan asıllı olmasına və yoxsulluğa səbəb ola bilər. Yoxsulluğu və təhsili erkən yaşda evliliklərin həm səbəbi həm də nəticəsi kimi qiymətləndirmək olar. Bundan əlavə, təhsil ilə yoxsulluq arasında güclü bir əlaqə mövcuddur. Yoxsulluq səbəbiylə təhsil imkanlarından kifayət qədər faydalana bilməyən və ya evləndirilmək üçün məktəbdən çıxardılan qız uşaqları, özünü inkişaf etdirə bilmir, yəni məşğulluq bacarıqlarını inkişaf etdirə bilmir, bu səbəbdən yoxsul qalmağa davam edir. Erkən yaşda evlənən qız uşaqlarının yoxsulluq “təcrübəsi”, yoxsulluğun qadınlaşmasının bir formasını meydana gətirir. Uşaq sahibi olmaq isə yoxsul ailələrin sahib olduğu məhdud mənbələrinin daha da azalmasına gətirib çıxarır və onları daha çox yoxsullaşdırır. Erkən yaşda evlənən qız uşaqlarının, daha yetkin yaşlarda evlənən qız uşaqlarına görə daha çox uşaq sahibi olduğunu da nəzərə alsaq, uşaqların sayının çox olduğu ailələrdə yoxsulluğun daha çox yaşandığını demək mümkündür.

Evli uşaqlar istismara, hər cür şiddətə qarşı həssas olurlar (2, s.23). Beynəlxalq Qadın Tədqiqat Mərkəzi tərəfindən aparılan araşdırmaya görə, uşaqlıqda evlənən qızlar zorakılığa digər yaş qrupundakı qadınlara nisbətən 2-3 dəfə çox məruz qalırlar (4).

Bangldaleşdə aparılan bir araşdırmada, həyat yoldaşları tərəfindən zorakılığa məruz qalan qadınların 78.9%-nin uşaq yaşında (18 yaşından əvvəl) evləndiyi müəyyən edilmişdir. Cənubi Asiyada aparılan araşdırmalarda erkən nikahların partnyoru tərəfindən şiddət üçün risk faktoru olduğu təsbit edilmişdir (9). Uşaq yaşda həyata keçirilən evliliklərdə müşahidə edilən qadının təhsilindəki və iqtisadi imkanlarındakı məhdudluğun, həyat yoldaşları arasındakı yaş fərqi və güc balanssızlığının, sosial izolyasiyanın və qadının avtonomluğunun olmamasının bu evliliklərdə görülən məişət zorakılığının ola biləcək səbəb mexanizmləri olduğu bildirilir. Qızlar, qadınlara dəyər verilmədiyi ailələrdə evlilik adı altında bir növ satılırlar. Bu ailələrdə böyüyən qız uşaqları daxililəşdirdikləri zərərli inanclara da sahib ola bilər. Misal üçün ərləri tərəfindən döyülən qadınlar ərlərinə haqq qazandıra bilər. Erkən nikahlar ümumiyyətlə ailələr tərəfindən təşkil olunur və qızların qərar vermək haqqı olmur. Efiopiyada aparılan bir araşdırmada, 15 yaşından əvvəl evlənən qızların 71%-nin evlənmədən əvvəl həyat yoldaşlarını heç görmədiyi məlum olmuşdur. Ədəbiyyatda ər- arvadın evlənmədən əvvəl bir-birini tanımaması daha çox məişət münaqişəsinə və şiddətə vasitəçilik etdiyi bildirilir (9).

Erkən nikahlar daha çox ailə problemi və boşanmalara səbəb ola bilər. Ədəbiyyatda uşaq yaşında evlənənlərdə cütlüklərin uyğunlaşmanın pozulduğu və evlilik yaşı artdıqca uyğunlaşmanın artdığı aşkar edilmişdir (8).

Erkən yaşda evlənən qadınlar arasında hansısa psixoloji xəstəlik diaqnozu qoyulması və psixiatriya dəstəyi axtarma nisbətinin, yetkin yaşda evlənən qadınlardan daha yüksək olduğu bildirilir (10). Ən çox görülən diaqnozlar depressiya və uyğunlaşma pozuntusudur. Travma sonrası stress pozuntusu da digər diaqnostik qrupdur. Erkən yaşda ailə, ev və uşaqlar kimi məsuliyyət altında olmaq, valideynlərindən və yaşıdlarından ayrılmaq, evləndikləri şəxs və ailə ilə gərginlik, aşağı sosial dəstək və iqtisadi çətinliklər qeyd olunan xəstəliklərin sürətli inkişafına səbəb olan amillərdir. Evliliyi istəməyən, evləndirildiyi insanı evlilik əvvəli tanımayan, evləndirildiyi şəxs tərəfindən zorakılığa məruz qalan hallarda daha yüksək nisbətdə psixoloji pozuntu müşahidə olunur. Ayrıca Türkiyədə aparılan bir araşdırmada, bu hadisələrin 29.2%-də evləndikdən sonra intihar düşüncəsi inkişaf etdiyi və bunların 20.8%-də intihara cəhd göstərildiyi bildirilir. Depressiya simptomların 18 yaşdan yuxarı olanlara nisbətən evli uşaqlarda daha çox olduğu və intihar düşüncələrinin evli uşaqlarda 10-17 yaş arasındakı evlənməmiş uşaqlara nisbətən daha çox olduğu bildirilmişdir (4).

## Nəticə

Ailənin iqtisadi səviyyəsinin və təhsil vəziyyətinin, ailə daxili şiddət mühitinin, fərdin təhsil vəziyyətinin, ailə daxilindəki narahatlığın, ailənin və fərdin sahib olduğu stereotiplərin, gender dünyagörüşünün və ənənəvi tətbiqlərin qız uşaqlarının erkən evləndirilməsinə mühit hazırladığı düşünülür. Erkən nikahlar uşaqların uşaqlığını əllərindən alır, öz yaşıdların mühitindən uzaqlaşmalarına, təhsil həyatlarını yarımçıq qoymalarına və tam formalaşmamış olan sosial şəxsiyyətlərində problem yaşamalarına səbəb olur. Uşaqlara ailə, ev, uşaq baxımı kimi məsuliyyətlər verilməkdə olub bu uşaqlar daxil olduqları ailələrdə bir növ kölə olaraq istifadə edilə bilməkdədirlər. Evləndirilən uşaqlar evdə istismara, hər cür şiddətə və iqtisadi asılılığa, yoxsulluğa açıq hala gəlir. Erkən nikahlar, cəmiyyətin inkişafındakı ən böyük hədəflərdən olan yoxsulluğun azaldılması, təhsilin geniş yayılması, yəni daha çox insanın təhsildən yararlanması, həmçinin gender bərabərliyinin təmin edilməsi, uşaqların həyatının qorunması və sağlamlığının yaxşılaşdırılması baxımından bir maneə kimi qarşımıza çıxır. Erkən və məcburi evliliyin mənfi nəticələri ilk növbədə fərdlərdə, daha sonra cəmiyyətdə meydana çıxır. Bu nəticələr sağlamlıqdan təhsilə, sosial həyatdan intihara qədər bir çox sahədə baş verir. Beləliklə, əvvəl fərdi nəticələr olaraq ortaya çıxan inkişaf zamanla sosial xüsusiyyətə bürünərək, təhlil edilməsi çətin və kompleks problemlər olması ilə nəticələnir.

## Ədəbiyyat


1. Məmmədov R.T. Erkən evlilik probleminin araşdırılması və ondan çıxış yolları. Bakı: “Servis AZ” MMC - nin mətbəəsi, 2018 - 159 səh.
2. Aydemir E. Evlilik mi evcilik mi? Erken ve zorla evlilikler, çocuk gelinler. Ankara: Usak Yayınları, 2011 – 53 sayfa
3. Burcu E, Yıldırım F, Sırma Ç.S, Sanıyaman S. Çiçeklerin kaderi: Türkiyede kadınların erken evliliği üzerine nitel bir araştırma. Ankara: Bilig, №73, 2015, s. 63 – 98
4. Malatyalı M.K. Türkiyede çocuk gelin sorunu. Ankara Üniversitesi: Nesne Psikoloji Dergisi. №2 – 3, 2014, s. 27 – 38
5. Yüksel H, Yüksel M. Çocuk ihmali ve istismarı bağlamında Türkiyede çocuk gelinler gerçeği. Çankırı Karatekin Üniversitesi: Sosyal Bilimler Enstitüsü Dergisi. №5 – 2, 2014, s. 1 - 24
6. Dagne H.G. Early marriage in northern Ethiopia. Reprod Health Matters, №2, 1994, p. 35 - 38
7. Gök M. Child marriages in Turkey with different aspects. International Journal of Human Sciences, №13 – 1, 2016, p. 2222 - 2231
8. Güneş M, Selçuk H, Demir S, İbiloğlu A.O, Bulut M, Kaya M.C, Yılmaz A, Atli A, Sır A. Marital harmony and childhood psychological trauma in child marriage. Journal of Mood Disorders, №6, 2016, p. 63 – 70
9. Kidman R. Child marriage and intimate partner violence: a comparative study of 34 countries. International Journal of Epidemiology, №2 – 46, 2016, p. 662 – 675
10. Le Strat Y, Dubertret C, Le Foll B. Child marriage in the United States and its association with mental health in women. Pediatrics, №128 – 3, 2011, p.524 - 538


**Rəyçi: dos. E.Bayramzadə**

Göndərilib: 18.03.2021 Qəbul edilib: 23.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/87-90

**Aytac Batil qızı Sadıqova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
Sadiqova-aytac@inbox.ru

## MİNİATÜR SƏNƏTİ VƏ ONUN AZƏRBAYCANDA İNKİŞAF XARAKTERİSTİKASI

***Açar sözlər:*** *Miniatür, inkişaf, formalaşma, rəng, forma, təsir, kompozisiya*

### Miniature art and its development characteristics in Azerbaijan

**Summary**

The history of miniature art dates back to ancient times. This art in itself combines many fields of art. One of the main characteristics of miniature art is the ability to describe the events in the books in the form of plots. In this field, more Tabriz artists have managed to create unique pearls of art. The unique specimens created by the masters of Tabriz are now kept in various museums and private collections around the world. Each of these preserved specimens has its own aesthetic and artistic value. The article thoroughly analyzes their general artistic characteristics.

***Key words:*** *Miniature, development, formation, color, shape, effect, composition*

Miniatür sənətinin yaranmasının tarixini və təşəkkül tapmasına təsir edən amilləri müəyyənləşdirmək üçün ilk olaraq bu sənətin əsas xarakteristikasınını və yaranma tarixini qeyd etmək vacibdir. Məlum olduğu kimi özünəməxsus rəsm texnikası və ifadə dili ilə çox incə işlənmiş, kiçik ölçülü rəsm əsərləri olan miniatür xüsusi bir rəsm sənəti sayılır. Ümumiyyətlə, əlyazma kitablarındakı mətni estetik cəhətdən diqqət çəkən edən və mətndəki məlumatları daha da aydınlaşdıran kitab şəkilləri miniatür kimi tanınır. Burada illüsta ediləcək mövzuya daxil olan hadisələri təsvirə köçürmək üçün hadisəni şəkillər şəklində köçürmək və fiqurları bir-birini örtməyəcək şəkildə yerləşdirmək vacibdir. Qərb əlyazmalarındakı kitab illustarsiyalarından xaric İslam dünyasında XIII-XIX əsrlər boyu "təsvir, təsvir-i humayun, şəbih, süver, tərrahi, rəsm, rəsm, qırıntı (e) tikmə, məclis, mendil" kimi adlarla həyata keçirilən sənət əsərlərinə də "miniatür" deyilmişdir. Uzun tarixi müddət ərzində əsasən şərq ölkələrində kətan, dəri, divar, ölçülü kağız, keramika, sümük, taxta qutular, keramik qablar və ipək kimi məmulatların üzərinin bəzədilməsinə xüsusi önəm verilmişdir. Bu bəzədilmə ya ornamentlərlə, ya da ki, müxtəlif süjetli təsvirlərlə olurdu. Ancaq, miniatür sənəti kimi müxtəlif məqsədlər üçün hazırlanan kitab illüstrasiyaları öz estetik dəyərinə görə daha yüksək mərtəbəyə ucalmışdır.

Miniatür sözünün tarixinə nəzər salsaq görə bilərik ki, orta əsr Avropasında hazırlanmış əlyazmaların fəsillərinin əvvəlində mətnin ilk hərfinin ətrafında latınca "minium" adlanan qırmızı-narıncı boya ilə "miniatura" adlanan bəzəklər hazırlanmışdır. Miniatür adının bu sözdən gəldiyi və Latın dilində kiçik mənasını verən "minor" sözünün təsiri ilə "kiçik şəkil" mənasını qazandığı düşünülürdü.

Bir çox mənbədə türk dünyasında miniatürə "naxış", naxış vuranın "nəkkaş" adlandırıldığı bildirilsə də, naxış, kitab şəkilləri xaricində fərqli sənət sahələrini ifadə edən başlanğıc ifadədir. Qərbdə miniatür üslubunda rəsm çəkən rəssamlara miniatüristlər deyilirdi. Bir çox türk dövlətlərində miniatür üslubda rəsm çəkən sənətkarlara "musavvir, rəssam, tərrah, şebih nüvis, nigari, nigarende, meclis nüvis, nakş-bend, ümumi" nəkkaş "adı altında qara qələm kimi adlar verilmişdir.

Ən erkən bilinən miniatürlər, eramızdan əvvəl II əsrdə Misirdə tapılmış papirus üzərindəki miniatürlərdir. Sonrakı dövrlərdə Yunan, Roma, Bizans və Suriya əlyazmaları da miniatürlərlə bəzədilmişdir. Xristianlığın yayılması ilə miniatür xüsusilə əlyazma İncilləri bəzədi.

Miniatür sənəti Avropada VIII əsrin sonlarında inkişaf etmişdir. XII əsrdə miniatürün birbaşa bəzədiləcək mətnlə əlaqəli olduğu, dini miniatürlərlə yanaşı dünyəvi miniatürlərin də hazırlanmasına başlandığı müşahidə edildi. Avropada olan miniatür sənətinə nəzər salsaq görə bilərik ki, klassik miniatizm yalnız orta əsr əlyazma kitabları sənətində inkişaf etmişdir. Başlanğıcda, portret rəssamları ilk sətirləri və baş hərfləri xüsusi bir şəkildə vurğulamağa çalışdılar. Vaxt keçdikcə bəzək elementləri olan rəngli baş hərflər mətni bu və ya digər şəkildə təsvir edən ayrı süjet kompozisiyalarına çevrildi. Qızıl yarpaqdan istifadə edərək suluboya və ya quaş şəklində aparılırdılar.

Orta əsrlərdə Kitab miniatürü Bizansda və Qərbi Avropa ölkələrində böyük mükəmməlliyə çatdı. Başlanğıcda İncil süjetləri kitab miniatüründə üstünlük təşkil etdiyi halda zaman keçdikcə dövlət, hərbi və kilsə liderlərinin, əlyazma sifariş edən zədəganların portretləri onlara əlavə edildi, Zaman keçdikcə ərsəyə

gələn miniatürlərdə mühüm tarixi hadisələr, dövlət mərasimləri, bayram, dini, döyüş və gündəlik səhnələr mövcud olmağa başladı.

İlk dövrlərdəki Qərbi Avropa kitab miniatürləri arasında, İngilis-İrlandiya əlyazmaları üçün illüstrasiyalar, eləcə də 9-10-cu əsrlərdə köhnə və yeni vəsiyyətlərdən "Karolinq İntibahı" nın işıqlandırılmış əlyazmaları, əsasən süjet sahələrində yaradılmışdır.

Miniatür sənəti son orta əsrlərdə Azərbaycan, İran, İraq, Orta Asiya və Anadoludakı Türk və Fars sülalələri dövründə yüksək inkişaf səviyyəsinə çatdı.

Azərbaycanın miniatür ustalarının şərqin poeziya klassikləri sayılan Firdovsi, Nizami, Sədi, Hafiz, Cami, Nəvai, Xosrov Dəhləvi və digərləri tərəfindən yazılmış möhtəşəm əlyazmalara çəkdikləri miniatürlər dünyanın müxtəlif muzeylərində sərgilənir. "Mürəkkə" albomlarında toplanan bənzərsiz bədii estetikliyə sahib Azərbaycan miniatürləri XVI əsrin 30-40-cı illərində inkişafın zirvəsinə çatana qədər uzun və çətin bir tərəqqi yolu keçdiyi bizə məlumdur.

Baş verən tarixi proseslər və onların nəticəsində qurulan mədəni əlaqələr Təbriz miniatür məktəbinin formalaşmasında əsaslı təsir göstərmişdir. Qeyd etmək lazımdır ki, bu məktəbin nümayəndələri müxtəlif dövrlərdə Şərqin bir çox ölkələrində öz fəaliyyətlərini davam etdiriblər. Məşhur sənətkar Mir Seyid Əli və atası Mir Müsəvvirlə uzun müddət Hindistanda Moğol hökmdarlarının saraylarında yaşayaraq müxtəlif sənət inciləri ərsəyə gətiriblər. Böyük Moğol imperiyasının hökmüdarlarından olan Humayun (1530-1539, 1555-1559) və Əkbər şahın (1556-1605) dövründə sarayda baş rəssam kimi çalışan azərbaycanlı miniatür sənətkarları Moğol miniatür məktəbinin formalaşmasında, inkişafında və eyni zamanda yeni bir miniatürçü rəssam nəslinin yetişməsində mühüm rol oynayıblar. Azərbaycan rəssamları tək Moğol sarayında deyil, digər dövlətlərin saraylarında öz ustalıqlarını nümayiş etdiriblər. Buna misal kimi türk miniatür sənətinin inkişafına əhəmiyyətli dərəcədə təsir göstərmiş Şahqultı Nəqqaş, Vəlican Təbrizi, Kamal Təbrizi və bir sıra digər Təbrizli sənətkarları göstərmək olar və onlar müxtəlif dövrlərdə İstanbulda işləmişlər. Adları çəkilən rəssamların içində olan Şahqulu və Vəlican saraylarda olan emalatxanalara rəhbərlik etmişlər. Xalçaçılıq, bədii parça, bədii metalizasiya və keramika sahəsində miniatür üslubuna, bədii formasına və obrazlı ifadə vasitələrinə bənzəyən bir çox qiymətli əsərlər yaradılmışdır[7, s.516].

Azərbaycanın Təbriz, Bakı, Şamaxı və Ərdəbil şəhərləri ölkənin iqtisadi, siyasi və mədəni həyatında mühüm rol oynamışdır. Səmərqənd Teymurun hakimiyyəti dövründə və məşhur şair həmçinin dövlət xadimi olan Əlişir Nəvainin himayəsi altında olduğu "dünyanın xoşbəxt mərkəzi" sayılırsa da işğal altında olan ölkələrin ən yaxşı yaradıcı qüvvələri zorla buraya cəmləşdirilmişdi. Teymurilərin zəiflədiyi dövrdən başlayaraq məşhur bir rəssam Kəmaləddin Behzad rəhbərliyi altında XVI əsrin əvvəllərindən Səfəvi dövlətinin paytaxtı Təbriz, Orta Şərq xalqlarının bədii mədəniyyətinin əsas mərkəzinə çevrildi.

XV əsrin sonunda Təbriz miniatür məktəbi yeni bir çiçəklənmə yaşadı. XVI əsrin əvvəllərində "Xəmsə" nin İstanbul nüsxəsi üçün hazırlanmış 9 miniatür arasında olan "Xosrov Şirini çimərkən görməsi", "İskəndər və Darius", "İsgəndər və çoban", "İsgəndər Nüşabənin sarayında" nümunələrinin hazırlanması 1481-ci ildə Ağqoyunlu hökmüdarı Sultan Yaqubun dövründə başlanmış və Səfəvi hökmüdarı I Şah İsmayılın vaxtında başa çatıb. Bu miniatürlər öz ifadə, kompozisiya mürəkkəbliyi, möhtəşəm dekorativliyi və rəng zənginliyi ilə digər miniatürlərdən köklü şəkildə fərqlənir. XVI əsr və bədii yaradıcılıq baxımından daha dəyərli sayılır. Şübhəsiz ki, bu əsərlər XVI əsrin Təbriz miniatürlər məktəbinin banisi Sultan Məhəmməd, onun müasirləri və tələbələri tərəfindən həyata keçirilmişdir. Bu dövrdə və daha sonra Təbrizdə hazırlabnan və müəllifli bilinməyən ən mükəmməl miniatürlərin Sultan Məhəmməd məktəbinin və ya onun üslubunun təsiri ilə hazırlanmasının fikrinin qəbul edilməsi də təsadüfi deyil.

Təbriz miniatür məktəbinin çiçəklənməsinin zirvəsi XVI əsrin ortalarına təsadüf edir. Mərkəzləşdirilmiş Səfəvi dövlətinin qurulması ilə Azərbaycanın paytaxtı Təbriz yenidən Yaxın və Orta Şərqdə əsas mədəniyyət, estetik düşüncə və bədii yaradıcılıq mərkəzinə çevrilir (4, s.109).

Təbrizdəki Şah İsmayıl və Təhmasibin saray kitabxanasında çalışan görkəmli ustalar arasında Sultan Məhəmmədin rəhbərliyi altında Mir Müsəvvir, Mirzə Əli Təbrizi, Mir Seyid Əli, Müzəffər Əli kimi istedadlı yerli sənətkarlarların adlarını qeyd etmək olar və eyni zamanda onlarla yanaşı bu emalatxanalarda görkəmli ustalar, xəttatlar da bənzərsiz sənət incilərinin yaranmasında yaxından iştirak ediblər. Bundan əlavə bu məktəbdən təsirlənən və öz fəaliyyətlərini şərqin digər türk dövlətlərində davam etdirən sənətkarlardan sayılan Kəmaləddin Behzadə, Ağamirək İsfahani, Şah Mahmud Nişapuri, Dust Məhəmməd və digərlərinin əsərlərində də miniatür sənətinin zərifliyi özünü biruzə verir.

Onların çoxu savadlı, hərtərəfli inkişaf etmiş şəxsiyyətlər idi və bədii fəaliyyətləri incəsənətin yalnız bir sahəsi ilə məhdudlaşmırdı. Bu sənətkarlar tarix və ədəbiyyata gözəl bələddilər. Bəzi məşhur miniatürçü rəssamlar gözəl şair Mirzə Seyid Əli, Şahqulu Sadiq bəy Əfşar, xəttat dekorativ sənət ustaları olmuşlar. Bu fırça ustaları həm XVI əsr Təbriz məktəbinin inkişafında, həm də bütövlükdə Şərq rəssamlığı tarixində

böyük rol oynamışdır. Bu istedadlar kəhkəşanına isə Ustad Nizaməddin Sultan Məhəmməd rəhbərlik edirdi (3, s.423).

XVI əsrin əvvəllərindən Təbriz miniatür məktəbinin klassik ədəbiyyatla əlaqələri daha da genişlənir. Təbriz sənətkarlarının hazırladıqları miniatürlərdə şərq klassiklərin poetik əsərləri qəhrəmanlarının süjet və obrazları əsas yer tutur. Miniatürlərin əksəriyyəti və ən yaxşıları iki əsər – "Şahnamə" və "Xəmsə" üçün yaradılmışdır. XVI əsrin əvvəllərindəki Təbriz məktəbinin bədii üslub xüsusiyyətlərini özündə cəmləşdirən miniatürlərdən 1524-cü il "Xəmsə" (Metropolitan Muzeyi, Nyu-York), "Şahnamə" (Şərq İnstitutu) əlyazmalarına çəkilən illüstrasiyaları qeyd etmək olar. Tədqiqatlar göstərir XVI əsrə qədər olan miniatürlər öz sadə kompozisiya quruluşu, rəngi, obrazların həlli və mənzərə motivləri baxımından nisbətən yığcam olması ilə seçilirdi, XV əsrdən etibarən isə bu ənənə özündə möhtəşəm dekorativ xarakter daşıyaraq lakonik üslubdan yeni üsluba keçid mərhələsini təşkil etməyə başladı.

XVI əsrdə Təbriz Avropa-Asiya ticarətinin əsas mübadiləsi olan karvanyollarının ən vacib nöqtəsi idi. Səfəvi hökmdarları tərəfindən Qərbi Avropaya sürgün edilən səfirlik üzvlərindən biri Oruc bəy Bayat idi və Don Juan Fars, Təbrizi "Şərqin paytaxtı" adlandırdı və tarixçi Xandamir bu bölgəni ən firavan dünya şəhəri adlandırmışdır (6, s.37).

Bu dövrdə Səfəvilər dövlətinə Şah İsmayıl və onun oğlu Təhmasib kimi savadlı bir sənətsevər hökmdarların başçılıq etməsi, mədəniyyət və incəsənətin inkişafı üçün lazımi imkan və şərait yaradırdı. Onlar elm və incəsənət xadimlərinə himayədarlıq edir, xalq sənətkarlarını mükafatlandırırdılar. Məlumdur ki, Şah İsmayıl yalnız Xətai təxəllüsü ilə gözəl, lirik şerlər, "Dəhnamə" poemasını Azərbaycan dilində yazan istedadlı şair olması ilə yanaşı xəttatlıq sənətini də dərindən öyrənmişdi.

Şah İsmayıl sarayı bir çox cəhətdən şair və mesenat, sənətsevər Lorentso Mediçinin Florensiya sarayını xatırladırdı. Şah İsmayılın sarayında görkəmli Azərbaycan şairi Həbibinin başçılıq etdiyi ədəbi məclis fəaliyyət göstərirdi. Sarayda tez-tez musiqili və dəbli axşamlar, alimlərin disputları, şairlərin görüşləri və idman yarışları təşkil olunurdu.

Şah İsmayılın oğlu Təhmasib şah da sənətin qəd-qiymətini bilən idi. Hələ uşaqlıqda o, rəssamlıqla məşğul olurdu. Qazı Əhmədin dediyinə görə, Təhmasib bir çox əsərlər, o cümlədən Qəzvində "çıxıl sütun" eyvanında məişət səhnələrini təsvir edən şəkillər çəkmişdi. Təhmasib həmçinin xəttatlıqla da məşğul olurdu. On yaşlı Təhmasibin 1524-1525-ci illərdə üzünü köçürdüyü şair Arifinin "Quy və Çovqan" əlyazması hazırda Sankt-Peterburqda Saltıkov-Şedrin adına kitabxanada saxlanılır. İsgəndər Münşinin yazdığına görə, şah Təhmasib sənəti çox sevirdi. Böyük bir ölkənin hakimi olan şah daim dövlət işləri ilə məşğul olsa da, rəssamlığı unutmurdu və asudə vaxtını ona sərf edirdi. O yalnız hakimiyyətinin son illərində bütünlükdə dövlət işləri ilə məşğul olurdu və incəsənətə diqqət yetirməyə də vaxt tapırdı (5, s.227).

XVI əsr tarixçisi Şərəf xan Bidlisi xəbər verir ki, şah Təhmasib öz oğlanlarını tərbiyə edərkən "Onlara hərb elmini tədris edir, kamandan ox atmağı, zovqan oynatmağı öyrədirdi və deyirdi: vaxt gələr, rəssamlıqla da məşğul olarsınız, çünki o, zövq tərbiyə edir".

Birinci Səfəvilər-Şah İsmayıl və Təhmasibin dövründə Təbrizdə və Azərbaycanın digər şəhərlərində elm, o cümlədən, astronomiya, tarixşünaslıq, fəlsəfə inkişaf edirdi. Əsrin əvvələrində Şah İsmayıl təşəbbüsü ilə Marağa rəsədxanası bərpa edildi.

XVI əsrdə Azərbaycan poeziyası sürətlə inkişaf etdi. Onun zirvəsini böyük mütəfəkkir şair Füzulinin yaradıcılığı təşkil edirdi. Xalq aşıq poeziyası da inkişafda idi. Onun ən görkəmli nümayəndəsi aşıq Qurbani idi. Klassik və folklor musiqisi, teatr tamaşaları öz inkişafını davam etdirirdi. Bu cür inkişaf etmiş bədii ədəbiyyat təbii ki, öz böyük təsirini incəsənətə də göstərmişdir. Zəngin ədəbi irsə malik nümunələr özlərini rənglərin harmoniyası ilə birləşmiş şəkildə nəfis miniatür nümunələrində tapırdılar.

1530-1540-cı illərdə Təbriz məktəbinin təmsil etdiyi Şərqin miniatür sənəti ən yüksək inkişaf səviyyəsinə çatdı. Bu dövrdə bədii, estetik və sənətkarlıq baxımından ən mükəmməl miniatürlərlə bəzədilmiş bir çox qiymətli əlyazma yaradılmışdır.

Sonda qeyd etmək lazımdır ki, Azərbaycanda XVI əsrdə miniatür sənətinin inkişafının əsas səbəblərindən biri bu ərazidə vahid mərkəzləşmiş dövlətin olması idi. Bu dövrdə yaranan Səfəvilər dövlətinə Şah İsmayıl və onun oğlu Təhmasib kimi savadlı bir sənətsevər hökmdarların başçılıq etməsi, mədəniyyət və incəsənətin inkişafı üçün lazımi imkan və şərait yaradılması miniatür sənətindən də yan keçmədi. Onlar elm və incəsənət xadimlərinə himayədarlıq edir, xalq sənətkarlarını mükafatlandırırdılar. Məlumdur ki, Şah İsmayıl yalnız Xətai təxəllüsü ilə gözəl, lirik şerlər, "Dəhnamə" poemasını Azərbaycan dilində yazan istedadlı şair olması ilə yanaşı xəttatlıq sənətini də dərindən öyrənmişdi.

XVI əsrin ortalarında Sultan Məhəmməd, Mir Müsəvvir, Dust Muhammad və s. sənətkarlar bir sıra portret miniatürlər yaratmışlar. Müəyyən kanonlara əsasən yaradılan bu portretlərin əsas məqsədi hökmdarın fiziki gözəlliyini tərənnüm etməkdir. XVI əsrin ikinci yarısında Səfəvi dövləti paytaxtını Təbrizdən Qəzvinə

köçürdükdən sonra saray kitabxanasında çalışan bir qrup sənətçi yeni mərkəzə toplandı. 1575-ci ilədək Azərbaycan rəssamlarının Qəzvində çəkdikləri miniatürlər bədii üslublarına görə Təbriz dövründəki ilə fərqlənmir və Təbriz üslubunun məntiqi davamıdır.

## Ədəbiyyat

1. Əfəndiyev R.T. (2001) "Azərbaycan incəsənəti" Bakı, "Elm", 344 səh.
2. Həbibov N.A. (1966) "Azərbaycan sovet rəssamlığı" Bakı, 197 səh.
3. Heydər Əliyev və Azərbayacan incəsənəti (2000) Məqalələr toplusu. Bakı, 520 səh.
4. Kərimov K.O. (1980) "Azərbaycan miniatürləri" Bakı, 280 səh.
5. Власов В.Д., Миниатюра Г.М. (2006) «Новый энциклопедический словарь изобразительного искусства», Искусство Азербайджана, 620 стр.
6. Ingo F.A. (2005) "Masterpieces of Illumination", Köln, 350pp.
7. Крымский А.Е. (1981), «Низами и его современники», Баку, «Элм» 743 стр.

**Rəyçi: prof. R.Tağıyeva**

Göndərilib: 17.03.2021 Qəbul edilib: 23.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/91-93

**Şəhriyar Rəhman oğlu Cəfərzadə**
Bakı Dövlət Universiteti
magistrant
shahriyarjafari11@gmail.com

# CƏMİYYƏTİN MƏDƏNİ HƏYATINDA İŞTİRAK ETMƏ HÜQUQUNUN REALİZƏSİNİN DİGƏR HÜQUQLARLA QARŞILIQLI ƏLAQƏSİ

***Açar sözlər:*** *insan hüquqları, əqli mülkiyyət hüquqları, mədəni hüquqlar, cəmiyyətin mədəni həyatında iştirak etmə hüququ, mədəniyyət hüququ*

**Interrelation of the realization of the right to participate in the cultural life of society with other rights**

**Summary**

As one of the basic human rights, the right to participate in the cultural life of community is intertwined with the number of human rights. When we analyze both the norms of international law and domestic norms, we see this feature of the law. Thus, in the norms of international law, creative freedom and intellectual property rights are considered together with the right to participate in cultural life. Although the Constitution of the Republic of Azerbaijan specifies the rights mentioned separately, the content of these norms connects these rights. Thus, both literary and artistic, as well as scientific and technical activities, which are part of creative freedom, are considered participation in cultural life. The implementation of these two activities creates intellectual property rights.

***Key words:*** *human rights, intellectual property rights, cultural rights, right to participate in cultural life of community, information right, cultural right*

## Giriş

İnsan hüquqlarını təşkil edən bir sıra hüquqlar kimi cəmiyyətin mədəni həyatında iştirak etmə hüququ da, bir sıra digər hüquqlarla qarşılıqlı əlaqədədir. Qeyd olunan əlaqə bu hüquqların realizəsi prosesində özünü daha da, qabarıq formada göstərir. Belə ki, bir sıra hallarda müəyyən hüquqların həyata keçirilməsi digər hüquqlar olmadan qeyri-mümkün olur. Bir-birindən daim asılı olmaq və daim qarşılıqlı fəaliyyət göstərməsi elə insan hüquqlarının əsas xüsusiyyətidir. Cəmiyyətin mədəni həyatında iştirak etmə hüququ da əsas insan hüquqlarından biri kimi bir çox hallarda istər mədəni hüquqlara daxil olan hüquqlar, istərsə də, digər kateqoriya insan hüquqları ilə hər zaman qarşılıqlı fəaliyyət göstərir. Aşağıdakı yazıda cəmiyyətin mədəni həyatında iştirak etmə hüququnun hansı insan hüquqları ilə qarşılıqlı əlaqədə olması qısa şəkildə təhlil olunacaqdır.

Yuxarıda da, qeyd olunduğu kimi cəmiyyətin mədəni həyatında iştirak etmə hüququ mədəni hüquqlar kateqoriyasına daxildir. Bu baxımdan adıçəkilən hüquq əsasən mədəni hüquqlarla qarşılıqlı əlaqədədir. Hansı hüquqların mədəni hüquqlara aid olması 1966-cı il Sosial, İqtisadi və Mədəni hüquqlar haqqında Beynəlxalq Paktda göstərilmişdir. Mədəni hüquqların siyahısı, əhatə dairəsi sonrakı illərdə ictimai münasibətlərin inkişafı ilə əlaqədar olaraq dəyişilsə də, qeyd olunan Beynəlxalq sənəd bu sahədə qəbul edilmiş əsas sənəd kimi öz aktuallığını bu gündə qorumaqdadır. "İqtisadi, Sosial və Mədəni Hüquqlar haqqında" Beynəlxalq Paktın (1966) 15-ci maddəsində deyilir:

"1. Bu Paktda iştirak edən dövlətlər hər bir şəxsin:

a) mədəni həyatda iştirak etmək;

b) elmi tərəqqinin nəticələrindən və onların praktiki tətbiqindən istifadə etmək;

c) müəllifi olduğu hər hansı elmi, ədəbi, yaxud incəsənət əsərlərinin nəticəsində meydana çıxan maddi və mənəvi maraqların müdafiəsindən istifadə etmək hüququnu tanıyırlar.

2. Bu Paktda iştirak edən dövlətlərin bu hüququ tam şəkildə həyata keçirmək üçün görəcəyi tədbirlər sırasına elmi və mədəni nailiyyətlərin mühafizəsi, inkişafı və yayılması üçün vacib olanlar da daxildir.

3. Bu Paktda iştirak edən dövlətlər elmi tədqiqatlar və yaradıcılıq fəaliyyəti üçün qeyd-şərtsiz olaraq lazım olan azadlığa hörmət etməyi öhdələrinə götürürlər.

4. Bu Paktda iştirak edən dövlətlər elmi və mədəni sahələrdə beynəlxalq əlaqə və əməkdaşlığın həvəsləndirilməsi və inkişafından irəli gələn faydanı təsdiq edirlər".

Bundan əlavə 1948-ci il Ümumdünya İnsan Hüquqları Bəyannaməsinin 27-ci maddəsində də, "Hər bir insanın cəmiyyətin mədəni həyatında sərbəst iştirak etmək, incəsənətdən zövq almaq, elmi tərəqqidə iştirak etmək və ondan bəhrələnmək hüququna malik" olması qeyd edilmişdir.

Hər iki beynəlxalq sənədin məzmununun təhlilində aydın olur ki, cəmiyyətin mədəni həyatında iştirak etmə hüququ əsasən yaradıcılıq azadlığı, əqli mülkiyyət hüququ və mədəniyyət hüququ ilə qarşılıqlı əlaqədədir. Qeyd

olunan hüquq və azadlıqlar cəmiyyətin mədəni həyatında iştirak hüququ ilə birbaşa əlaqəlidir. Bundan əlavə, cəmiyyətin mədəni həyatında iştirak etmə hüququ, bəzi insan hüquqları ilə də, dolayı olaraq bağlıdır. Belə hüquqlara ana dilindən istifadə hüququ, təhsil hüququ aiddir.

UNESCO tərəfindən 2001-ci ildə qəbul edilmiş Mədəni Müxtəlifliyin Qorunmasına dair Bəyannamənin 5-ci maddəsini təhlil etdiyimizdə mədəni həyatda iştirak etmə hüququ ilə təhsil hüququnun qarşılıqlı əlaqədə olduğunu görürük. Həmin maddənin mətnində qeyd olunur ki, mədəni hüquqların ümumbəşəri, bölünməz və bir-birindən asılı olan insan hüquqlarının ayrılmaz hissəsi olması, yaradıcı müxtəlifliyin çiçəklənməsi üçün Ümumdünya İnsan Hüquqları Bəyannaməsinin 27-ci maddəsinin və İqtisadi, Sosial və Mədəni Hüquqlar haqqında Beynəlxalq Paktın 13 və 15-ci maddələrində müəyyənləşdirilən mədəni hüquqların tam həyata keçirilməsinin tələb edilməsi, bu səbəbdən də, hər kəsin öz fikirlərini ifadə etmək və əsərlərini seçdiyi dildə, xüsusən də ana dilində yaratmaq və yaymaq hüququna malik olması; bütün şəxslərin mədəni şəxsiyyətlərinə tam hörmət edən keyfiyyətli təlim və təhsil almaq hüququ; və hər kəsin seçdiyi mədəni həyatda iştirak etmək və insan hüquqları və əsas azadlıqlarına hörmət etməklə öz mədəni təcrübələrini aparmaq hüququ olması qeyd olunmuşdur. Adıçəkilən maddədə Ümumdünya insan hüquqlarının 27-ci maddəsinin və İqtisadi, Sosial və Mədəni hüquqlar haqqında Beynəlxalq Paktın və 15-ci maddələrinin nədən ibarət olması yuxarıda qeyd olunmuşdur. Bu baxımdan keyfiyyətli təhsilin olması cəmiyyətin mədəni həyatında iştirak hüququnun realizəsinin əsas vasitələrindəndir. Qeyd edə bilərik ki, təhsillə bağlı dövlət siyasəti nə qədər səmərəli olarsa mədəni həyatda iştirak etmə hüququ da bir o qədər səmərəli olar. Təhsilin hansı səviyyədə olması isə dövlət tərəfindən onun minimum standartlarının müəyyən edilməsi ilə bağlıdır.

Cəmiyyətin mədəni həyatında iştirak hüququnun bağlı olduğu digər hüquqlardan biri də, ana dilindən istifadə hüququnun olmasıdır. Yendə də, yuxarıda qeyd olunan 2001-ci il Bəyannaməsinin 5-ci maddəsində cəmiyyətin mədəni həyatında iştirak hüququnun realizəsinin təmin edilmə formalarından biri kimi hər kəsin əsərlərini seçdiyi dildə, xüsusən də, ana dilində yaratmaq və yaymaq hüququna malik olması vurğulanmışdır. Qeyd olunan məsələ ilə bağlı, Azərbaycan Respublikasının Konsitusiyasında da, müvafiq maddələr vardır. Belə ki, Konstitusiyanın 45-ci maddəsi ana dilindən istifadə hüququ ilə bağlıdır. Həmin maddədə hər kəsin ana dilindən istifadə hüququnun olmasının və hər kəsin istədiyi dildə tərbiyə və təhsil almaq, yaradıcılıqla məşğul olmaq hüquqlarının olması bildirilir. Yaradıcılıq azadlığının realizəsi isə mədəni həyatda iştirakla təmin olunur.

Cəmiyyətin mədəni həyatında iştirak hüququ insan hüquqlarının klassifikasiyasında mədəni hüquqlar kateqoriyasına daxildir. Bu baxımdan cəmiyyətin mədəni həyatında iştirak etmə hüququ ilə mədəniyyət hüququ birbaşa əlaqədədir. Qeyd olunan əlaqənin aydınlaşdırılması üçün mədəniyyət hüququ dedikdə nəyin nəzərdə tutulduğunu aydınlaşdırmaq vacibdir. Mədəniyyət hüququ (right to culture) beynəlxalq normalarda ümumi hüquq kimi ifadə olunur. Belə ki, həm 1966-cı il Paktında, həm də, 1948-ci il Bəyannaməsində, eləcə də, digər beynəlxalq sənədlərdə mədəniyyət hüququ özündə şəxsin mədəni həyatda iştirak və mədəni sərvətlərdən istifadə hüququ ilə yanaşı, həmçinin elmi tərəqqidə iştirak və elmi yaradıcılıq fəaliyyətini ehtiva edir və bu hüquqlar birlikdə mədəniyyət hüququ (right to culture) adı altında təhlil olunur. Azərbaycan Respublikasının Konstitusiyasında isə mədəniyyət hüququ nisbətən fərqli şəkildə qeyd olunmuşdur. Belə ki, Konstitusiyanın 40-cı maddəsi mədəniyyət hüququ adlandırılır. Həmin normada hər kəsin:

1) mədəni həyatda iştirak etmək, mədəniyyət təsisatlarından və mədəni sərvətlərdən istifadə etmək hüququnun olması
2) tarixi, mədəni və mənəvi irsə hörmətlə yanaşmalı olması, ona qayğı göstərməsi, tarix və mədəniyyət abidələrini qorumalı olması qeyd olunur.

Göründüyü kimi Azərbaycan Respublikasının daxili qanunvericilik normaları mədəniyyət hüququnu beynəlxalq normalarda qeyd olunan formadan daha fərqli formada təhlil edir. Beynəlxalq normalarda mədəniyyət hüququ daha geniş mənada ifadə edildiyi halda, AR Konstitusiyası nisbətən dar mənada istifadə etmişdir. Bununla belə mədəni həyatda iştirak etmə hüququnun mədəniyyət hüququnun tərkibində olması cəmiyyətin mədəni həyatında iştirak hüququ ilə mədəniyyət hüququnun birbaşa əlaqəli olmasını göstərir. Qeyd olunan 2 hüquq ayrı-ayrı dövlətlərin qanunvericiliyində müxtəlif formalarda bir-birindən ayrı və ya birlikdə təhlil olunsa da, mahiyyət etibarı ilə eyni mənanı ifadə edir və hər 2 hüquq qarşılıqlı əlaqədədir.

Azərbaycan Respublikası Konstitusiyasının 51-ci maddəsi yaradıcılıq azadlığına aiddir. Qeyd olunan maddə hər kəsin yaradıcılıq azadlığının olmasını və dövlət tərəfindən ədəbi-bədii, elmi-texniki və başqa yaradıcılıq növlərinin azad şəkildə həyata keçirilməsinə dövlət təminatını ifadə edir. Yaradıcılıq azadlığının mahiyyəti ilə bağlı Azərbaycan Respublikası qanunvericiliyi ilə beynəlxalq normalar arasında müəyyən qədər fərqlilik var. Belə ki, yuxarıda sadalanan beynəlxalq sənədlər də, daxil olmaqla bir sıra beynəlxalq kovensiya və bəyannamələrdə yaradıcılıq azadlığı cəmiyyətin mədəni həyatında iştirak etmə hüququnun bir komponenti kimi çıxış edir. Qeyd olunan məsələ BMT-nin İqtisadi, Sosial və Mədəni Hüquqlar üzrə Komitəsi də 21 nömrəli Şərhində də (Committee on Economic, Social and Cultural Rights. Right of everyone to take part in cultural life (art. 15, para.

1 (a), of the International Covenant on Economic, Social and Cultural Rights, 2009) öz təsdiqini tapır. Belə ki, həmin şərhdə cəmiyyətin mədəni həyatında iştirakının 3 forması göstərilir ki, bunlara iştirak, əlyetərlik və töhvə aid edilir. Komitənin şərhində töhvə dedikdə müxtəlif istiqamətlər üzrə yaradıcılıq fəaliyyətinin həyata keçirilməsi nəzərdə tutulur. Komitə tərəfindən verilən şərhdə yaradıcılıq fəaliyyəti mədəni həyatda iştirak etmənin bir kompanenti olduğu üçün bu baxımdan hər bir yaradıcılıq fəaliyyətini mədəni həyatda iştirak kimi hesab edə bilərik. Belə olan halda milli qanunvericiliklə beynəlxalq normalar arasında uyğunsuzluq əmələ gəlir. Çünki yuxarıda da, göstərildiyi kimi AR-nın Konstitusiyası qeyd olunan 2 məsələni ayrı-ayrılıqda qəbul edir. Mədəni həyatda iştirak etmə mədəniyyət hüququnun öz tərkibində göstərildiyi halda, yaradıcılıq azadlığı isə ayrıca konstitusion bir azadlıq kimi göstərilmişdir.

Yaradıcılıq azadlığını və cəmiyyətin mədəni həyatında iştirak etmə hüququnu əlaqəli şəkildə təhlil etdiyimizdə hər iki hüququn əslində bir-birindən asılı olduğu açıq şəkildə görsənir. Belə ki, yaradıcılıq Konstitusiya tərəfindən şəxsə verilmiş azadlıqdır. Bu azadlığın realizə edilib-edilməməsi şəxsin öz subyektiv mülahizəsidir. Şəxs isə yaradıcılıq azadlığını həyata keçirdiyində dolayı yolla elə cəmiyyətin mədəni həyatında iştirak etmiş olur. Bu baxımdan da, Konstitusiyada nəzərdə tutulmuş ədəbi-bədii və elmi-texniki yaradıcılıq fəaliyyətini (AR Konstitusiya 51-ci maddə) həyata keçirən şəxs cəmiyyətin mədəni həyatında iştirak etmiş olur.

Yuxarıda sadalanan hüquq və azadlıqların ardıcıllıqla həyata keçirilməsi yekunda əqli mülkiyyət hüquqlarının əmələ gəlməsinə gətirib çıxarır. Belə ki, yaradıcılıq hüququnu həyata keçirmək istəyən şəxs elmi-ədəbi və ya elmi-texniki olmaqla müxtəlif fəaliyyət sahələri ilə məşğul ola bilir, bunun yekununda isə şəxsin əqli mülkiyyət hüquqları əmələ gəlir. Bütün qeyd olunan bu proses mədəniyyət hüququnun tərkibində cəmiyyətin mədəni həyatında iştirak hüququnun realizəsidir. Konstitusiyanın 30-cu maddəsidə müəlliflik, ixtiraçılıq və əqli mülkiyyət hüququnun başqa növlərinin qanunla qorunmasına təminat verilməsidir. Əqli mülkiyyət hüququ ilə cəmiyyətin mədəni həyatında iştirak hüququnun arasındakı əlaqəni isə Konstitusiyanın 30-cu maddəsində sadalanan hüquqların anlayışını müəyyənləşdirdikdə görə bilirik. Daxili qanunvericilik normlarında əqli mülkiyyət hüququnun anlayışı verilməsə də, həm Konstitusiyanın 30-cu maddəsində, həm də, "Əqli Mülkiyyət Hüquqlarının təminatı və Piratçılığa Qarşı Mübarizə Haqqında AR Qanunun" 1.0.1-ci maddəsində əqli mülkiyyət hüququ (ları) dedikdə onun obyektləri sadalanır. Konstitusiyanın müvafiq maddəsində əqli mülkiyyət hüququnun birinci növü kimi müəlliflik hüququ qeyd olunur ki, "AR-nın Müəlliflik Hüququ və Əlaqəli Hüquqlar Haqqında Qanunun" 1-ci maddəsində müəlliflik hüuqu kimi elm, ədəbiyyat və incəsnət əsərlərinin yaradılması ilə əmələ gələn münasibətlər nəzərdə tutulur. Əqli mülkiyyət fəaliyyətinin digər növü olan ixtiraçılıq isə (Patent haqqında AR Qanunu 25 iyul 1997) ixtira, faydalı model və sənaye nümunələrinin yaradılmasıdır. Qeyd olunan qanunun məzmununu təhlil etdiyimizdə görə bilirik ki, ixtiraçılıq fəaliyyəti birbaşa olaraq elmi-texniki yaradıcılıq hesab olunur. Sadalananları ümumi şəkildə təhlil etdiyimizdə qeyd edə bilərik ki, əqli mülkiyyət hüquqlarını həyata keçirən şəxs həmçinin, öz yaradıcılıq azadlığını realizə edir ki, bütün bu qeyd olunan proses şəxsin cəmiyyətin mədəni həyatında iştirak etmə hüququnun bir formasıdır.

## Nəticə

Yuxarıdakı təhlili ümumiləşdirərək qeyd edə bilərik ki, yaradıcılıq azadlığının bir forması kimi istər əqli mülkiyyət fəaliyyəti, istərsə də, digər növ yaradıcılıq fəaliyyətləri öz əsasını şəxsin mədəni həyatda iştirak etmə hüququndan götürür. Əlavə olaraq Konstitusiyada bu hüquqların hamısı mədəniyyət hüququnun tərkib hissəsi kimi göstərilir. Əlbətdə ictimai münasibətlərin sonrakı inkişafı əqli mülkiyyət hüquqlarının əhatə dairəsinin daha da, genişlənməsinə səbəb olmuş və əqli mülkiyyət hüququnun müxtəlif yeni sahələrinin yaranmasına yol açmışdır. Bununla belə əqli mülkiyyət hüququ ilə mədəni həyatda iştirak hüququnun əlaqəsi qalmaqdadır. Dolayısı ilə cəmiyyətin mədəni həyatında iştirak hüququna AR Konstitusiyası ilə təminat verilməsi də, bu sahədə fəaliyyəti daha da, stimullaşdırır və onun inkişafına yol açır.

## Ədəbiyyat

1. Committee on Economic, Social and Cultural Rights. Right of everyone to take part in cultural life (art. 15, para. 1 (a), of the International Covenant on Economic, Social and Cultural Rights, 2009
http://docstore.ohchr.org/SelfServices/FilesHandler.ashx?enc=4slQ6QSmlBEDzFEovLCuW1a0Szab0oXTdImnsJZZVQc5ReG9hKvddWC2ML5U76E63nT%2BeY%2BtmSVIRS0ynN0q4EDmpjJye7rC1DxEtC%2FGxx7WLBcmnxGwpWSXy0fmnHDS
2. Azərbaycan Respublikasının Konstitusiyası 12 noyabr 1995
3. Patent haqqında Azərbaycan Respublikası Qanunu 25 iyul 1997

**Rəyçi: h.f.d. G.Rzayeva**

Göndərilib: 14.03.2021 Qəbul edilib: 22.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/94-96

**Aysel Rövşən qızı Baxşəliyeva**
Azərbaycan Turizm və Menecment Universiteti
Magistrant
aska_rovsenli@mail.ru

# AZƏRBAYCANDA İNVESTİSİYA MÜHİTİNİN QİYMƏTLƏNDİRİLMƏSİ MƏSƏLƏLƏRİ

***Açar sözlər:*** *investsiya fəaliyyəti, iqtisadi qiymətləndirmə, dinamik göstəricilər, iqtisadi göstəricilər*

**İssues of assessing the investment climate in Azerbaijan**
**Summary**

Our country, which is constantly developing economically and carrying out political reforms in parallel, thereby achieving a further increase in its international prestige. One of the important factors contributing to the regular strengthening of Azerbaijan's position in the international arena is the growing role of our country in the field of energy security, as well as its active investment policy. At present, our country is becoming one of the most advanced potential investors in the world. The number of foreign countries expecting to invest in Azerbaijan is constantly growing. Azerbaijan, which has great financial resources, has been investing in various foreign countries in recent years, provided that its interests are ensured.
***Key words:*** *investment activity, economic assessment, dynamic indicators, economic indicators*

İnvestisiya mühitinin formalaşdırılması prosesləri hər bir ölkənin iqtisadi siyasətinin strateji istiqamətlərindən biri kimi diqqət çəkir. Bunun əsas səbəbi iqtisadi inkişaf proseslərində davamlı şəkildə investisiya resurslarına və maliyyə təminatına zərurətin olması ilə bağlıdır. Dövlətin investisiya siyasətinin optimal formalaşdırılması üçün bütün məsələlər kompleks şəkildə təhlil olunmalı və investisiya siyasətinin ana xətti kimi qəbul edilən mexanizmlər uzunmüddətli dövrü əhatə etməklə əsaslandırılmalıdır.

Azərbaycanda beynəlxalq investisiyaların hərəkətinin istiqamətləri,qloballaşma prosesi bağlıdır:

- həyata keçirməyə imkan verən mövcud qanunvericilik aktlarının təkmilləşdirilməsiölkəyə xarici sərmayələr əlverişli və əlverişli investisiya qoyuluşu yolu ilə yatırılır, əlverişli investisiya mühiti və hüquqi normaların müəyyən edilməsi biznesmenlər və onların beynəlxalq standartlara uyğunlaşdırılması və hər cəhətdən tələblər;
- dünyada ölkənin reklam bazarının yaradılması üzərində işləməkbeynəlxalq təcrübənin ən təsirli kapital axınları;
- mövcud təşkilatların funksiyalarını birləşdirmək və ya əlaqələndirməkpotensial investorlarınaxtarışı və cəlb edilməsi üzrə vahid dövlət qurumuinkişaf tələb olunan sahələr üçün xarici investorlar;
- dövlətlərin milli və beynəlxalq maraqlarının qorunması və uyğunlaşdırılması; xarici investisiya siyasətində ölkə, dövlət və cəmiyyətölkənin beynəlxalq konvensiyalara əməl etməyə sadiqliyi, dünyanın bir çox ölkələri tərəfindən qəbul edilmiş müqavilələr və qərarlar;
- onları rasionallaşdırma yolu ilə Xalq təsərrüfatının bütün sahələrinə yönəltməkxariciinvestisiyaların tətbiqi və cəlb edilməsinin sahə strukturuinvestisiya;
- Birbaşa investisiyalardan əlavə, biznesin inkişafı üçün əlverişli şərait yaratmaq lazımdır. Ölkəmizə portfel investisiyalarının cəlb edilməsi şərtləridünya standartlarına uyğunolaraq Qiymətli kağızlar bazarının formalaşdırılması, investisiya xüsusiyyətlərini nəzərə alaraq. Çünki valyuta riski beynəlxalq (birbaşa və portfel) investisiyaların idarə edilməsi məsələləri əməliyyatlar mühüm amillər kimi qəbul edilməlidir;
- ölkənin bank sisteminin dəstəyində zəif iştirakıinvestisiya fəallığı ləğv edilməlidir. Ümumi həcmdə yerli bankların payıxarici kapitalın cəlb edilməsi ilə investisiya layihələrinin xidməti olmalıdırqənaətbəxş səviyyəyə qaldırılmışdır;
- Xarici investorların cəlb edilməsində vacib olan istiqamətlərdən biri də budur ən vacib və milli maraqlar-xüsusi diqqət göstərilməlidirməhsulların idxalının təşkili verilir;
- Məsələ burasındadır ki, xarici investisiyalar təkcə daxili investisiyalara deyil, həm də xarici investisiyalara qatılmamalıdır mərkəz, eyni zamanda, bölgələrdə də dövlət səviyyəsində qəbul edilməlidir sənaye iqtisadiyyatının digər göstəriciləri;
- müasir iqtisadiyyata xarici investisiyaların cəlb edilməsi ilə bağlı konkret vəziyyətin öyrənilməsi; xarici invest.

Sənayeyə yönəlmiş xarici investisiyaların səmərəli və məqsədyönlü istifadə, olan biri ölkənin xalq təsərrüfatının əsas sahələrindən biri tam hüquqlu təminatçı olacaqonun cəlb olunmasının stimullaşdırılması, ölkənin davamlı gələcək inkişafı, onun dünya iqtisadiyyatında vəziyyət və inteqrasiyasıüçün zəruridir. Xarici investisiyalar üçün zəruri hüquqi mühitin zənginləşdirilməsinin gücləndirilməsi və onu mütərəqqi dünya sinifinə uyğunlaşdırmaq

ölkənin daxil olmasını daha da inkişaf etdirə bilərxarici sərmayələr ölkəmizə qloballaşmada fəal iştirak etməyə kömək edə bilər.

İnvestisiya fəaliyyətinin dövlət tənzimlənməsi dedikdə, PT-nin kompleks tədbirlər sistemi nəzərdə tutulurölkədə vahid iqtisadi, elmi-texniki, sosial siyasətin həyata keçirilməsi.

Bu tədbirlərin maliyyələşdirilməsi respublika və yerli büdcələrin vəsaiti hesabına həyata keçirilir.

İnvestisiya qoyuluşları ilk növbədə diqqət mərkəzindədirki, ictimai tələbatın ödənilməsi və iqtisadiyyatın strateji sahələrinin inkişafı təmin edilsin.

Mülkiyyət və mülkiyyət formasından asılı olmayaraq, respublikada investisiyalar bu ölkənin fəaliyyət göstərdiyi ölkənin qanunvericiliyi ilə tənzimlənir.

Dövlət respublikamızın sosial-iqtisadi inkişafı, eləcə də yaradılmasını müvafiq xalq təsərrüfatında proporsiyalar, istehsal və sosial sahələrin formalaşdırılması infrastrukturunun inkişafına nəzarət edir.

Məlum olduğu kimi, istənilən istehsal və sosial istehsalatın yaradılması, istehsalı, genişləndirilməsi sahələr, deməli, məşğulluğun təmin edilməsi müvafiq investisiyalar və daha səmərəli iş istifadəsini tələb edir.

Bunun üçün ölkənin lazımi maliyyə və maddi resursları olmalıdır.

Əks təqdirdə, xarici sərmayədarların formalaşdırılmasını təmin etmək məqsədilə ölkəyə cəlb edilməsi və xalq təsərrüfatı inkişafı olmalıdır. Ona görə də müasir şəraitdə bazar iqtisadiyyatı, ölkəmiz qarşılıqlı investisiyaları tam həcmdə reallaşdırmaq imkanına və xarici ölkələrin maraqlarına riayət edilməsi və milli iqtisadiyyatın inkişafı malikdir.

Azərbaycanın iqtisadiyyatında xarici investisiyaların rolu və əhəmiyyəti olduqca böyük və yüksəkdir. Ölkədə makroiqtisadi göstəricilərin artması rolun yüksəldilməsini tələb edir daxili məhsulun strukturunda aparıcı sahələrin əhəmiyyəti, xüsusilə də strateji sahədir. Bu baxımdan xarici investisiyaların artırılması Respublikanın tənzimlənməsi və dövlət tərəfindən tənzimlənməsi, habelə Azərbaycan Respublikasında zəruri proporsiyaların təmin edilməs iqtisadiyyatın inkişafı böyük elmi və praktiki əhəmiyyətə malikdir. Bundan başqa, dövlət müxtəlif metodlardan (iqtisadi mexanizmlərdən) fəal istifadə etməlidir) investisiya fəaliyyətinin tənzimlənməsində mexanizmlər aşağıdakı kimi ümumiləşdirmək olar:

- vergitutma subyektlərinin fərqləndirilməsi ilə vergi sisteminin tətbiqi vəObyektlər, vergi dərəcələri və endirimlər;
- sürətli hesabına, o cümlədən kredit və amortizasiya siyasəti həyata keçirilməsiƏsas vəsaitlərin amortizasiyası. Amortizasiya ayırmaları müxtəlif ola bilər iqtisadiyyatın müxtəlif sahələrində, müxtəlif növlərdə vəəsas vəsaitlərin və avadanlıqların elementləri;
- subvensiyalar, subsidiyalar, fərdi inkişaf üçün büdcə kreditləri regionlar, sahələr və sənaye;
- dövlət normalarının və standartlarının müəyyən edilməsi;
- antiinhisar tədbirlərinin qəbul edilməsi;
- torpaq, su və digər təbii ehtiyatlardan istifadə şərtlərinin müəyyən edilməsi resurslar;
- qiymət siyasətinin həyata keçirilməsi;
- İnvestisiya imkanları ekspertizası keçirilməsi;

Bundan başqa, investisiya fəaliyyətinin dövlət tərəfindən tənzimlənməsi dövlət investisiyalarının idarə edilməsini də əhatə edir.

İnvestisiya fəaliyyəti, həmçinin investisiya fəaliyyətinin tənzimlənməsi və nəzarət

bu şərtlərə investisiya fəaliyyətinin bütün subyektləri tərəfindən riayət edilməlidir.

Dövlət investisiyalarının idarə edilməsi respublika və yerli hakimiyyət orqanları tərəfindən həyata keçirilirhəmçinin idarəetmə orqanları büdcədən, büdcədənkənar fondlardan və digər fondlardan ibarətdirinvestisiya şərtlərini müəyyən edən və bu agentliklər tərəfindən cəlb olunan resurslar, bununla bağlı digər məsələlərin həlli zəruridir. Milli iqtisadiyyatın dinamik və davamlı inkişafının qiymətləndirilməsi üçün: yenilikçi konsepsiya və innovasiya sistemini düzgün şəkildə şərh etmək vacibdir. Buna görə də, milli innovasiya sisteminə baxarkən, ilk növbədə aşağıdakıları nəzərə almaq lazımdır və hesab edilməlidir:

1. Uzunmüddətli iqtisadi artım;
2. İqtisadi inkişafın fiziki, qlobal istiqaməti;
3. Milli iqtisadiyyatın rəqabət üstünlükləri və inkişaf istiqamətləri;
4. Daxili və dünya bazarlarının tələbləri;
5. Xalq təsərrüfatının inkişafının vəziyyəti və fəaliyyət şərtləriiqtisadiyyat;
6. Mühasibat balansının vəziyyəti və istifadə dərəcəsi;
7. Milli iqtisadiyyatın tələbatlarına aparan struktur dəyişikliklərinin dərəcəsi

Bütün bu istiqamətlərin həyata keçirilməsi üçün dövlət bu sahədə müvafiq qanunlar qəbul edir elmi-texniki siyasəti. Hər bir dövlət öz milli maraqlarını müəyyən edir, onların elmi-texniki siyasəti. Elmi tədqiqatların nəticələri

çox vaxt gözlənilən nəticəni vermir. Beləliklə, özəl sektor fundamental tədqiqatlara sərmayə qoymaq üçün xüsusi səy göstərmir.

Bütün ölkə iqtisadiyyatı üçün ett əhəmiyyətini nəzərə alaraq, onun dünyada öz mövqelərini möhkəmləndirmək üçün dövlət inkişaf üçün bu sahədə mühüm əhəmiyyət kəsb edir.

Lakin ETT-nin nəticələri məhsulun maya dəyərinin aşağı düşməsinə gətirib çıxardıqca, texniki və texnoloji yeniləmə, keyfiyyət və rəqabət, bir çox hallarda,özəl sektor onun nəticələrinin araşdırılmasında xüsusilə maraqlıdır.

Azərbaycan iqtisadiyyatına BXİ-nin daxilinə 1995-ci ildən etibarən başlanıldığını deyə bilərik. 1991-ci ildə müstəqilliyin bərpasından sonrakı illərdə müşahidə edilən siyasi formalı sabitsizliyin 1994-cü ildə aradan götürülməsi, Qarabağ müharibəsində atəşkəsin elan olunması, əsasən də 1994-cü ilin sentyabr ayında ölkənin birinci beynəlxalq neft sazişi "Azəri-Çıraq-Günəşli" yə əsasən Hasilatın Pay Bölgüsü Sazişinin imzalanması ölkəyə BXİ-nın gəlməsinə şərait yaratdı.

DSK-nın məlumatına görə 1995-2017-ci illər ərzində ölkə iqtisadiyyatına ümumi olaraq 125.5 mlrd. dollar miqdarında xarici investisiya daxil edilib, bunun da 96.1 faizi 2000-2017-ci illər ərzində baş vermişdir. 2000-2017-ci illər ərzində ölkəyə daxil edilən investisiyanın 29.2 mlrd. dolları Azərbaycanın və ayrı-ayrı dövlələrin beynəlxalq maliyyə və kredit təşkilatlarından cəlb olunan maliyyə kreditləri, 77.8 mlrd. dolları birbaşa xarici investisiyalar, 217.7 mln. dolları neft bonusu, 13.4 mlrd. dolları digər investisiyalar olmuşdur.

2000-2017-ci illər ərzində Azərbaycan iqtisadiyyatına istiqamətlənən 77.8 mlrd. dollar Birbaşa Xarici İnvestisiyanın 66.8 mlrd. dolları neft sektorunda, 19.9 mlrd. dolları qeyri-neft sahələrində həyata keçirilmişdir.

İllərə əsasən neft sektoruna daxil edilən BXİ-nin miqdarı hər zaman qeyri-neft sahəsi ilə müqayisə etdikdə dəfələrlə çox olmuşdur

**Diaqram Azərbaycan iqtisadiyyatının neft və qeyri-meft sektorlarına yönəldilən birbaşa xarici investisiyaların dinamikası, mln.dollar ilə**




**Mənbə: Dövlət Statistika Komitəsi**

Ölkənin qeyri-neft sektoruna cəlb olunan BXİ-nin miqdarı 2008-ci ildə 500 mln dollar səviyyəsinə, 2012-ci ildə 1 mlrd. dollar səviyyəsinə yüksəldi. 2003-2014-cü illər ərzində qeyri-neft sektoruna cəlb olunan BXİ-nin miqdarında artım müşahidə edilsə də, son 3 il ərzində kəskin şəkildə dalğalanma baş vermişdir: belə investisiyaların miqdarı əvvəlki illə müqayisə etdikdə 2015-ci ildə 34.7 faiz azalıb, 2016-cı ildə 98.3 faiz artıb, 2017-ci ildə 52.4 faiz azalmışdır.

**Ədəbiyyat**

1. "Investment activity" (2007). Law of the Azerbaijan Republic.
2. www.azstat.org. -State Statistical Committee of the Republic of Azerbaijan.
3. Namazova C. Investisiyalar. Bakı 2014
4. Zeynalov V.Z. Investment Policy in Azerbaijan. Baku 2012
5.Aslanzadə İ. "İnvestisiya layihələrinin təşkili və idarə olunması" Bakı, 2000

**Rəyçi: prof.R.Həsənov**

Göndərilib: 03.03.2021 Qəbul edilib: 10.03.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/64/97-101

**Nihad Fərhad oğlu Qəyayev**
Bakı Dövlət Universiteti
magistrant
nihad13333a@gmail.com

# BEYNƏLXALQ CİNAYƏT MƏHKƏMƏSİ KOMPLEMENTAR ƏSASDA FƏALİYYƏT GÖSTƏRƏN BEYNƏLXALQ MƏHKƏMƏ ORQANI KİMİ

***Açar sözlər:*** *Beynəlxalq Cinayət Məhkəməsi, komplementarlıq prinsipi,Roma Statutu, beynəlxalq cinayətlər, dövlət suverenliyi, cinayət-hüquqi yurisdiksiya, beynəlxalq cinayət hüququ, cinayət prosesinin prinsipləri*

## International criminal court as an international judical body acting on a complementary basis

**Summary**

The functioning of the International Criminal Court is carried out on the basis of the principle of complementarity. Thus, in the Preamble and Article 1 of the Rome Statute of the International Criminal Court explicitly states that “the International Criminal Court….complements the national criminal justice authorities”. The principle of complementarity is revealed in Art. 17-20 of the Statute. This article discusses the algorithm and the criteria for evaluating the performance of the complementarity based on the analysis of the Rome Statute of the International Criminal Court (Statute), the Rules of Procedure and Evidence (2000), the Policy Paper on Case Selection and Prioritisations of 2016, the Policy Paper Preliminary Examinations of 2013.

***Key words:*** *International Criminal Court, principle of complementarity, Rome Statute, international crime, state sovereignty, criminal law jurisdiction, international criminal law, principles of criminal procedure*

1998-ci ildə Birləşmiş Millətlər Təşkilatının himayəsi altında Romada keçirilmiş diplomatik konfransda Beynəlxalq Cinayət Məhkəməsinin (BCM) təsis edilməsi beynəlxalq cinayətlərə görə cəzasızlıq sindromunun aradan qaldırılmasında mühüm bir tarixi hadisədir (2, s.446; 16,p.21-22). BCM beynəlxalq birliyin narahatlığına səbəb olan ən ciddi cinayətlərə görə məsuliyyət daşıyan şəxslərə münasibətdə yurisdiksiyanı həyata keçirməyə səahiyyətli olan permanent – yəni daimi əsasda fəaliyyət göstərən və milli cinayət ədliyyə orqanlarını (məhkəmələri) tamamlayan beynəlxalq məhkəmə orqanıdır. Başqa sözlə, bu Məhkəmə beynəlxalq cinayətlərə görə təqibi həyata keçirən milli məhkəmələri əvəzləmək üçün təsis edilməmişdir. Komplementar prinsip əsasında fəaliyyət göstərən bu orqan cinayət təqibini o hallarda həyata keçirir ki, nə vaxt ki, dövlətdaxili məhkəmə sistemi hansısa səbəblərə görə (məs, şəxsin törətdiyi beynəlxalq cinayətin adi cinayət kimi tövsif edilməsi, milli məhkəmə prosesinin qərəzli aparılması, təqsirləndirilən şəxsin beynəlxalq cinayət məsuliyyətindən yan qaçırmaq məqsədinin olması, cinayət işinin istintaqının lazımi səviyyədə aparılmaması) təqsirkarı cəzalandırmaq istəmir və ya onu cəzalandırmaq iqtidarına malik deyildir (12, p.1906; 13,p.165-198; 4,s.17-20).

Beynəlxalq Cinayət Məhkəməsinin Statutunun 5-ci maddəsinə müvafiq olaraq, Məhkəmənin predmet yurisdiksiyasına 1) soyqırım; 2) insanlıq əleyhinə cinayətlər; 3) müharibə cinayətləri; və 4) təcavüz cinayəti daxildir (6, s.9). Yeri düşmüşkən onu qeyd etmək istərdik ki, Roma Statutu Məhkəmənin predmet yurisdiksiyası altına düşən cinayətləri adlandırmaq üçün *ciddi cinayətlər* (grave crimes), *beynəlxalq cinayətlər* (international crimes), *bütün beynəlxalq birliyin narahatlığına səbəb olan ən ciddi cinayətlər* (most serious crimes of concern to the international community as whole) kimi ifadələrindən istifadə edir və bütün hallarda söhbət 5-ci maddədə nəzərdə tutulmuş əməllərin təqibi haqqında gedir və 5-ci maddədə sadalanan beynəlxalq cinayətlərin hər hansı formal ierarxiyası nəzərdə tutulmur (məsələn, cinayətlərin ağırlıq dərəcəsinə görə, zərərin həcminə və xarakterinə görə və s. təsnifləndirilməsi).

BCM-si müstəqil beynəlxalq hüquq subyektliyinə malik olan bir beynəlxalq məhkəmə orqanıdır və yuxarıda da vurğulandığı kimi o, milli cinayət ədliyyə orqanlarına münasibətdə komplementar əsasda fəaliyyət göstərir və belə demək mümkünsə bu Məhkəmə beynəlxalq cinayətlərə görə təqib və mühakimə yurisdiksiyası həyata keçirən məhkəmələrə münasibətdə dördüncü instansiya məhkəməsi deyildir – *ayrılma mənimdir-Q.N.* Lap dəqiqləşdirsək, BCM birbaşa və müstəqil şəkildə törədilmiş beynəlxalq cinayətə görə sərbəst cinayət işi qaldırmaq kimi disskrision səlahiyyətə malik deyil.

Tarixi inkişaf baxımından formalaşan praktika, o cümlədən dövlətdaxili qanunvericilik və beynəlxalq hüququn təməl prinsipləri onu ehtiva edir ki, ərazisində baş vermiş cinayətlərə görə mühakimə yurisdiksiyası birmənalı olaraq müvafiq dövlətin öz ixtiyarındadır və təbii ki, onun bu mübahisəsiz səlahiyyəti heç bir

dövlət və ya beynəlxalq təşkilat tərəfindən məhdudlaşdırıla bilməz. Bu prinsip Beynəlxalq Cinayət Məhkəməsinin fəaliyyətində də öz ifadəsini tapmışdır. Əlbəttə ki, beynəlxalq qanunçuluq onu tələb edir ki, beynəlxalq hüququn əsaslarını dağıdan, ona qəsd edən beynəlxalq cinayətlərin qarşısı hər vasitə ilə alınmalı və bu əməlləri törətməkdə təqsirli bilinən şəxslər isə tam ciddiliyi ilə törədilən beynəlxalq cinayət əməllərində iştirak dərəcəsi və verdiyi töhfə nəzərə alınmaqla, cəzalandırılmalıdırlar. Problemin mühümlüyünə bir qədər də geniş müstəvidən nəzər yetirsək belə bir faktın şahidi oluruq ki, BCM-in predmet yurisdiksiyası altına düşən cinayətlər məsuliyyətin rejimi baxımından ikili məsuliyyəti şərtləndirir: bu əməllərə görə məsuliyyətin bir tərəfi dövlətlərin beynəlxalq hüquqi məsuliyyətini, ikinci tərəfi isə məlum olduğu kimi fiziki şəxslərin beynəlxalq cinayət məsuliyyətini. Ona görə ki, beynəlxalq hüquq, daha dəqiq ifadə etsək beynəlxalq cinayət hüququ fərdlər tərəfindən törədilən beynəlxalq cinayət əməllərini dövlətlər tərəfindən törədilən ciddi beynəlxalq hüquq pozuntuları kimi də tanıyır (3,s.35-36). Roma Statutunda sadalanan beynəlxalq cinayətlər müvafiq dövlətin beynəlxalq cinayət siyasəti ilə birbaşa əlaqəyə malikdir və belə cinayətlər məqsədli, qəsdən törədilən cinayətlərdir. Odur ki, bu cinayətlərə görə fiziki şəxslərin beynəlxalq cinayət məsuliyyəti müvafiq dövlətin beynəlxalq hüquqi məsuliyyətini də doğurur və əksinə (7, p.19-36; 1, s.213). Məsuliyyətin zəruriliyi müstəvisində belə bir qarşılıqlı əlaqənin olmasına baxmayaraq, BCM dövlətlərin beynəlxalq məsuliyyətini deyil, fərdi cinayət məsuliyyəti üzrə səlahiyyətli orqandır (Roma Statutunun 25-ci maddəsi).

Belə olan halda ortalığa bir sual çıxır: əgər milli məhkəmə və ya təqib orqanı ərazisində törədilmiş beynəlxalq cinayətlərə görə mühakimə yurisdiksiyasını həyata keçirə bilmirsə və ya bu iqtidara malik deyilsə, lakin beynəlxalq cinayət hüququ bütün hallarda hər nə olursa olsun cəzalandırmanın reallışdırmasını tələb edirsə, onda bu kolliziyanın aradan qaldırılmasının məqbul variantı hansıdır və bu halda dövlət suverenliyinin nəzərə alınması necə olacaqdır?

Bu məsələ ilə bağlı tanınmış beynəlxalq hüquqşünas alim Robert Qryer qeyd edir ki, beynəlxalq cinayət hüququ və dövlətlərin suverenliyi ilk baxışdan bir-biri ilə rəqabətdə olan iki anlayış kimi görünsə də, əslində beynəlxalq cinayət hüququ özünün məqsədlərinə çatmaq üçün dövlətlərin suverenliyinə ehtiyac duyur (14, p.979-1000). Bu müstəvidə Beynəlxalq Cinayət Məhkəməsinin də effektiv fəaliyyəti üçün, cinayət mühakimə icraatını həyata keçirməsi üçün onun dövlətlərlə əməkdaşlığı mütləq xarakter daşıyır, əks təqdirdə o, müəyyən çətinliklərlə üzləşmək təhlükəsi qarşısında qalmalı olacaqdır (məs, Məhkəmənin predmet yurisdiksiyası altına düşən cinayətləri törətməkdə ittiham olunan şəxslərin ekstradisiyası və təhvil verilməsi (*surrender)* müstəvisində və d.) və əksinə, son variant kimi ərazisində beynəlxalq cinayət baş vermiş dövlətin gücsüzlüyü halında BCM müraciət etməsi ona həmin cinayətləri törədən şəxsləri cəzalandırmaq kimi məqsədə çatmasında yardımçı ola bilər. Məhz bu baxımdan, komplementarlıq prinsipi dövlətlərin suverenliyinə qarşı irəli sürülən ən effektiv kompromis variantı kimi çıxış edir.

Komplementarlıq prinsipinin mahiyyəti Roma Statutunun 17-20-ci maddələrində açılır. Bu maddələrin müddəaları onu ehtiva edir ki, milli məhkəmələr onların yurisdiksiyası altına düşən cinayətlərin istintaqı və məhkəmə təqibində əhəmiyyətli rol oynayırlar (*pozitiv komplementarlıq).* BCM isə yalnız o halda öz yurisdiksiyasını həyata keçirir ki, əgər dövlət istintaq aparmaq və ya lazımi tərzdə cinayət təqibinə başlamaq iqtidarında deyil və ya bunu arzulamır (*neqativ komplementarlıq).*

Komplementarlıq prinsipi Roma Statutundan əlavə, Məhkəmənin fəaliyyətinə aid olan bir sıra aktlarda da təsbit olunub. Belə ki, Prokuror Dəftərxanası beynəlxalq cinayətlər haqqında məlumatların araşdırılması və təhlili zamanı 2016-cı il tarixli işlərin və prioritetlərin seçilməsi Qadalarını (Policy Paper on Case Selection and Prioritisation, 2016) və 2013-cü il tarixli ilkin istintaq Qaydalarını (Policy Paper on Preliminary Examinations, 2013) əldə rəhbər tutur. Hər iki sənəd komplementarlıq prinsipinə böyük diqqət yetirir, çünki qəbuledilənliyin ilkin qiymətləndirilməsi sonrakı bütün qərarlar üçün əsasdır. Eyni zamanda onu da qeyd edək ki, komplementarlıq prinsipi Məhkəmənin sübuetmə və prosedur Qaydalarında da öz əksini tapıb. Bütün bu hüquqi sənədlərin fövqündə duran maksima ondan ibarətdir ki, BCM mühakimə yurisdiksiyası subsidiar rola malikdir və bu da onun milli cinayət ədliyyə orqanlarının səlahiyyətlərinə münasibətdə tamamlayıcı xarakterdə olması ilə bağlıdır.

BCM-in komplementarlıq (neqativ komplementarlıq) əsasda tətbiq imkanının mümkünlüyü və ya mümkünsüzlüyü bütün hallarda milli cinayət ədliyyə orqanının fəaliyyəti ilə şərtləşir. Bu o deməkdir ki, Roma Statutunda nəzərdə tutulan cinayətlər üzrə mühakimə icraatını həyata keçirmək vəzifəsi ilk növbədə dövlətlərin üzərinə düşür. Bu mənada, fərdlərin cinayət məsuliyyəti müəyyən edilərkən mühüm məsələlərdən biri də, Məhkəmə tərəfindən komplementarlıq prinsipinin (*pozitiv*) nəzərə alınmasıdır. Məlum olduğu kimi, cinayət mühakimə yurisdiksiyası bilavasitə dövlətlərin suverenlik hüquqlarından qaynaqlanır və hər bir dövlət öz yurisdiksiyası daxilində istənilən əməli cinayət kimi müəyyən edə və bununla bağlı

təqibi həyata keçirə bilər. Dövlətlərin və Beynəlxalq Cinayət Məhkəməsinin mühakimə səlahiyyətlərinin kəsişdiyi bu nöqtədə komplementarlıq prinsipi həlledici əhəmiyyətə malikdir.

İstər Roma Statutunda (onun Preambula hissəsində və 17-20-ci maddələrində) o cümlədən, Məhkəmənin fəaliyyəti ilə birbaşa əlaqəyə malik olan və yuxarıda adları çəkilən aktlarda bəyan olunan komplementarlıq prinsipinin tələbinə əsasən, müvafiq dövlətdə Məhkəmənin yurisdiksiyasına aid olan cinayətlərdən hər hansı birinin təqibi və istintaqı artıq başlanmışdırsa, bu halda BCM sözügedən əməllər üzərində yurisdiksiyaya malik deyildir. Dolayısı ilə, BCM belə situasiyada cinayət təqibini həyata keçirən dövlətin hərəkətə keçməsini gözləməlidir. Ona görə ki, milli cinayət ədliyyə orqanları baş vermiş cinayətlərin təqiqbi, istintaqı və məhkəmə icraatı aspektində hər zaman ilkin mövqedə dayanır. Bu isə belə bir fikir söyləməyə əsas verir ki, Roma Statutunda və Məhkəmənin fəaliyyəti ilə birbaşa əlaqəsi olan aidiyyatı digər aktlarda yer alan komplementarlıq prinsipinin mahiyyətindən irəli gələrək, BCM suveren dövlətlərin mühakimə səlahiyyətlərini mənimsəyə bilməz. Ona görə ki, komplementarlıq prinsipinin məna yükündə BCM-in birbaşa beynəlxalq cinayətlərin mühakiməsi ilə bağlı, daha dəqiq ifadə etsək, paralel yurisdiksiya zəminində işlərə müdaxilə etmək səlahiyyəti yoxdur. Məhkəmənin müvafiq cinayətlər üzrə prosesə müdaxilə etməsi yalnız o halda yaranır ki, nə vaxt ki, müvafiq dövlət cinayət təqibini həyata keçirmək üçün lazımi səy göstərmir və ya işin istintaqını və məhkəmə araşdırmasını müəyyən səbəblər üzündən arxa plana atmağa şərait yaradır. Belə situasiya daha çox siyasi hakimiyyət strukturlarında yüksək vəzifə statusuna malik olan şəxslərin cinayət təqibinin həyata keçirilməsinə həvəsli olmamaqda və yaxud silahlı münaqişə, o cümlədən digər hər hansı səbəbdən milli hüquq sisteminin dağılması və bu əsasda cinayət mühakimə icraatının həyata keçirilməsi qeyri-mümkünlüyü hallarında rast gəlinir. Məhz belə olan halda komplementarlıq prinsipi xüsusi təsirə malik olur və Məhkəmənin mühakimə səlahiyyətləri ilə bağlı yurisdiksiyasının tanınması zərurəti yaranır (17, p.608; 8, p.66-67; 5, s.82-90).

Komplementarlıq prinsipi beynəlxalq cinayətlərə münasibətdə həm dövlətlərin ilkin olaraq yurisdiksiyanı həyata keçirmək hüququna, həm də bu prosesdə səmərəliliyin nəzərə alınması prosesinə əsaslanır. Bu, o anlamı ifadə edir ki, BCM-dən fərqli olaraq, dövlətlər obyektiv ərazi yurisdiksiyasının gücünə icraatı həyata keçirmək üçün sübutlara, şahidlərə və resurslara ən yaxşı çıxış imkanına malik olurlar. BCM isə bu prosesə qoşulduğu təqdirdə özünün imkanları daxilində həyata keçirə biləcəyi təqiblərin hüdudları ilə məhdudlaşmaq məcburiyyətində qalmalı olur. Lakin bu da nəzərdən qaçmamalıdır ki, əgər ərazisində beynəlxalq cinayət baş vermiş dövlət Roma Statutunun 17-ci maddəsində nəzərdə tutulan istəksizlik və imkansızlıq kimi hallara yol verərsə, artıq bu BCM-in neqativ komplementarlıq aspektində həmin prosesə müdaxilə etməsinə zəmin yaratmış olur. Yəni, Statutun 17-ci maddəsinin tələbindən irəli gələrək Məhkəmə, yalnız cinayətin törədildiyi dövlətin cinayət təqibini həyata keçirməyə həvəssiz olduğu və ya mühakiməni həyata keçirmək imkanlarına malik olmadığı hallarda öz yurisdiksiyasını başlaya bilər, bu hallar isə Prokuror tərəfindən müvafiq qaydada qiymətləndirilir. Statut bu prosesdə Məhkəmənin strukturunda müstəqil orqan kimi fəaliyyət göstərən Prokuror Dəftərxanasına diskression səlahiyyətlər təqdim edib. Belə ki, komplementarlıq prinsipinə söykənərək, Prokuror Dəftərxanası qarşılıqlı əməkdaşlıq müstəvisində cinayətin baş verdiyi dövləti icraata başlamağa həvəsləndirə, birgə cəzasızlıqla mübarizə strategiyalarını inkişaf etdirməyə kömək edə və milli səylərin təsirini asanlaşdırmaq üçün məsləhətlərlə və müəyyən yardım formaları ilə ona dəstək verə bilər, o cümlədən ədalət mühakiməsinin maraqları naminə təqsirli şəxslərin cinayət məsuliyyətinə cəlb edilib cəzalandırılması üçün özünün bütün imkanlarından istifadə edərək milli ədliyyə orqanlarına kömək göstərə bilər. Tədqiqatçılar düzgün olaraq qeyd edirlər ki, Prokuror Dəftərxanasının milli ədliyyə orqanlarını beynəlxalq cinayətlərin istintaqı və təqibi prosesinə fəal surətdə təşviq etməsi həm BCM-in, həm də beynəlxalq birliyin prosesə müdaxilə etməsinin qarşısının alınmasına yönələn uğurlu bir addım kimi qiymətləndirmək olar (9, p.208).

Digər tərəfdən, komplementarlıq prinsipi həm də onu ehtiva edir ki, BCM beynəlxalq birliyin maraqlarına toxunan beynəlxalq cinayətlərə qarşı mübarizə aparmaq və bu cinayətləri törətmiş şəxsləri məsuliyyətə cəlb edib cəzalandırmaq məqsədi ilə yaradıldığı üçün, o, səahiyyətli məhkəmə orqanı kimi qanunçuluğun keşiyində sayıq durmalı, öz vəzifələrini vicdanla yerinə yetirməlidir. Bu prosesdə də BCM-in Prokuroru cinayət işi üzrə milli prosedurların real olaraq həyata keçirildiyini təsdiq etmək üçün lazımi məlumatları toplamaq iqtidarında olmalıdır. Dolayısı yolla Prokurorun bu fəaliyyəti Roma Statutunun 15-ci maddəsində ümumi formada öz təsbitini tapıb. Orada vurğulanır ki, Prokuror Məhkəmənin yurisdiksiyası altına düşən cinayətlər haqqında məlumatların ciddiliyini qiymətləndirmək kimi mühüm səlahiyyətə malikdir. Hesab edirik ki, belə məlumatlar həm cinayət işi üzrə milli prosedurların real olaraq həyata keçirilməsi ilə, həm də neqativ komplementarlıq aspektində cinayət işinin başlanması və istintaqın aparılmasının zəruriliyi baxımından olan məlumatları əhatə edə bilər. Roma Statutuna müvaviq qolaraq, Prokuror bu məlumatları

dövlətlərdən, BMT-in orqanlarından, hökumətlərarası və qeyri-hökumətlərarası təşkilatlardan və ya digər münasib hesab etdiyi mənbələrdən tələb edə bilər.

Komplementarlıq funksiyasının əməkdaşlıq və sayıqlıq kimi bu iki aspekti qeyd olunan fikirlərdən göründüyü kimi bir birilə qırılmaz əlaqəyə malikdirlər. Məsələn, əməkdaşlıq funksiyasının verdiyi məsləhət və istiqamət milli cinayət mühakimə icraatda potensial çatışmazlıqları yoluna qoya və beləliklə də sayıqlıq funksiyası üzrə BCM-in öz yurisdiksiyasını həyata keçirməsini nəzərə almaq ehtiyacını aradan qaldıra bilər. Başqa sözlə ifadə etsək, komplementarlıq prinsipinin əməkdaşlıq və sayıqlıq tələbi onu ehtiva edir ki, pozitiv komplementarlıq hələ tükənməyibsə və onun bərpası üçün hələ imkan varsa, deməli BCM-si neqativ komplementarlığa müraciət etməyəcəkdir. Əslində bu, daha məqbul variant olsa da, lakin şərait və vəziyyətdən asılı olaraq o, dəyişə bilər.

Beynəlxalq Cinayət Məhkəməsi ilə dövlətlərin qarşılıqlı fəaliyyəti üçün ən mühüm şərtlərdən biri Roma Statutunda təsbit olunmuş beynəlxalq cinayətlərin dövlətdaxili cinayət qanunvericiliyinə transformasiyası və bu cinayətlərə görə cəzanın həddlərinin müəyyən edilməsidir. Məhz Statutla qadağan olunmuş cinayət əməllərinin milli mexanizmlər vasitəsilə səmərəli təqibi həyata keçirildiyi halda, *non bis in idem* prinsipinin tələbinə müvafiq olaraq, BCM tərəfindən mühakimənin həyata keçirilməsinə ehtiyac olmayacaqdır. Deməli, BCM-in komplementar əsasda fəaliyyəti bir növ dövlətlərin milli cinayət ədliyyə orqanlarına münasibətdə "*xəbərdaredici"* mövqeyə malik olmasında təzahür edir.

Komplementarlıq prinsipini eyni zamanda BCM-in suveren dövlətlərə qarşı irəli sürdüyü xüsusi imtiyaz kimi dəyərləndirmək olar. Əslində Məhkəmə komplementarlıq prinsipini mənimsəməklə ağlabatan qərar qəbul etmişdir (xüsusən, xəbərdaredici anlamda). Yəni bu prinsipin fövqündə duran məna ondan ibarətdir ki, Roma Statutunda təsbit olunan beynəlxalq cinayətlərə görə mühakimə yurisdiksiyasının həyata keçirilməsi üzrə əsas öhdəlik həmin Statutun iştirakçı-dövlətinin (hətta Statutun iştirakçısı olmsa belə də) üzərinə qoyulub, yox əgər müvafiq dövlət bu yükü daşımaq iqtidarına malik deyilsə, onda BCM ümumbəşəri dəyərləri qorumaq, beynəlxalq ədaləti bərpa etmək üçün öz yurisdiksiyasını həyata keçirmək məcburiyyətində qalmış olacaqdır və təbii ki, bu ədalət baxımından uğurlu addım hesab oluna bilər. Nəticə etibarı ilə, cinayətkarlar haqqında hansı orqanın yurisdiksiyaya malik olmasından daha çox, cinayətkarların cəzalandırılması və ədalətin təmin olunması daha vacib əhəmiyyət kəsb edir. Ümumilikdə beynəlxalq cinayətlərlə səmərəli mübarizə aparmaq üçün təklif olunur ki, bütün dövlətlər BCM-in Statutuna qoşulmalıdırlar. Elə bu yerdə onu da vurğulamaq istərdik ki, Azərbaycan Respublikası BCM-in Statutunu nə imzalamayıb, nə də onu ratifikasiya etməyib, lakin bununla belə qüvvədə olan Cinayət Məcəlləsinin Xüsusi hissəsinin VII Bölməsinin müvafiq fəsillərində nəzərdə tutulan insanlıq əleyhinə cinayətlərin və müharibə cinayətlərinin növ bildirən tərkiblərinin əksəriyyəti məhz Roma Statutundan resepsiya olunub. Bu da belə bir fikir söyləməyə əsas verir ki, Azərbaycan Respublikasının BCM ilə qarşılıqlı fəaliyyəti yolunda vacib olan hüquqi məsələlərdən biri artıq öz pozitiv həllini tapıb.

Hesab edirik ki, BCM-in komplementarlıq prinsipi, təzyiqlər altında siyasi xarakterli qərarlar qəbul edilməsinə gətirib çıxarmadıqca, onun bu fəaliyyəti dövlətlərin milli suverenliyi ilə ziddiyyət təşkil etməyəcəkdir. BCM-in Statutu və onun fəaliyyəti, məramı və məqsədi belə bir maksimaya söykənir ki, dövlətlər təşəkkül tapmış beynəlxalq hüquq qaydasına əsasən milli mühakimə mexanizmləri vasitəsilə təkcə onunla heç bir siyasi və hüquqi bağlılığı olmayan əcnəbiləri və vətəndaşlığa malik olmayan şəxsləri deyil, həmçinin öz vətəndaşları olan beynəlxalq cinayətkarları da mühakimə etməlidir. Bu tələb Roma Statutunun 5-ci maddəsində təsbit olunmuş beynəlxalq cinayətlərin xarakterindən irəli gələn *erga omnes* öhdəliklərdən və *universal yurisdiksiya* prinsipinin tələbindən meydana gəlir (10, p.63-74; 11, p.9-21; 15, p.785-788). Eyni zamanda, *ratione temporis* yurisdiksiyası Məhkəmənin yalnız Statut müvafiq dövlət üçün qüvvəyə mindiyi tarixdən sonra törədilmiş cinayətlərə münasibətdə səlahiyyətli olduğunu müəyyən edir. Ancaq onu da yaddan çıxarmaq olmaz ki, Statutun 12-ci maddəsi onun üzvü olmayan dövlətə belə bir imkan təqdim edir ki, o, Məhkəmənin yurisdiksiyasının tanıması haqqında yazılı bəyanatını Məhkəmənin Katibliyinə təqdim etməklə ərazisində baş vermiş situasiyanı BCM ötürə bilər (uzanan və ya davam edən cinayət halında). Belə bir imkan Azərbaycan Respublikası tərəfindən də nəzərdən keçirilə bilər.

Yekun olaraq, komplementarlıq Beynəlxalq Cinayət Məhkəməsi və Statutun iştirakçı-dövlətlərinin (o cümlədən, iştirakçı olmayan dövlətlərin) hüquq qaydalarının bir-birilərindən asılılığını şərtləndirən fundamental prinsipdir. Komplementarlıq prinsipi onu müəyyən edir ki, BCM-in yurisdiksiyası yalnız o halda işə düşür ki, nə vaxt ki, milli hüquq sistemləri yurisdiksiyasını həyata keçirmir və ya onu arzulamır. Milli ədliyyə orqanları və Beynəlxalq Cinayət Məhkəməsi arasında yurisdiksiyanın uyğunluğu halında onlardan birincisi (yəni, milli ədliyyə orqanları) Roma Statutunda bəyan edilmiş beynəlxalq cinayətlərin mühakiməsinə münasibətdə prioritetə (üstünlüyə) malikdir. Beynəlxalq Cinayət Məhkəməsi milli

məhkəmələri əvəzləmək kimi məqsədi yoxdur, o, yalnız o zaman fəaliyyətə keçir ki, nə vaxt ki, milli ədliyyə orqanları hərəkətsizlik nümayiş etdirirlər.

BCM-in komplementar prinsip əsasında fəaliyyət göstərməsi Roma Statutunun Preambula hissəsində, (BCM milli cinayət mühakiməsi orqanlarına əlavə olaraq yaradılmışdır), Statutun 17-20-ci və 53-cü maddələrində, 2016-cı il tarixli işlərin və prioritetlərin seçilməsi Qadalarında, 2013-cü il tarixli ilkin istintaq Qaydalarında və 2000-ci il tarixli sübuetmə və prosedur Qaydalarda öz təsbitini tapıb.

Beynəlxalq Cinayət Məhkəməsinin komplementar fəaliyyəti dövlətlərin suverenliyinə hörmətə əsaslanan əməkdaşlığa və sayıqlığa söykənən iki funksional prinsipə söykənir.

**Ədəbiyyat**

1. Hüseynov L.H. Beynəlxalq hüquq. Dərslik. Bakı. Qanun nəşriyyatı. 2012
2. Məmmədov R.K. Beynəlxalq Cinayət Məhkəməsinin predmet yurisdiksiyası//Azərbaycan Respublikasında dövlət və hüquq quruculuğunun aktual problemləri. Elmi məqalələr məcmuəsi. 01/2009, Bakı. 2009, s.446-454
3. Məmmədov R.K. Beynəlxalq cinayət hüququ və Azərbaycan Respublikasının cinayət qanunvericiliyi. Monoqrafiya. Bakı. NAT Co MMC. 2012
4. Кораблева С.Ю. Режим комплементарности Международного уголовного суда: проблемы реализация // Международное публичное и частное право. № 5 (98), 2017, с. 17-20
5. Каюмова А.Р. Принцип комплементарности в системе принципов уголовной юрисдикции // Государство и право. № 1. 2008, с. 82-90.
6. Международный Уголовный Суд. Сборник документов. Казань. Центр инновационных технологий. 2004
7. Bonafe B.İ. Reassessing Dual Responsibility for International Crimes // Seqüencia (Florianopolis). No. 73, 2016, p.19-36
8. Burke-White W.W. Proactive Complementarity: the International Criminal Court and National Courts in the Rome System of International Justice // Harvard International Law Journal. Volume. 49 (1), 2008, p. 66-67
9. Bjork Ch., Goebertus J. Complementarity in Action: The Role of Civil Society and the ICC in Rule of Law Strengthening in Kenya // Yale Human Rights and Development Journal. Vol. 14 (1). 2011, p. 208
10. Bassiouni C. International Crimes: Jus Cogens and Obligation Erga omnes//Law and Contemporary Problems. Volume. 59. № 4. 1996, p. 63-74
11. Bottini G. Universal Jurisdiction After the Creation of International Criminal Court//New York University Journal of International Law and Politics, Volume. 36. № 2. 2004, p.9-21
12. Cassese A, Jones J. The Rome Statute of the İnternational Criminal Court: A Commentary. Oxford, Oxford University Press. 2002
13. Carter L.E. The Principle of Complementarity and the İnternational Criminal Court: The Role of Ne Bis in İdem // Santa Clara Journal of İnternational Law. Vol. 8. Issue 1. 2010, p. 165-198
14. Cryer R. International Criminal Law vs State Sovereignty: Another Round // European Journal of International Law, Volume. 16 (5), p. 979-1000
15. Randall K. Universal Jurisdiction Under İnternational Law//Texas Law Review. 1998. Volume. 66, p. 785-788
16. Schabas A.W. The International Criminal Court: A Commentary on the Rome Statute. Oxford. Oxford University Press. 2010
17. Williams S.A., Schabas W.A. Article 17: Issues of Admissibility / O.Triffler (ed.). Commentary on the Rome Statute. 2 nd ed. 2008, p. 608

**Rəyçi: prof. F.Abbasova**

Göndərilib: 19.03.2021 Qəbul edilib: 23.03.2021

